

AZƏRBAYCAN RESPUBLİKASI
ELM VƏ TƏHSİL NAZİRLİYİ

ISSN 2790-0738 (Print)
ISSN 2791-0911 (Online)

# AZƏRBAYCAN DİLİ
## VƏ ƏDƏBİYYAT TƏDRİSİ

ELMİ-METODİK JURNAL

**2024, № 3 / 281**

**TEACHING of AZERBAIJANI LANGUAGE and LITERATURE**

SCIENTIFIC-METHODICAL JOURNAL

**AZƏRBAYCAN DİLİ və ƏDƏBİYYAT TƏDRİSİ**
Elmi-metodik jurnal. 1954-cü ildən nəşr olunur.
ISSN 2790–0738 (Print); ISSN 2791–0911 (Online)

Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyinin 5 may 1997-ci il tarixli Nizamnaməsi ilə təsdiq edilmiş, Azərbaycan Respublikası Mətbuat və İnformasiya Nazirliyində dövlət qeydiyyatına alınmışdır. Seriya AB № 022436, Qeydiyyat № B236

"Azərbaycan dili və ədəbiyyat tədrisi" humanitar elmlər istiqaməti üzrə dilçiliyin və ədəbiyyatşünaslığın bütün sahələrinə aid Azərbaycan, türk, ingilis və rus dillərində orijinal, yüksək keyfiyyətli elmi məqalələr dərc edən, dilimizin saflığı və işləkliyini qoruyan, Azərbaycan dili və ədəbiyyatın (həmçinin xarici ədəbiyyatın) tədrisi metodikasını, onun tədqiqi və təbliği məsələlərini araşdıran resenziyalı, açıq girişli elmi-metodik jurnaldır. İl ərzində dörd dəfə nəşr olunur. Jurnal dilçilik məsələləri, metodika, qrammatika, dialektologiya, mətnşünaslıq, Azərbaycan ədəbiyyatı, türk dili və ədəbiyyatı, xarici ədəbiyyat, uşaq ədəbiyyatı və folklorşünaslıq mövzularını əhatə edən bölmələrindən ibarətdir. "Nəşrlər" bölməsində elmi-pedaqoji sahədə yeni nəşr edilən kitablar tanıdılır. Jurnal Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının tövsiyə etdiyi dövri elmi nəşrlər sırasındadır.

---



**TEACHING of AZERBAIJANI LANGUAGE and LITERATURE**
Scientific-methodical journal. Published since 1954.
ISSN 2790–0738 (Print); ISSN 2791–0911 (Online)

Approved by the Charter of the Ministry of Science and Education of the Republic of Azerbaijan dated May 5, 1997, registered with the Ministry of Press and Information of the Republic of Azerbaijan. Series AB № 022436, Registration № B236

"Teaching of Azerbaijani language and literature" publishing original, high-quality scientific articles in Azerbaijani, Turkish, English and Russian languages in all fields of linguistics and literary (including foreign literature) criticism in the field of humanities is a peer-reviewed, Open Access scientific-methodical journal that studies the methodology, its research and promotion. Published four times a year. The journal consists of sections covering linguistics, methods, grammar, dialectology, textology, Azerbaijani literature, Turkish language and literature, foreign literature, children's literature and folklore. In the section "Publications" are presented new books published in the scientific and pedagogical field. The journal is among the publications recommended by the Supreme Attestation Commission under the President of the Republic of Azerbaijan.

---

# İÇİNDƏKİLƏR / № 3, 2024

## D İ L Ç İ L İ K   M Ə S Ə L Ə L Ə R İ



## M E T O D İ K A



## Q R A M M A T İ K A

## A Z Ə R B A Y C A N   Ə D Ə B İ Y Y A T I



## T Ü R K   Ə D Ə B İ Y Y A T I



## Ə D Ə B İ   M Ü H İ T

## CONTENTS / № 3, 2024

### L I N G U I S T I C   I S S U E S



### M E T H O D S



### G R A M M A R

## A Z E R B A I J A N I   L I T E R A T U R E



## T U R K I S H   L I T E R A T U R E



## L I T E R A R Y   E N V I R O N M E N T

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2024, № 3 (281), 12–19
doi.org/10.48445/a9487-9346-6504-l

DİLÇİLİK MƏSƏLƏLƏRİ

# Poetik əsərlərdə dilin rolu

***Sədaqət Həsənova***
Filologiya üzrə elmlər doktoru, professor, Əməkdar müəllim, Naxçıvan Dövlət Universiteti. Azərbaycan. E-mail: sedagethesenova@gmail.com
https://orcid.org/0000-0002-0839-8469

**XÜLASƏ**
Məqalədə dil və üslub məsələlərindən bəhs olunur. Bu baxımdan poetik əsərlərin dili təhlilə cəlb edilərək onların özünəməxsus xüsusiyyətləri üzə çıxarılır. Məqalədə həmçinin müxtəlif şairlərin yaradıcılığına müraciət edilir, üslub özəlliyi və deyim gözəlliyinə malik olan əsərlərin poetik dilin inkişafındakı rolu diqqətə çatdırılır. Poetik dilin inkişaf edib zənginləşməsində söz sənətkarlarının əməyinin əhəmiyyəti vurğulanır. Bildirilir ki, onların yaratdığı yeni söz və ifadələr poeziyanın üslub keyfiyyətlərinin zənginləşməsinə müsbət təsir göstərir.

**AÇAR SÖZLƏR**
dil, söz, üslub,
ifadə, poeziya

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 02.07.2024
Qəbul edilib: 15.08.2024

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2024, NO. 3, VOL. 281, 12–19
doi.org/10.48445/a9487-9346-6504-l

LINGIUSTIC ISSUES

# The Role of Language in Poetic Works

***Sadagat Hasanova***
Doctor of Philology, Professor, Honored teacher, Nakhchivan State University. Azerbaijan.
E-mail: sedagethesenova@gmail.com
https://orcid.org/0000-0002-0839-8469

**ABSTRACT**
The article deals with issues of language and style. From this point of view, the language of poetic works is analyzed and their unique features are revealed. The article also refers to the works of various poets, the role of the works in the development of the poetic language, which have a peculiarity of style and beauty of idiom, is brought to attention. The importance of the work of wordsmiths in the development and enrichment of the poetic language is emphasized. It is said that the new words and expressions created by them have a positive effect on the enrichment of the stylistic qualities of poetry.

**KEYWORDS**
language, word, style, expression, poetry

**ARTICLE HISTORY**
Received: 02.07.2024
Accepted: 15.08.2024

*Dili xalq yaradır, filoloqlar kəşf edir və sistemləşdirir, yazıçılar isə onun üzərində söz sənəti yaradırlar.*

V. Belinski

**Giriş**

Dilsiz poetik əsər, ümumiyyətlə, ədəbi əsər yoxdur. Dil hər bir poetik əsərin əsas materialı, onu tanıdıb dərk etdirən vasitədir. Bədii əsərin dili hiss və duyğuları, düşüncələri, təbiət və cəmiyyətə münasibəti ifadə edən maraqlı qaynaqdır. Bu dil, əsasən, subyektiv xarakter daşıyır. Hər bir söz sənətkarının öz dilində danışmaq və yaratdığı obrazları bu dildə danışdırmaq hüququ vardır. Bu hüququ məhdudlaşdırmaq olmaz. Poetik əsərlərin müəllifi düşündüklərini istədiyi şəkildə bildirmək sərbəstliyinə malik olduğu üçün təsəvvür və anlayışlarına uyğun olanları olduğu və ya olacaq kimi təqdim edə bilər. Bu, yəni hər bir söz ustadının özünəxas dil üslubuna malik olması poetik dilin zənginliyindən irəli gəlir. Poetik dil bir tərəfdən müəllifin fikrini bildirirsə, digər tərəfdən onun üslubunu müəyyənləşdirir. Dil poeziyanın canı, qanı, ruhu, mayasıdır. Bədii əsər yaradıcıları dilin çevikliyini, o cümlədən onun həyəcanlı məqamlarının təsvir və tərənnümünün inandırıcı şəkildə ifadəsini təmin etmək məqsədilə müxtəlif vasitələrdən istifadə edirlər.

**Əsas hissə**

Poetik əsərin dili onun əsas mahiyyətini ortaya qoya bilir. Bu, poetik əsərdə dilin böyük rola malik olduğunu təsdiq edir. Belə ki, poetik əsərin dili onun məqsəd və ideyasını ifadə edir. Lakin bu dil durğunluq sevmir, həmişə dəyişib zənginləşir. Bu prosesdə şairlərin əməyini unutmaq doğru olmaz. Çünki poetik dili dəyişən və zənginləşdirən söz sənətkarlarıdır. Poetik əsərlərin özünəməxsusluğu onların dili ilə meydana çıxır. Poetik dil ilə xalq danışığını eyniləşdirmək, o cümlədən onu xalq danışığından ayrı təsəvvür etmək olmaz. Bu dilin əsasında xalq danışığı dayansa da, o, təmizlənmiş, ədəbi aləmdə müəyyən qayda-qanuna salınmış, xüsusi dil savadına malik insanlar tərəfindən işlənərək cilalanmışdır. Xalq danışığı ilə poetik dil bir-birinə qarşılıqlı təsir göstərir, bir-birinin söz, ifadə ehtiyatını artırır. Təsadüfi deyil ki, poetik dili xalq danışığının "qaymağı" hesab edirlər. Bu dildə obrazlılıq və cazibədarlıq adi danışıq dilindən daha üstündür. Bu mənada ümumxalq dilindəki bütün sözləri poetik dilə gətirmək olmaz. Fikirlərin təsirli ifadəsi üçün xalq dili leksikasının ən seçilmiş söz və ifadələrindən istifadə edilir. Nitq mədəniyyətinin üçüncü şərti olan *ifadəlilik* dilin bütün səviyyələrində nəzərə alınmalıdır. Poetik dildə sözün həqiqi mənasından daha

çox məcazi mənası əhəmiyyət daşıyır. Yerinə düşməyən hər hansı bir söz və ya ifadə poetik dilin səviyyəsini aşağı sala bilər. Ona görə də poetik dil yaradıcıları sözlə ehtiyatlı davranmalıdırlar. Çünki dilin estetik gözəlliyinə xələl gətirən hər hansı bir dil vahidi onu eybəcərləşdirir. Sözdən qorxmayanlar, ona hesabat verməyənlər əsl şair ola bilməzlər. Bu yerdə Xalq şairi Nəbi Xəzrinin aşağıdakı misraları yada düşür:

Söz ucaldar bu cahanda insanı,
Əzizləyər bu cahan da insanı.
Vaxt olar ki, bircə anda insanı
Əlli ilin hörmətindən salar söz [5, s. 11].

Bu barədə dilçi alim A. Axundov yazırdı: "Bədii əsərdə süni sözlər yaratmağın ədəbi dilimizin inkişafı üçün heç bir əhəmiyyəti yoxdur. Bir də unutmamaq lazımdır ki, bədii əsərin dilinə qiymət verərkən bədii yaradıcılığın əhəmiyyətini başa düşmək üçün zəruri olan bədii zövqə malik olmaq, dil hadisələrini quru mülahizələrlə deyil, poetik həssaslıqla izah etmək ən vacib məsələlərdən biridir"[1].

Poetik dilin özünəməxsus nizamı vardır. Bu, həm forma, həm də məzmunda özünü göstərir. Bu dil fikri bədii şəkildə ifadə etmək sənətinin tələblərindən irəli gəlir. Aşağıdakı adi məlumat yükü daşıyan nəqli cümlələrə nəzər salaq:

*Tüstüdən az qala gözüm çıxdı. Yuxu görürdüm. O, gözdən düşüb.*

Bu cümlələrdəki fikirlərin poetik variantını Sarı Aşığın aşağıdakı bayatısı ilə təqdim edə bilərik:

Əzizim, düşdü gözüm,
Gördüyün düşdü, gözüm.
Baxdı, yarı görmədi,
Gözümdən düşdü gözüm.

Birinci misrada *gözün düşməyi* (yerə düşməyi, çıxmağı), ikinci misrada *yuxu görmək* (düş – yuxu), sonuncu misrada *gözdən düşmək* mənaları verilmişdir. *"Gözün gözdən düşməyi"* kimi maraqlı poetik ifadələr təsdiq edir ki, şairlər (o cümlədən aşıqlar), doğrudan da, söz sənəti yaradırlar.

Poeziyanın dili qəlbin dilidir. Bu dilin özəllikləri, incəlikləri çoxdur. "Şeirdə sözlərin çoxgedişli hərəkəti şahmat oyununa bənzəyir. Şahmatda fiqurlarla müxtəlif istiqamətlərdə gediş etmək mümkün olduğu kimi, şeirdə də sözlərlə fəal şəkildə manevr etmək imkanı yaranır. Poetik əsərdəki əlvanlıq, daxili hərarət və ehtiras qüvvəsi də

[1] https://melumatlar.az/blog/9419/bedii-dilimize-aid-bezi-qeydler

məhz söz-rənglərin tez-tez dəyişməsindən, müxtəlif məna çalarlarının intensiv əvəzləmələrindən əmələ gəlir. Heç şübhəsiz ki, şeir dilinin rəngarəng və təsirli olmasının mühüm səbəblərindən biri sözlərin əlaqələnmə üsullarındakı müxtəliflik, ifadə nizamındakı mütəhərriklik və kövrəklikdir" [1, s. 6].

Poetik dil təkcə həyat hadisələrini, mövcud dövrün vəziyyətini təsvir və tərənnüm etmir, o, fərqli söz mənzərəsi yaradaraq dərin mənalara yol açır. Poetik dilin qayda-qanunlarına əməl etməyənlər uğur qazana bilmirlər. Müraciət edilən mövzular bədii-estetik həllini poetik dildə tapır. Poetik dilin yaratdığı təəssürat sözügedən hadisəni tarixiləşdirib yaddaşlara yaza bilir. Poetik dilə bədii sənəd mövqeyindən yanaşanlar yanılmırlar. Elə mövzular var ki, onlar poetik dilin gücü ilə "mənəvi sənəd" dəyərindədirlər. Məsələn, Tofiq Bayramın "Ana dili" şeiri dilimizin, Səməd Vurğunun "Azərbaycan" şeiri vətənimizin, Zəlimxan Yaqubun "Xocalım" şeiri tarixi faciəmizin poetik rəmzi kimi qiymətləndirilməyə layiqdir.

Poetik əsərlərin dili o qədər güclüdür ki, əsrlər boyu formalaşıb möhkəmlənmiş münasibətləri belə dəyişə bilir. Məlumdur ki, çiçək sevgi rəmzidir. Əziz günlərdə insanların bir-birinə bağışladığı dəyərli hədiyyələrdən biri, hətta birincisidir. Qərənfil 1990-cı ilin qanlı yanvarına qədər sevgi çiçəyi kimi əzizlənmiş, xoş hədiyyələrdən biri sayılmışdır. Lakin həmin tarixdən, xüsusilə də Məmməd Aslanın "Ağla, qərənfil, ağla" əsərindən sonra qərənfil "yas çiçəyi", "matəm gülü" adını qazandı. Artıq heç kəs ailə üzvlərinə, rəfiqəsinə, sevgilisinə qərənfil bağışlamır. Bu çiçək yalnız məzar üzərinə qoyulmaq üçün alınır. Qanlı yanvar hadisələri qış fəslinə təsadüf etdiyindən və o zaman qərənfil gülünün mövsümü olduğuna görə matəm rəmzi olaraq məhz bu çiçək seçilir. Əgər hadisə yaz və ya yay fəslində baş versəydi, şəhid məzarlarına başqa bir çiçək, məsələn, qızılgül qoyulacaqdı. Bu mənada hansı güldən istifadə edilməsi əsas məsələ deyil. Mühüm olan budur ki, qərənfilin poetik dildə obraza çevrilməsi onun o zamana qədərki taleyini və bununla da ünvanını dəyişdi, bu "xoşbəxt" sevgi çiçəyini dərd-qəm simvoluna çevirdi. Ümumiyyətlə, simvolik ifadə üsullarından bacarıqla istifadə poetik dilin obrazlılıq imkanlarını genişləndirir. Qərənfilə ünvanlanan poetik intonasiya, ona uyğun leksika emosional tutumlu sintaksislə ahəng yaradır, güclü psixoloji emosiya təsirinə yol açır. Xüsusilə də xitabın misranın ortasında gəlməsi poetik ovqatın güclənməsinə səbəb olur:

…Sinələr güllə-güllə,
Qan axır, dönür gülə.
Qərənfillər ağlayır,
Düşmənə gülə-gülə.

Qərənfillər qoşadı,
İkisi baş-başadı.
Sizdən qalan günləri
Qərənfillər yaşadı.

Ağla, qərənfil, ağla!
Qərənfil – şəhid qanı,
Ağla, qərənfil, ağla!
Ağla, inlət meydanı,
Ağla, qərənfil, ağla!

Ağla, qərənfil, ağla!
Cavanlara qıydılar,
Tanklar altda qoydular.
Qanın içib doydular,
Ağla, qərənfil, ağla!..

Bu təklənmiş şirlərə,
Bu arxasız ərlərə,
Bu talesiz nərlərə
Ağla, qərənfil, ağla!

Bu günahsız qanlara,
Bu didilmiş canlara,
Bu cansız cavanlara
Ağla, qərənfil, ağla! [2]

Əsərdə adi bir gülün adını ifadə edən sözün bütün semantik sanbalı ona təsirli müraciətdə əks olunub. Sözün müraciət obyekti seçilməsi ilə şair bütün hadisəni canlandıra bilir. Xitabın əlvan intonasiyası poetik gücə təkan verir, duyğu çalarlarını vurğulaya bilir və poetik dil adi sözləri fikir materialına döndərə bilir.

Bədii əsərlər haqqında çox danışılıb, lakin onların dili haqqında yazılanlar azdır. Poetik dil o qədər zəngindir ki, onun haqqında indiyə qədər yazılanlar yetərincə deyil.

Azərbaycan dilinin poetik imkanları və bu imkanların yazarların qələmində rəngdən-rəngə düşməsi möhtəşəm dil faktlarının meydana çıxmasına səbəb olur. Burada səslərin, sözlərin, misraların cazibəsi heyrət doğurur. Poetik dilin təsiri o qədər böyükdür ki, insan mənaların sirrinə heyran olur. Rəngarəng deyiliş tərzi sözü poetik şəraitin tələblərinə uyğunlaşdırır. Bu uyğunluq həm məna sanbalında, həm də şeirin poetexnik göstəricilərində özünü büruzə verir. Poetik dil ehtişamlı düşüncələrin qaynağıdır. Bu dilin böyük mətləbləri ifadə etməsinə örnək olaraq Sahib Əsgərlinin aşağıdakı şeirinə nəzər salaq:

İstədim dağlardan bir yazı yazam,
Xəyalım dağılıb oldu dərbədər.
Bir dağın başında saz kökləyirdi,
Bir dəli həvəslə Dədə Ələsgər [3, s. 31].

Şeirdə sanki müraciət edilən mövzu araşdırılır, müəllifdən əvvəl həmin mövzuda yazanlar xatırlanır, şair sələflərindən sonra yazdıqlarının necə qarşılanacağı düşüncəsi ilə baş-başa qalır:

İstədim ceyrandan bir yazı yazam,
Ovçu tək dolandım hey oğrun-oğrun.

[2] https://news.milli.az/culture/92327.html

Bir ceyran göz vurub doladı məni,
...Dayanıb, bığaltı gülürdü Vurğun [3, s. 31].

Poetik dil şairin məsuliyyət hissinin nə qədər dərin olmasını üzə çıxarır:

İstədim bulaqdan bir yazı yazam,
Qalxdım Batabata bir sübh səhəri.
Gördüm bulaq üstə tövşüyən atın,
Tərini soyudur, İslam Səfərli [3, s. 31].

Sahib Əsgərlinin “İstədim, bir yazı yazam” şeiri sadalanan mövzulara şairlik möhürünü vurmuş yazarlar haqqında poetik müntəxəbat təsiri bağışlayır:

İstədim Göygöldən bir yazı yazam,
Bilmədim başımda hansı havadı.
Bir misra yazmamış gözüm qamaşdı,
Gördüm dan yerində Əhməd Cavadı [3, s. 31].

“Poeziyanın qədəhini Göy göldən doldurub içən ilk təbiət aşiqi və nəğməkarı” Əhməd Cavadın “poetik dilimizin Göy gölü” olmasını vurğulayan şair sonrakı nəsil şairlərinin də məziyyətlərini dəyərləndirir:

İstədim çaylardan bir yazı yazam,
Axıdam alnımdan bir çay qururun.
Qələmin ucunu qırdı çaydaşı,
Səsini eşitcək Musa Yaqubun [3, s. 31].

Sahib Əsgərli orijinal, fərqli qələm sahibi olub üslub özəlliyinə, deyim gözəlliyinə malik, sənətdə öz yolu, öz imzası olan, poetik dilin inkişafına töhfə verən şairlərdən bəhs edir. O şairləri oxuyanda kimlərisə təqlid edənlər yada düşmür, ancaq fərdi poetik dil keyfiyyətləri ilə onların özləri xatırlanır:

İstədim Göyçaydan bir yazı yazam,
Qəfil bir üşütmə girdi qəlbimə.
Kədərdən kövrəlmiş çinar yanında
Gözlərim sataşdı Əli Kərimə [3, s. 31].

Poetik dil ilə müəllifin həm özü, həm də sənəti qarşısında məsuliyyət hissi aydın duyulur. Bu dil bir tərəfdən də şairin ədəbi aləmə bələdlik dərəcəsini göstərir. Şair bu məsuliyyəti sanki yazarların hamısına xatırladır, sözün ucuzlaşmasına imkan vermir və

yalnız söz deyənlərdən geri qalmayanların sənətə gəlməyə haqqı olduğuna işarə edir:

... İstədim vətəndən bir yazı yazam,
Önümdə ölçüsüz sərhəd dayandı.
Çox çıxdı özündən cırtdan ilhamım,
Gözümün önündə Səhhət dayandı [3, s. 31].

Doğrudan da, dağlardan Aşıq Ələsgər, təbiət gözəli ceyrandan Səməd Vurğun, Göygöldən Əhməd Cavad, çaylardan Musa Yaqub, Göyçaydan Əli Kərim, vətəndən Abbas Səhhət qüdrətində şeir yazmaq çətindir, hər qələm sahibinin işi deyil.

**Nəticə**

Beləliklə, poetik dil yaradıcı, vüsətli, sözün mənalarını çoxaldan, ölçülü-biçili, duyğuların obrazını yaradan, sözə vurğunluğun həddini yüksək səviyyəyə qaldıran, şair məramını yetərincə ifadə edən, duyğu idrakını gücləndirən, sözün, fikrin möcüzəsini təqdim edən, sözləri fikirlərə yaraşdırmağı bacaran, hiss və duyğulara fəal müdaxilə edən dildir. Şeirdə poetik dil sözlərə hərəkət verir, daha doğrusu, sözlər "sözə baxmır", irəliyə can atır. Beləliklə, poetik dil nəyi isə kəşf edir, nəyi isə yaradır.

**İstifadə edilmiş ədəbiyyat**

1. Abdullayev S. (1984). Dil və bədii qavrayış. Bakı, Yazıçı. 167 s.
2. Axundov A. Bədii dilimizə aid bəzi qeydlər. https://melmatlar.az/blog/9419/bedii-dilimize-aid-bezi-qeydler
3. Əsgərli S. (2021). Gedirəm özümə bir gün ağlayam. Naxçıvan, Əcəmi. 208 s.
4. Məmməd A. Ağla, qərənfil, ağla. https://news.milli.az/culture/92327.html
5. Nəbi X. (2004). Seçilmiş əsərləri. I cild. Bakı, Lider. 248 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2024, № 3 (281), 20–31
doi.org/10.48445/n1614-8589-2923-x

**METODİKA**

# Məhəmməd Füzuli yaradıcılığında təriqət ideyalarının tədrisi probleminə müasir yanaşma

***Yaqub Babayev***
Filologiya elmləri doktoru, professor, Azərbaycan Dövlət Pedaqoji Universiteti.
Azərbaycan. E-mail: ymbabayev@hotmail.com
https://orcid.org/0000-0002-4738-9426

**XÜLASƏ**
Məqalədə ali və orta məktəblərdə klassik ədəbiyyatımızın, xüsusilə də M. Füzuli yaradıcılığının öyrədilməsində qarşıya çıxan bir sıra çətinliklərdən söhbət açılır. Göstərilir ki, ali və orta tədris müəssisələrində şairin həyat və yaradıcılığının, bədii irsindən nümunələrin tədrisi zamanı müəyyən problemlər qarşıya çıxır. Bu problemləri aradan qaldırmaq müəllimlərdən müəyyən bilik, səriştə və bacarıq tələb edir. Qarşıya çıxan çətinliklərdən biri də tələbə və şagirdlərə təriqət mövzulu əsərlərin mövzu, ideya-məzmun və sənətkarlıq xüsusiyyətlərinin mənimsədilməsidir. Bu ideyaları nəzərə almadan bir sıra klassik sənətkarlarımızın yaradıcılıq məhsullarını şagirdlərə və tələbələrə obyektiv şəkildə mənimsətmək mümkün deyil. Dediyimiz fikir məqalədə, əsasən, Məhəmməd Füzulinin müəyyən əsərlərinə istinadən izah edilir. Şərh zamanı məqalə müəllifi adı çəkilən sənətkarın həm ali, həm də orta məktəbdə tədris olunan əsərlərini diqqət mərkəzində saxlayır, yaradıcılığından nümunələr verir və onları mövzunun tələbləri baxımından təhlil süzgəcindən keçirir. Təhlil zamanı təriqət ideyalarının həm o dövr, həm də günümüz üçün dəyərinə, əhəmiyyətinə, həmçinin sənətkarlıq məsələlərinə də toxunulur.

**AÇAR SÖZLƏR**
təriqət ideyaları,
M. Füzuli, təlimdə
çətinliklər, tədris,
ali məktəb

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 15.07.2024
Qəbul edilib: 25.08.2024

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2024, NO. 3, VOL. 281, 20–31
doi.org/10.48445/n1614-8589-2923-x

METHODS

# A Modern Approach to Problem of Teaching Sect Ideas in Work of Mahammad Fuzuli

***Yagub Babayev***
Doctor of Philological Sciences, Professor, Azerbaijan State Pedagogical University. Azerbaijan. E-mail: ymbabayev@hotmail.com
https://orcid.og/0000-0002-4738-9426

**ABSTRACT**
The article discusses a number of difficulties encountered in teaching our classical literature, especially M. Fuzuli's works, in higher and secondary schools. It is shown that certain problems arise during the teaching of examples of the poet's life and creativity and artistic heritage in higher and secondary educational institutions. Solving and eliminating these problems requires certain knowledge, competence and skills from teachers. One of the difficulties encountered is the students' assimilation of the subject, idea-content, and artistic features of the sect-themed works. Without considering these ideas, it is impossible to objectively assimilate the creative products of a number of our classical artists to pupils and students. Our opinion is explained in the article mainly with reference to certain works of Muhammad Fuzuli. During the commentary, the author of the article focuses on the works of the mentioned artist, which are taught in both high school and secondary school, gives examples of his creativity and analyzes them in terms of the requirements of the topic. During the analysis, the value and importance of sect ideas both at that time and today, as well as issues of craftsmanship are touched upon.

**KEYWORDS**
sect ideas, M. Fuzuli, difficulties in teaching, teaching, higher school

**ARTICLE HISTORY**
Received: 15.07.2024
Accepted: 25.08.2024

**Giriş**

Məlumdur ki, Azərbaycan ədəbiyyatının qədim və orta əsrlər dövrünə aid bir sıra ədəbi şəxsiyyətlərin, sənətkarların həyat və yaradıcılığı, bədii irsindən müxtəlif nümunələr ali və orta məktəblərdə tədris olunur. Həmin dövr min ili aşan çoxəsrlik tarixi bir mərhələni əhatə edir. Bu əsrlərdə elə nəhəng ədəbi simalar yetişmişdir ki, onlar yalnız Azərbaycan ədəbiyyatının deyil, həm də dünya bədii düşüncə meydanının iftixarlarıdır. Bununla belə diqqətəlayiq bir məsələni xüsusi olaraq nəzərə çatdırmaq lazım gəlir.

**Əsas hissə**

Son dövrün, daha dəqiqi, son yüz ilin ədəbiyyat nümunələrindən fərqli olaraq, qədim və orta əsrlər ədəbiyyatımıza aid bədii örnəkləri istər ali, istərsə də orta məktəblərdə tədris edərkən bəzi çətinliklərlə üzləşirik. Hansı ki bu çətinlikləri nəzərə almadan mövzunu, yəni tədris olunan bədii nümunələri yetərincə mənimsətmək, tələbəyə və ya şagirdə başa salmaq mümkün deyil. Tədris prosesində müəllim hökmən həmin çətinlikləri nəzərə almalı, onların həlli yollarını axtarmalıdır. Deyilən çətinliklər təxminən aşağıdakılardan ibarətdir:

**1. Dil faktoru.** Son yüz ilin bədii məhsullarından fərqli olaraq, qədim və orta əsrlərdə bədii nümunələr ya ərəb və ya fars dillərində qələmə alınmış, ya da ana dilində yazılan əsərlərdə çox sayda ərəb-fars sözləri işlədilmişdir. Belə sözlərin çoxluq təşkil etməsi istər-istəməz oxucu, xüsusilə də tələbə və şagirdlər üçün mətnin anlaşılmasında müəyyən çətinliklər yaradır.

**2. Dinlə, dini ideya və mətləblərlə bağlılıq.** Bəllidir ki, VII – VIII əsrlərdən etibarən yaranan ədəbiyyatımıza islam coğrafiyasının və mədəniyyətinin bir parçası kimi islam dini, Quran, şəriət ideyaları, sünnə və hədislər ciddi şəkildə təsir göstərmişdir. Bundan əlavə, iudaizmin, xristianlığın, zərdüştiliyin, şamanizmin, buddaizmin və s. dinlərin də qədim və orta əsrlər ədəbiyyatımıza təsiri danılmazdır.

**3. Müxtəlif fəlsəfi sistemlərin, təmayüllərin, cərəyanların yaranması.** Həm islamaqədərki, həm də islam dini təşəkkül tapandan sonra meydana gələn müxtəlif fəlsəfi sistemlərin, təmayüllərin, cərəyanların da bədii fikrə, ədəbi əsərlərə ciddi təsiri olmuşdur. Başqa sözlə, bəşər ədəbiyyatının bizə məlum tarixi inkişaf yolunda heç zaman və heç yerdə bədii ədəbiyyat, bədii düşüncə orta əsrlər islam şərqindəki qədər fəlsəfə ilə qaynayıb-qarışmamış, çulğalaşmamışdır.

**4. Bədii əsərlərdə məcazların (bədii təsvir və ifadə vasitələrinin) bol-bol işlədilməsi.** Orta əsrlər islam şərqində bunlara “bəlağət vasitələri” deyilirdi. Burada şeirin yalnız məna-məzmun gözəlliyinə deyil, forma gözəlliyinə, zahiri bər-bəzəyinə də

xüsusi diqqət yetirilirdi. Əsərin zahiri gözəlliyi sənətkar üçün xüsusi məharət, sənətkarlığın şöhrət faktoru, hünər əlaməti sayıldığından şeirdə çox sayda, rəngarəng forma və çalarda məcazlar (bəlağət vasitələri) işlədilirdi. Fikirlər, mətləblər təntənəli, dəbdəbəli təşbehatlara, məcazlara bükülüb oxucuya təqdim edilirdi. Bu fikir və mətləbləri anlamaqdan ötrü oxucudan müəyyən səviyyə, hazırlıq tələb olunurdu.

**5. Bəzən bədii əsərlərdə bu və ya digər dərəcədə müəyyən elmi mətləb və məsələlərə toxunulması, bədii mətnin, düşüncənin elmi fikirlə, baxışla qaynayıb qovuşması və s.**

Bu deyilənlərlə yanaşı orta əsrlər ədəbiyyatımızda təriqət ideyalarının təzahürü, onun bədii düşüncə və mətnlə ciddi şəkildə qaynayıb qarışması da bugünkü oxucu, şagird və tələbə üçün xeyli çətinliklər yaradır, əsəri düzgün və lazımi səviyyədə anlamaqda öyrənənlə bədii mətn arasında pərdəyə çevrilir. Onu öyrənənə başa salmaq, anlatmaq isə öyrədənin öhdəsinə düşür.

**Orta əsrlər Azərbaycan ədəbiyyatında təriqət ideyalarının qoyuluşu**

Qədim və zəngin Azərbaycan ədəbiyyatının orta əsrlər dövrü altı əsrə qədər (XIII – XVIII əsrlər) uzunmüddətli bir ədəbi-tarixi mərhələni əhatə edir. İ. Həsənoğlu, M.Şəbüstəri, M. Əvhədi, Ə. Təbrizi, Ş. Q. Ənvar, İ. Nəsimi, M. C. Həqiqi, Həbibi, Hamidi, Xəlili, Ş. İ. Xətai, M. Füzuli, Q. Təbrizi, S. Təbrizi və b. dahi ədəbi simalar məhz bu mərhələdə yetişmişlər. Bu dövr həm də ədəbi-bədii, ictimai-dini və fəlsəfi fikir tariximizdə təriqət ideyalarının geniş şəkildə vüsət aldığı mərhələdir. Adı çəkilən nəhəng ədəbi şəxsiyyətlərin hər birinin yaradıcılığında təriqət görüşləri əsaslı şəkildə öz əksini tapmışdır. Bu sənətkarların sayı deyilənlərlə məhdudlaşmayıb kifayət qədər çoxluq təşkil edir. Bir sözlə, bu dövr ədəbiyyatımızı təriqət şairləri və ideyaları olmadan nə təsəvvür, nə də təhlil etmək mümkündür.

Orta məktəbdə V sinifdən başlayaraq ədəbiyyat dərsliklərində adı çəkilən sənətkarlarımızdan İ. Həsənoğlu, İ. Nəsimi, Həbibi, Ş. İ. Xətai, M. Füzuli və bu kimi ədəbi simaların yaradıcılığından nümunələr verilir. X sinifdən başlayaraq yəni ədəbiyyat tariximiz tarixi-xronoloji baxımdan, oçerkçilik prinsipi əsasında tədris olunarkan İ. Nəsimi, Ş. İ. Xətai, M. Füzuli kimi təriqət şairlərimizə ayrıca oçerklər həsr edilir, onların yaradıcılığından müəyyən nümunələr öyrədilir. Ali məktəb dərsliklərində də müəlliflər oçerklər əsasında tədris edilir. Bir çox orta əsr şairlərimizin tədris olunan əsərlərində təriqət baxışları daha qabarıq şəkildə əks olunmuşdur. Bu da təbiidir, çünki həmin ədəbi simaların poetik irsində təriqət görüşləri və ideyaları aparıcı yer tutur. Doğrudur, bu sənətkarların dünyəvi mövzulu əsərləri, poeziya örnəkləri də yox dərəcəsində deyil. Ancaq məsələ burasındadır ki, təriqət mövzulu əsərlər onların ədəbi irsinin və yaradıcılıq məhsullarının əsas “yükü”nü təşkil edir. Təbii ki, hər bir sənətkarı

da onun yaradıcılığının əsas "yükü" ilə tanıtmaq gərəkdir. Bu, həm də bütövlükdə ədəbiyyat tariximizin əsas mövzu və ideya-bədii "yükü" deməkdir. Bizim əsas vəzifəmiz də şagirdləri ədəbi-mənəvi xəzinəmizin bu həqiqəti ilə tanış etməkdir.

Orta məktəbdə tədris olunan ilk təriqət şairi İ. Nəsimidir. Aşağı siniflərə aid dərsliklərdə onun şeirlərindən bəzi nümunələr verilir. X sinifdə isə ona ayrıca oçerk həsr olunur və şairin "Sığmazam" qəzəli bütöv şəkildə tədris edilir. Əlbəttə, aşağı siniflərdə təriqət görüşləri və ideyaları, təriqətin nə olduğu barədə şagirdlərə məlumat verməyə o qədər də lüzum yoxdur. Çünki bunlar xeyli dərəcədə mürəkkəb məsələlərdir, bu səbəbdən aşağı sinif şagirdləri bunu dərk etməyə bilərlər. X sinifdə Nəsimi irsinin tədrisi zamanı şagirdlərə bu barədə mütləq izahat verilməli, bu ideyaların əsas məğzinin, mahiyyətinin, mənasının nədən ibarət olduğu sadə şəkildə şərh edilməlidir. Ona görə "sadə şəkildə" deyirik ki, təriqət özlüyündə mürəkkəb dini-fəlsəfi mahiyyətə, düşüncə və etiqad sisteminə, məxsusi atributlara, özünəməxsus rəmzi-metaforik anlayışlara malikdir. Bunları əhatəli surətdə şagirdlərə öyrətmək nə mümkündür, nə də buna ehtiyac vardır. Ancaq onlara bəzi zəruri məsələləri, anlayışları mütləq izah etmək lazımdır. Belə bir izahat olmadan şagirdlər nə adı çəkilən qüdrətli şairlərimizin oxucuya çatdırmaq istədiyi fikri, nə də onların yaradıcılıqlarının əzəmətini, gözəlliyini, dəyərini anlaya biləcəklər.

Beləliklə, şagirdlərə təriqətin nə olduğu barədə bu cür sadə, aydın, onların başa düşəcəyi bir tərzdə izahat vermək olar: Təriqət orta əsrlərdə islam şərqində, o cümlədən Azərbaycanda bir dini-fəlsəfi etiqad sistemi kimi geniş yayılmışdır. Çox keçmədən o, ədəbiyyata da yol tapmış və ona güclü şəkildə təsir göstərmişdir. Bu baxışların yaradıcıları, ideoloqları öz fikirlərində, mülahizələrində, əsasən, Qurana, sünnə və hədislərə əsaslanırdılar. Bununla belə onların başqa dinlərdən, fəlsəfi cərəyanlardan əxz etdikləri fikirlər, baxışlar da var idi. Təriqətdə başlıca məsələ ilahi varlığa, yəni Allaha olan eşqdir. Təriqət ideoloqları deyirlər ki, Allah bütün varlığı (yeri, göyü, Ayı, Günəşi, ulduzları və bizim gözlə görə bilmədiyimiz hər şeyi) insan üçün xəlq etmişdir. Bəşər övladı yaranmış məxluqatda hər şeydən üstün və alidir. Allah insanı ona görə yaratmışdır ki, onu tanısın və yaratdıqlarını sevsin. Allah insanı və bütün məxluqatı sevərək və sevgi üçün yaratmışdır. Hər bir insanın borcu Tanrını və onun yaratdıqlarını (təbiəti, heyvanları, ilk növbədə, öz həmcinsi olan insanları) sevməkdir. Xaliq irqindən, dinindən, cinsindən, milliyyətindən, sərvət və maddi imkanından, mənsəbindən asılı olmayaraq, bütün bəndələri bərabər xəlq etmişdir. İnsanlar bir-birindən bu cəhətlərinə görə yox, yalnız kamil və cahil olmalarına görə fərqlənirlər. Ədəbli, əxlaqlı, mənəviyyatlı, haqqı, həqiqətləri və özünü dərk edənlər kamil insanlar hesab olunurlar. Ona görə də bütün insanlar azadlığa, bərabər hüquqa malik olmalı, bir-birini sevməli,

ədalətli olmalı, zülm etməməli, heç kəsin haqqını yeməməlidirlər. Bunun üçün insanların qəlbində məhəbbət, sevgi, eşq olmalıdır. Eşq isə iki cürdür: ilahi və məcazi eşq. İlahi eşq Tanrıya, məcazi eşq isə Allahın yaratdığı müxtəlif varlıqlara olan eşqdir.

Belə bir izahat təriqət baxışlarının əsas və ümumi cəhətlərini özündə ehtiva edir. Şagirdlər bununla təriqətdəki humanizmin, sevgi, ədalət, azadlıq, bərabərlik, qardaşlıq hissinin bir aparıcı ideya-məfkurə xətti kimi öndə olduğunu anlaya bilərlər.

Bunun ardınca müəllim izah etməlidir ki, orta əsrlər islam aləmində geniş yayılmış təriqətin də müxtəlif qolları, cərəyanları vardır. Bunlardan sufizm (təsəvvüf) və hürufizm daha geniş yayılmışdır. Hürufiliyin banisi Fəzlullah Nəimidir. Onun müridi İ. Nəsimi böyük hürufi şair, hürufiliyin əsas bayraqdarlarından, bədii istiqamətdə təbliğatçılarından olmuşdur.

**Məhəmməd Füzuli yaradıcılığında təriqət ideyalarının tədrisi**

Ali və orta məktəblərdə M. Füzulinin həyat və yaradıcılığına geniş yer verilir. Bu qüdrətli qələm sahibinin yaradıcılığında təriqət ideyaları əsas yer tutur. Ümumiyyətlə, Füzuli ədəbiyyat tariximizdə irfani-fəlsəfi poeziyanın ən qüdrətli nümayəndələrindən biridir. Əlbəttə, şairin irsini tədris edərkən yaradıcılığının bu məziyyətinə diqqət yetirmədən onu doğru-dürüst anlatmaq mümkün deyil. Təbii ki, deyilən mətləbin lazımi şəkildə tələbə və şagirdlərə çatdırılması üçün sənətkarın yaradıcılığından tipik nümunələrə nəzər salmaq lazım gəlir. Həm ali, həm də orta məktəbdə tədris olunan “Məni candan usandırdı...” qəzəli, həmçinin “Leyli və Məcnun” poeması bu mənada kifayət qədər material verir.

“Məni candan usandırdı...” qəzəlində ilahi eşqlə (təriqət ideoloqlarının təbiri ilə desək, həqiqi eşqlə) dünyəvi eşq (təriqət ideoloqlarının yozumu ilə desək, məcazi eşq) qovuşuq şəkildədir. Məsələn, qəzəlin ikinci beytini sufizm baxışlarını nəzərə almadan təhlil etmək mümkün deyil:

Qamu bimarına canan, dəvayi-dərd edər ehsan,
Neçün qılmaz mənə dərman, məni bimar sanmazmı?

Beytdəki mətləbi nəsrə çevirsək, bu şəkildə ifadə edə bilərik: Canan (məşuq, gözəl) onu sevən (ona aşiq olan) bütün xəstələrinin dərdinə dərman edir, yalnız mənə (bu aşiqin dərdinə) dərman etmir, məni xəstə hesab etmirmi? (mən də onun xəstəsi deyiləmmi?) Təbii ki, burada eşq xəstəliyindən söhbət gedir. Bir anlıq belə fərz edək ki, bu gözəl, yəni çox aşiqlərin vurulduğu, sevdiyi bu adam konkret olaraq insandır. O (məşuq), Füzulinin lirik qəhrəmanından başqa onu sevən bütün aşiqlərin hamısının dərdinə əlac edir. Əlbəttə, burada fiziki-cismani xəstəlikdən söhbət getmir ki, gözəl də (məşuq da) onların fiziki-cismani xəstəliyinə dərman etsin. Və burada eşq xəstəliyindən

söhbət açılır. Onda bu canan dünyəvi gözəldirsə və onu sevənlərin hamısının dərdinə əlac edirsə, deməli, onların eşq, sevgi istəyinə razılıq verir. Məşuq da onları sevdiyini söyləyir, çünki dünyəvi mənada aşiqi razı salmağın yeganə yolu onun sevgisinə müsbət qarşılıq verməkdir. Bu zaman ortaya yeni bir məsələ çıxır. Əgər bu canan onu sevənlərin hamısının sevgisinə müsbət yanaşıb dərman edirsə, sevgisinə "bəli" deyirsə, dini və ülvi əxlaqa görə belə bir gözəl müsbət insan sayıla bilməz. Əxlaqı dürüst olmayan bir gözəli isə Füzuli vəsf edib şeirinin ideal qəhrəmanına, gözəlinə çevirməz. Bəs, onda bu hansı canandır? Deməli, şair burada Allahı, yeganə olan yaradıcı qüvvəni nəzərdə tutur. Demək istəyir ki (əslində, şikayət edir ki), Xaliq – Canan onu sevənlərin hamısının dərdinə dərman edir. Yalnız mənim dərdimə əlac etmir. Mən də onun xəstəsi, yəni onu sevənlərdən deyiləmmi?

Göründüyü kimi, beyti təriqət ideyaları müstəvisində şərh etdikdə mətləb tamamilə yerində olur. Ona görə də müəllim şeirdəki bir sıra məqamları məhz bu konteksdə izah etməlidir. Qəzəldəki "şəbi-hicran", "rindü şeyda" anlayışları da bu qəbildəndir. Belə ki, "şəbi-hicran" ("ayrılıq gecəsi") dedikdə, vəhdət aləmindən (ilahi aləmdən) ayrılıb kəsrət aləminə (çoxluq aləminə, maddi dünyaya, yer üzünə) düşmüş zərrənin ayrılıq, hicran məqamı (yer üzündə yaşayacağı ömrün müddəti) nəzərdə tutulur. "Rindü şeyda" (dəli, vurğun rind) dedikdə isə sufizmdə ilahi eşqin dəlisi, vurğunu olmuş aşiqə işarə edilir.

Şeirin digər beytlərini dünyəvi axarda şərh etmək olar. Ancaq unutmaq olmaz ki, əslində, Füzuli bir irfan şairi kimi insanı Xaliqin ən gözəl biçimdə yaratdığı bir məxluq hesab edir. Xaliqin gözəl xəlq etdiyi bəndəni də məhz Haqqın gözəl yaratdığı bir zərrəsi kimi tərif və tərənnüm edir. Qəzəlin təhlilində obyektiv nəticə hasil etməkdən ötrü hökmən bu məsələni də nəzərə almaq lazım gəlir. Təriqət ideoloqlarının dediyi kimi, "Gözəlin (Xaliqin) xəlq etdiyi gözəlin (bəndənin)" zahiri gözəlliyini, biçimini, bənzərsizliyini təsvir və təqdim etməkdən ötrü Füzuli dolğun məcazlardan istifadə etmişdir. Tipik nümunə və fikrin sübutu üçün şeirdə aşağıdakı beytin üzərində dayanmaq daha effektli olar:

Güli-rüxsarinə qarşu, gözümdən qanlı axar su,
Həbibim, fəsli-güldür bu, axar sular bulanmazmı?

İzah etmək lazımdır ki, *həzəc bəhrində* qələmə alınmış, həcmi yeddi beytdən ibarət qəzəlin bütün beytlərində *daxili qafiyələrdən* istifadə edilmişdir. Məsələn, nümunə verdiyimiz beytdə *"qarşu"*, *"su"*, *"bu"* sözləri daxili qafiyə yaradır. Daxili qafiyələr ritm, ahəng və estetik baxımdan şeiri daha da gözəlləşdirir. Qəzəlin bütün beytləri ayrıca bir bədii ifadə vasitəsi olan *bədii suallar* üzərində qurulmuşdur. Bundan da əlavə,

nümunə kimi verdiyimiz beytdə aşağıdakı məcaz növləri ilə üzləşirik: Epitet (bədii təyin) – *güli-rüxsar (gül üz)*; mübaliğə –*gözümdən qanlı axar su*; bədii xitab – *həbibim*; metonimiya (ad dəyişmə) – *fəsli-gül (“gül fəsli” deməklə sənətkar bahar fəslini nəzərdə tutur*); bənzətmə (təşbeh) – beytin ilk misrasında şair aşiqin gözündən axan qanlı suyun qırmızılığını (qırmızı rəngini) gözəlin “güli-rüxsar”ının qırmızı rənginə bənzədir; illət (səbəb – bu şərq poeziyasında bir hadisədə, məfhumda, baş verən prosesdə səbəb-nəticə əlaqəsini bildirən məcaz növüdür) – gözəlin yanağı qırmızı olduğundan aşiqin gözlərindən qırmızı rəngli qanlı göz yaşı axır; digər tərəfdən məşuqun yanağı bahara bənzəyir (bahar timsalındadır), bu səbəbdən də aşiqin gözlərindən qanlı su axır, çünki baharda sular daşdığı üçün bulanıq olur. Deməli, aşiqin göz yaşlarının qana çevrilməsinin (nəticə) səbəbi gözəlin bahara bənzər gül yanağının olmasıdır.

M. Füzulinin ana dilimizdə yazdığı bənzərsiz sənət abidəsi olan “Leyli və Məcnun” poemasında da təriqət baxışları aparıcı xətt təşkil edir. Bu mənada Füzulinin poeması həmin mövzuda Şərq ədəbiyyatında qələmə alınmış “Leyli və Məcnun”lardan fərqlənir. Azərbaycan şairi bu ərəb əfsanəsinə irfani don geyindirmiş, onu ilahi eşqin bəzəyi ilə bəzəmiş, poemanın ideya-məzmun axarını tamamilə təriqət məcrasına yönəltmişdir. Əsərin əvvəlində yazdığı dibaçədə və üç rübaidə də bunu aydın şəkildə ifadə etmişdir. Burada şair Leylinin Haqqın bir zərrəsi, zərrədə təmsilçisi, Məcnunun Haqqın yaratdığı və onu sevməli olan bəndənin, həm də həqiqi eşqin timsalı olduğunu, bu ərəb əfsanəsini bəhanə edərək (bir vasitə kimi götürərək), əslində, sirr açdığını, məcazi söz söylədiyini, Haqqı və Haqqa olan sevgini bəyan etdiyini açıq şəkildə söyləyir. Poemadakı İbn Səlam məcazi eşqi, Nofəl isə maddi dünyadakı gücü, qüvvəti və sərvəti təmsil edir. Təbii ki, əsərin tədrisi zamanı müəllim bədii mətnin özündən çıxış edərək bunları tələbələrə, şagirdlərə aydınlaşdırmalıdır. Onlara başa salmalıdır ki, irfani baxış, ölçü və dəyərlərə görə Leyli ilə Məcnun maddi dünyada vüsala yetə bilməzdilər, qovuşa bilməzdilər. Çünki maddi dünyadakı vüsal həm müvəqqəti, keçici, həm də cismanidir. Əsl və əbədi vüsal ancaq o biri dünyada, əbədiyyət aləmində (“aləmi-bəqa”da) mümkün ola bilər. Bundan başqa, müvəqqəti olan cismani vüsal irfani düşüncədə qəbul edilmir. Bu iki qəhrəman – aşiq və məşuq da cismani ölümdən sonrakı əbədiyyət aləmində qovuşurlar. Əsərin sonunda Zeydin qəhrəmanların ölümündən sonra gördüyü yuxu da bunu aydın şəkildə sübut edir.

“Leyli və Məcnun”da ilahi eşqin mahiyyəti, təbiəti, faydası ilə bağlı kifayət qədər nümunələr vardır. Məsələn, müəllim poemanın mətnindəki iki epizodu müqayisə etməklə əsərin baş qəhrəmanı Məcnunun həqiqi eşq yolçusu kimi cəhalətdən kamala necə yüksəldiyini, yüksəliş yolunda hansı mərhələlərdən keçdiyini və həqiqətə (ilahi eşqin ən yüksək məqamına) necə çatdığını tələbələrə və şagirdlərə izah edə bilər.

Birinci epizod poemanın əvvəllərində Məcnunun ilk dəfə səhraya gedib orada qərar tutması əhvalatıdır. Yoldaşları ilə gəzməyə gedən Qeys onların israrına baxmayaraq evə qayıtmaq istəmir, səhraya üz tutur. Yoldaşları əlacsız qalıb evə qayıdır və bu xəbəri Qeysin atasına çatdırırlar. Ata səhraya gedib oğlunu tapır. Onu evə qaytarmaq istədikdə oğlu onun sözünə baxmayıb qayıtmaq istəmir. Bu zaman ata yalana əl atır. Bildirir ki, Leyli onlara gəlib, Qeysi gözləyir. Qeys Leylinin adını eşidən kimi atasının yanına düşüb evə gəlir. Çünki hələ kamala çatmayıb, aşiqlik yolunun başlanğıcındadır. Hələ sınaqlardan, imtahanlardan keçməyib, eşqində naşıdır, ariflik mərtəbəsinə yetişməyib, hələ vücud sevgisi ilə yaşayır. Evə çatıb Leylini görmədikdə yenidən səhraya üz tutur. Əsərin sonuna yaxın isə belə bir epizod verilir. Leylinin mindiyi dəvə yolunu azır və gəlib Məcnunun (indi o daha Qeys yox, Məcnun adı ilə tanınır) olduğu yerə çıxır. Leyli Məcnunu görüb sevinir. Hal-əhval tutmaq üçün onu yanına çağırır. Məcnun isə ona qarşı tamamilə laqeydlik göstərir. Leylinin cismən ona lazım olmadığını, indi özünün yalnız Leylinin xəyalı, ruhi varlığı ilə yaşayıb təsəlli tapdığını söyləyir. Yəni sevgilisinin cismani varlığını rədd edir, onun ruhuna qovuşmaq həsrəti ilə yaşayır. “Xəyal ilə təsəllidir, könül meyli-vüsal etməz” – inancına pənah gətirir. Çünki əvvəlki cəhalət mərtəbəsindən tədricən sınaq və imtahanlar yolu ilə yüksəlib ariflik məqamına, aşiqlik yolunun ən uca mərtəbəsinə yetişmişdir.

Poemada verilən son qəzəl də sırf sufizm ideyaları ilə bağlı olub aşiqin tutduğu ilahi eşq yolunda tamamilə kamala çatdığını, irfani mərtəbəyə yetişdiyini aydın şəkildə göstərir. Həmin qəzəldən bəzi beytlərin təhlili əsərdəki təriqət ideyalarını anlamağa kömək edir. Məsələn:

Yandı canım hicr ilə, vəsli-rüxi-yar istərəm,
Dərdməndi-firqətəm, dərmani didar istərəm.
Bülbülü-zarəm, deyil bihudə əfğan etdiyim,
Qalmışam nalan qəfəs qeydində, gülzar istərəm...
Nola gər qılsam, şəbi-hicran təmənnayi-əcəl,
Neyləyim, çoxdur qəmim, dəfinə qəmxar istərəm.
Cün bəqa bəzmindədir dildar, mən həm durmazam
Bu fəna deyrində, bəzmi-vəsli-dildar istərəm.

Yeddi beytlik qəzəldən nümunə verdiyimiz bu dörd beyti həm nəsrə çevirir, həm də onların yığcam və sadə şərhini veririk:

Hicran (ayrılıq əzabı) ilə canım yandı,
Yarın üzünü görmək istərəm.

Ayrılıq dərdlisiyəm,
Vüsal dərmanı istərəm.

Aşiqin (Məcnunun) vəhdət aləmindən (ilahi aləmdən) ayrılıb kəsrət aləminə (çoxluq aləminə, maddi dünyaya) düşmüş sevgilisi, məşuqu (Leyli – vəhdətdən qopmuş zərrə) yenidən vəfat edib (fani olub, fənaya uğrayıb) öz ilkin məskəninə, əslinə, gəldiyi yerə qayıdıb. İndi bu ayrılığa dözə bilməyən, ayrılıq dərdlisi olan aşiq də ölərək onun vüsalına qovuşmaq istəyir.

Bir ağlar bülbüləm, əfğan etdiyim bihudə deyil,
Qəfəs içində ağlar qalmışam, gülzar istərəm.

Sufizm baxışlarına görə, ilahi aləmə məxsus ruh ona vücud sevgisi verildiyi səbəbindən Allah-təalanın məsləhət bildiyi vaxtda vəhdət aləmindən ayrılıb kəsrət aləminə düşür və burada maddi bədənlə birləşir. Yəni cismani bədəndə həbs olunur, qəfəsə düşür. Müəyyən müddət həmin bədəndə qərar tutub sonra yenidən onu tərk edir, sanki qəfəsdən azad olunur.

Əgər ayrılıq gecəsi əcəl arzulasam, təəccüb etməyin,
Neyləyim qəmim çoxdur,
Onu dəf etməyə qəmxar (qəm yoldaşı, həmdəm) istərəm.

Sufizm baxışlarına görə vəhdətdən ayrılmış zərrə (burada ruh) *"şəbi-hicran"* zavalına uğrayır, yəni *"şəbi-hicran"* dünyasına düşür, bu dünya isə bütünlüklə qəm, kədər, əzab dünyasıdır. Ondan qurtuluşun yolu cismani ölümdür. Öldükdən sonra ruh yenidən həmin aləmə, xoşbəxtlik və əbədiyyət aləminə *("aləmi-bəqa"*ya) qayıdır.

*Dildar əbədiyyət məclisində olduğuna görə mən də bu fəna deyrində (müvəqqəti olan kilsədə, şərabxanədə) durmaq istəmirəm, dildarın vüsal məclisini istəyirəm.* Burada yer üzü kilsəyə, şərabxanaya bənzədilir.

Bu cür sadə izahat həm poemanın ideyasını, şairin əsərdə təlqin etmək istədiyi mətləbi, aşiqin özünə ölüm arzulamasının səbəbini, həm də təriqət görüşlərindəki ilahi eşqin mahiyyətini anlamağa kömək edər.

Poemanın sonunda da şair bu əsərdə "vəhdət rəmzləri" ("rümuzi-vəhdət") ilə danışdığını bir daha nəzərə çatdıraraq deyir:

İzharə gəlib rümuzü-vəhdət,
Vəhdətdə tamam olub hekayət.
Tarixinə oldular müvafiq,
Bir olmaq ilə iki aşiq.

“Bir olmaq ilə iki aşiq” – misrasında sənətkar həm də əbcəd hesabı ilə poemanın yazıldığı tarixi verir. Yəni əsərin yazıldığı tarixi göstərərkən də onu təriqət rəmzlərinin diktəsinə uyğunlaşdırır. Bu tarix 943-cü hicr ilinə (miladi ilə 1537-ci ilə) bərabərdir.

Ona görə də təriqət ideyalarını nəzərə almadan “Leyli və Məcnun” əsərinin mövzu, məzmun, ideya və obrazlar aləmini obyektiv, dürüst şəkildə başa düşmək və tədris etmək mümkün deyil.

**Nəticə**

Nəticə etibarı ilə deyə bilərik ki, biz ali və orta məktəblərdə sonrakı dövr sənətkarlarımızın yaradıcılığına nisbətən orta əsrlərdə yaşayıb-yaratmış şairlərimizin yaradıcılıq nümunələrini tədris edərkən daha çox çətinlik və problemlərlə üzləşirik. Həmin problemlərə diqqət yetirmədən orta əsr klassiklərimizin əsərlərini şagird və tələbələrə lazımi səviyyədə mənimsətmək, anlatmaq mümkün deyil. Bu problemlər isə həm əsərlərin ideya-məzmun, həm də forma, dil-üslub cəhətlərinə aiddir. Orta əsr klassiklərimizin əsərlərində ciddi şəkildə özünü büruzə verən təriqət motivləri də deyilən problemlər sırasındadır. Bəlli olduğu kimi, M. Füzuli də təriqət şairi kimi tanınır. Onun əsərlərini tədris edərkən müəllim mütləq bu faktoru nəzərə almalı, obyektiv nəticələr əldə etmək üçün şairin tədris olunan yaradıcılıq örnəklərinə sufizm ideyaları prizmasından yanaşmalıdır.

Onu da əlavə edək ki, təriqət motivləri sənətkarın əsərlərinin həm ideya-məzmun çalarlarında, həm obrazlar aləminin səciyyəsində, həm də dilindəki müəyyən rəmzi anlayış və ifadələrdə özünü göstərir. Əsərlərin tədrisi zamanı bu məziyyətləri nəzərə alıb onları şagird və tələbələrə öyrətdikdə onlar M. Füzulinin yaradıcılıq örnəklərini məna-məzmun baxımından daha yaxşı mənimsəməklə yanaşı, onun yaradıcılıq əzəmətini, əsərlərindəki çoxqatlılığı, çoxmənalılığı rəmzi anlayışlardan, təriqətlə əlaqəli məcazlar sistemindən necə ustalıqla istifadə etdiyini də dərk edirlər. Bu məziyyət, heç şübhəsiz ki, orta əsr klassiklərimizin qüdrətini obyektiv şəkildə anlatmaq üçün tədrisdə vacib şərtlərdən biridir.

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan ədəbiyyatı tarixi. (1960). Üç cilddə, I c. Bakı, Azərb. SSR EA nəşri. 589 s.
2. Azərbaycan ədəbiyyatı tarixi. (2007). Altı cilddə, III c. Bakı, Elm. 736 s.
3. Babayev Y. (2011). Təriqət ədəbiyyatı: sufizm, hürufizm. Bakı, Elm və təhsil. 128 s.
4. Babayev Y. (2018). Azərbaycan ədəbiyyatı tarixi (XIII – XVIII əsrlər). Bakı, Elm və təhsil. 758 s.
5. Banarlı N. S. (1998). Resimli Türk edebiyatı tarihi, I c. İstanbul. 1228 s.
6. Bertels Ye. E. (1965). Sufizm i sufiyskaya literatura. Izbrannyye trudy. Moskva, Nauka. 524 s.
7. Bünyadov Z. (1997). Dinlər, təriqətlər, məzhəblər (arayış kitabı). Bakı, Azərnəşr. 1081 s.
8. Məhəmməd Füzuli. (2005). Əsərləri. Altı cilddə (tərtib edən: Araslı H.). Bakı, Şərq-Qərb. 400 s.
9. Məhəmməd Füzuli. (1991). Leyli və Məcnun (tərtib edəni və nəsrə çevirəni: Əliyev S.). Bakı, Maarif. 336 s.
10. Göyüşov N. (2001). Təsəvvüf anlamları və dərvişlik rəmzləri. Bakı, Tural-Ə. 240 s.
11. Idris Shakh. (1994). Sufizm. Moskva, Klyshnikov. 446 s.
12. Kulizade Z. A. (1970). Khurufizm i yego predstaviteli v Azerbaydzhane. Baku, Elm. 264 s.
13. Qurani-Kərim (1991). (Ərəbcədən tərcümə edənlər: Bünyadov Z., Məmmədəliyev V.). Bakı, Azərnəşr. 714 s.
14. Quliyeva M. (1991). Klassik şərq poetikası. Bakı, Yazıçı. 128 s.
15. Səfərli Ə., Yusifli X. (2008). Azərbaycan ədəbiyyatı tarixi (qədim və orta əsrlər). Bakı, Ozan. 698 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2024, № 3 (281), 32–40
doi.org/10.48445/m0997-7311-5288-g

METODİKA

# Məhəmməd Füzulinin həyat və yaradıcılığının məktəblərdə tədrisi tarixindən

***İmran Verdiyev***
Əməkdar müəllim. Azərbaycan.
E-mail: imranverdiyevi@mail.ru
https://orcid.org/0009-0001-5147-544X

**XÜLASƏ**
Məqalədə dahi Azərbaycan şairi Məhəmməd Füzulinin əsərlərinin təhsil müəssisələrində öyrədilməsi tarixindən bəhs olunur, mollaxana və mədrəsələrdə dərs vəsaiti kimi istifadə olunmuş əsərləri haqqında məlumat verilir. Həmçinin şairin əsərlərinin dərsliklərə salınmasından, sovet dövründə görkəmli ədibin ədəbi irsinə münasibət və əsərlərinin tədrisindən söhbət açılır.

**AÇAR SÖZLƏR**
M. Füzuli, mollaxana, məktəb, tədris, dərslik

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 08.07.2024
Qəbul edilib: 30.08.2024

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2024, NO. 3, VOL. 281, 32–40
doi.org/10.48445/m0997-7311-5288-g

**M E T H O D S**

# From the History of Teaching the Life and Creativity of Mahammad Fuzuli in Schools

***Imran Verdiyev***
Honored teacher. Azerbaijan.
E-mail: imranverdiyevi@mail.ru
https://orcid.org/0009-0001-5147-544X

**ABSTRACT**
It's discussed about the history of teaching the works of the great Azerbaijani poet M. Fuzuli in educational institutions in article. It's reported about his works used as a textbook in mollakhanas and madrasas. The poet's works are discussed in textbooks. In the Soviet period, the attitude towards the literary heritage of the outstanding writer and the teaching of his works are reported. In the years of independence, new approaches to the literary poet's heritage, teaching of his works in secondary schools are touched upon.

**KEYWORDS**
M. Fuzuli, mollakhana, school, teaching, textbook

**ARTICLE HISTORY**
Received: 08.07.2024
Accepted: 30.08.2024

## Giriş

Orta əsrlər dövründə yaşayıb yaradan Azərbaycan şairi Məhəmməd Füzuli mütəfəkkir və filosof, ədəbiyyat tariximizdə divan janrının görkəmli nümayəndələrindən biridir. Ümummilli liderimiz H. Əliyev deyirdi: *"Füzulinin humanizm və ümumbəşəri dəyərlərlə mayalanmış yaradıcılığı bütün bəşəriyyət üçün böyük mənəvi qidadır".*

Azərbaycan Respublikasının Prezidenti İ. Əliyevin "Dahi Azərbaycan şairi Məhəmməd Füzulinin 530 illiyinin qeyd edilməsi haqqında" imzaladığı Sərəncamda isə oxuyuruq: *"Məhəmməd Füzuli Azərbaycan ədəbi-bədii fikrinin inkişafında müstəsna yer tutan, Yaxın və Orta Şərq ölkələri ədəbiyyatına mühüm təsir göstərən qüdrətli sənətkardır. Hərtərəfli biliyə malik mütəfəkkir kimi onun həyata, insana dərin məhəbbət aşılayan və daim gözəllik duyğusu ilə, ülvi ideallarla yaşamağa çağıran çoxcəhətli bədii-fəlsəfi irsi Azərbaycan xalqının bəşər mədəniyyəti xəzinəsinə bəxş etdiyi misilsiz mənəvi sərvətlərdəndir…".*

Dahi şair Füzulinin "çoxcəhətli bədii-fəlsəfi irsi" yaşadığı dövrdən öyrənilməyə başlanmış, istedadlı nümayəndələri ilə tanınan bütöv bir ədəbi məktəb formalaşdırmışdır. C. Məmmədquluzadə 1925-ci ildə, haqlı olaraq, yazırdı ki, "hansı şeirə baxsanız, görəcəksiniz ki, onda Füzulidən bir duz vardır".

## Əsas hissə

Məqalədə dahi şairin həyat və yaradıcılığının ümumtəhsil məktəblərində tədrisi tarixindən bəhs edilir. Araşdırmalar göstərir ki, könüllər sultanının məktəblərdə öyrədilməsinin tarixi elə öz dövründən − XVI əsrin sonlarından başlanmışdır. Mollaxana, mədrəsə və xüsusi məktəblərdə mükəmməl proqram və dərsliklər olmadığı üçün tədris vəsaiti kimi Quran, "Qabusnamə", "Kəlilə və Dimnə"dən başqa, bədii ədəbiyyat incilərindən − Xaqaninin, Nizaminin, Ruminin, Tusinin, Əvhədinin, Sədinin, Hafizin və başqalarının yazdıqları əsərlərdən istifadə olunurdu. XVI əsrin sonlarından bu tədris vəsaitləri sırasına dahi şair Füzulinin "Divan"ı, "Leyli və Məcnun" poeması və digər əsərləri də əlavə olunmuş, tezliklə ən nüfuzlu dərs vəsaitlərindən birinə çevrilmişdi [1, s. 5]. XIX əsrin sonlarına qədər Azərbaycan və Orta Asiya məktəblərində Azərbaycan dilinin tədrisi üçün anadilli ilk dərs vəsaiti kimi onun "Leyli və Məcnun" poemasının mətnlərindən istifadə edilmişdir. "Söhbətül-əsmar" əsəri isə pedaqoji ədəbiyyatda Azərbaycan dilində yazılmış ilk uşaq ədəbiyyatı nümunəsi kimi qiymətləndirilir [2, s. 73].

Tarixi faktlar göstərir ki, XVII əsrdə Azərbaycanda 1200 məktəb 100-dən çox məd-

rəsə fəaliyyət göstərirmiş. XVII əsrin məşhur türk səyyahı Ö. Çələbinin məlumatına görə, 1647-ci ildə təkcə Təbrizdə 600-dən çox məktəb, 47-dən çox böyük mədrəsə mövcud olub. Onların əksəriyyətində dərs vəsaiti kimi digər klassiklərlə yanaşı Füzulinin əsərlərindən də geniş istifadə edilmişdir.

Bu proses təhsil sistemində mühüm yer tutan mollaxana və mədrəsələrdə XIX əsrin sonlarına kimi davam etmişdir. Professor Ə. Yəqubi qeyd edirdi ki, *"XIX əsrin ortalarında da Azərbaycan və Orta Asiya məktəblərində qiraət üçün tədris vəsaiti kimi Füzulinin ana dilində yazılmış "Leyli və Məcnun" poeması və bir sıra qəzəllərindən ibarət şeirlər məcmuəsinin Təbriz çapından geniş istifadə edilirmiş"* (Maraq üçün qeyd edək ki, 1830 − 1860-cı illərdə Azərbaycan dilində çap olunmuş kitabların 28 faizdən çoxunu Füzulinin Təbrizdə qiraət üçün çap olunmuş "Leyli və Məcnun" poeması və qəzəlləri təşkil edirdi) [3, s. 160].

Təsadüfi deyildir ki, məşhur ədəbiyyatşünas, pedaqoq və metodist F. Köçərli qəlb şairinin əsərlərinin məktəblərdə tədrisi ilə əlaqədar yazırdı: *"...Bu axır vaxtlara kimi onun divani-qəzəliyyatı və "Leyli və Məcnun" hekayəsi məktəblərdə təlim kitabı olub, uşaqlara ondan dərs verilirdi. İndi də köhnə məktəblərdə təhsil almış adamlardan hər birisini dindirsən, "Leyli və Məcnun" hekayəsinin ibtidasını... başlayıb əzbərdən oxuyacaqdır"* [4, s. 10].

Akademik H. Araslı isə "Leyli və Məcnun" poeması barədə deyirdi: *"Bu poema uzun müddət Azərbaycan dili anlaşılan bütün ölkələrin məktəblərində bir dərs kitabı kimi istifadə edilmişdir"* [5, s. 192].

H. Araslı, H. Əhmədov və professor Ə. Yaqubinin qeydlərindən də göründüyü kimi, poemadan tək Azərbaycanda yox, "Azərbaycan dili anlaşılan bütün ölkələrin məktəblərində" dərslik kimi istifadə edilmişdir.

Mollaxana və mədrəsələrlə yanaşı, Füzuli yaradıcılığının tədrisi təxminən XIX əsrin ortalarından meydana çıxan dünyəvi təhsil məktəblərində də aparılırdı. Lakin bu məktəblərdə mədrəsələrdən fərqli olaraq, təhsil proqram, dərslik və digər vəsaitlər vasitəsilə öyrədilirdi.

Ona görə də həmin dövrdən məktəblərin ehtiyaclarını ödəmək üçün dərsliklərin, qiraət kitablarının tərtibi sürətlənmiş, məktəblər üçün xeyli sayda dərsliklər, müntəxəbatlar, dərs vəsaitləri yazılmışdı.

Həmin dərsliklərin bir çoxunda digər yazıçılarımızla yanaşı, Füzulinin əsərlərinə də yer verilmişdir. Məsələn, məşhur şərqşünas alim Mirzə Kazımbəyin 1846-cı ildə Sankt-Peterburqda çap edilmiş "Учебные пособия для временного курса турецкого языка" dərsliyinin ikinci hissəsində − müntəxəbatda verilən mətnlərin içərisində Füzulinin "Leyli və Məcnun" poemasından parçalar vardı. M. Ş. Vazeh də 1852-ci ildə

Tiflis gimnaziyasının Şərq dilləri müəllimi İ. Qriqoryevlə birlikdə yazdığı və üç fəsildən ibarət "Kitabi-türki" dərsliyinə Füzulinin "Leyli və Məcnun" poemasından nümunələr daxil etmişdi. S. Ə. Şirvani özünün "Rəbiül-ətfal"ına şairin təmsillərindən, L. Z. Budaqov isə "Müntəxəbat" adlı dərs vəsaitinə müəllimi M. Kazımbəyin məsləhəti ilə Füzuli "Divan"ından seçmələr salmışdılar. R. Əfəndiyev Bakı Quberniya İdarəsinin mətbəəsində çap olunmuş "Bəsirətül-ətfal" dərsliyində Füzuli haqqında məlumat vermiş, F. Ağazadə isə özünün "Ədəbiyyat məcmuəsi" dərs vəsaitində şair barədə oçerklə yanaşı, onun əsərlərindən nümunələr yerləşdirmişdi.

Təəssüf ki, XIX əsrin II yarısında və XX əsrin əvvəllərində bəzi mətbuat orqanları, həmçinin bəzi görkəmli şəxslər (sonralar da belələrinə təsadüf edilmişdir) tərəfindən klassiklərin, o cümlədən Füzulinin öyrənilməsi və tədrisi "əleyhinə" xoş olmayan fikirlər söylənilmişdir. Bu barədə geniş söhbət açmağa ehtiyac duymuruq. Zənn edirik ki, tədqiqatlarda da deyildiyi kimi, bu fikirlər Füzuliyə və onun yaradıcılığına filoloji yanaşma olmayıb, məsələnin sosioloji, pedaqoji və tərbiyəvi tərəfidir. Bunu həm də zamanın şeir və yeni üslub tələbi kimi qiymətləndirmək olar. Bu tələbi irəli sürənlərin qənaətincə, "gətirmək təzə üslubə gərəkdir köhnə dünyanı" [6, s. 26].

Amma "köhnə üslub təzə dünyanın əynində karnaval effekti yaratdığı kimi, təzə üslub da köhnə dünyanın əyninə düz gəlməyəcəkdi. Təzə dünyanın əyninə təzə üslub biçilməli idi... [Osmanoğlu M. 2017]. Məsələni ədəbiyyatımızın klassiklərinin, o cümlədən Füzulinin əsərlərinin öyrədilməsindən imtina etməklə yoluna qoymaq qeyri-mümkün idi.

Sovet dövründə də şairin əsərlərinin tədrisinə münasibət birmənalı olmamışdır. Keçən əsrin 20-ci illərində yalnız dinə deyil, bütün həyatı boyu dini fanatizmə, mövhumata, avamlıq və cəhalətə qarşı çıxan, öz xalqının tərəqqisinə çalışan M.Füzuli ateist kimi təqdim olunur, dini-mənəvi dəyərlər tənqid obyektinə çevrilirdi. Onun "Könül, səccadəyə basma ayaq" adlı qəzəli orta məktəbin yuxarı sinif ədəbiyyat dərslərində Füzulinin dinsiz və ateist düşüncəyə sahib olmasının sübutu kimi tədris edilirdi. Həmin əsrin 40-cı illərində "Kommunist" qəzeti məktəblərdə "Daima bir Füzuli, bir Vaqif, bir… və sair bu kimi şairləri öyrədirlər", − yazaraq öfkələnirdi. Tədqiqatçı və dərslik müəlliflərindən Füzulini marksizm-leninizm ideologiyası ilə əlaqələndirməyi tələb edirdilər.

Professor Kamil Vəli Nərimanoğlunun qeyd etdiyi kimi, *"insanın milləti, dini, inancı, adət-ənənəsi, tarixi keçmişi, ədəbiyyatı, geni, yaddaşı... var. 60 − 70 il (sovet dövrü və ideologiyası) onun yüzilliklər boyu gələn kimliyini məhv edə bilməz. Yıpradar, deformasiya edər, zədələyər, ancaq silib apara bilməz. Bu ədəbiyyatın gen yaddaşında… Füzuli də var. Bu mənada Füzuli XVI əsrin qüdrətli şairi olduğu kimi,*

*XIX − XXI əsrlərin də modernisti, postmodernisti, post postmodernistidir”* [8, s. 41]. “Dünənlə bu gün arasında savaş olarsa, sabahı itirərik” (U. Çörçill).

Bu adamlar anlamaq istəmirdilər ki, *“klassik − əbədi deməkdir. Klassiki klassik olmayandan ayıran yeganə cəhət də elə budur. Klassikin əsərinə müasirliyi kənardan əlavə etmirlər. Əsrdən-əsrə klassiklər özləri addımlayır. Daha doğrusu, bəşəriyyət, xalqlar özü əsrdən-əsrə addımladıqca klassikə daha çox yaxınlaşırlar. Məqsəd dahi klassikin yaradıcılığına məxsus nəhayətsizliyin, bitməz-tükənməzliyin yeni hüdudlarını kəşf etməkdir”* (Y. Qarayev).

Lakin şairin “hünər, kəlam ustadı və sənətkar olması” qarşısında təslim olan sovet ideoloqları Azərbaycan ədəbiyyatının tədrisi prosesində Füzulinin bir sıra əsərlərini mənbə olaraq qəbul etməyə məcbur olmuşdular. Dərsliklərdə onun yaradıcılığı ilə bağlı icmallar və bir sıra əsərlərinin tədrisi nəzərdə tutulmuş, dərsdənkənar oxu üçün əsərləri müntəxəbatlara daxil edilmişdir. Məsələn, 1949-cu il VIII sinif ədəbiyyat müntəxəbatında şairin “Şikayətnamə” və “Leyli və Məcnun” əsərlərindən başqa, səkkiz qəzəli də verilmişdi. 1963-cü ilin 8-ci sinif dərsliklərində qədim dövr ədəbiyyatından Nizami Gəncəvidən sonra yalnız Məhəmməd Füzuli yaradıcılığı əks olunmuşdur [9, s. 99].

Onu da qeyd edək ki, XX əsrin 70-ci illərindən sonra klassiklərin irsinə münasibətdə, onların tədqiqində və əsərlərinin məktəblərdə tədrisində dönüş başlanmışdı. Bu işlərdə ümummilli lider H. Əliyevin müstəsna xidmətləri olmuşdur. H. Əliyevin ədəbi-tarixi proses konsepsiyasına M. Füzuli “bütün türk xalqlarının böyük şairi” kimi daxil olmuşdu. Bu tarixən ona verilən ən düzgün qiymət idi. O deyirdi: “Füzuli mənim tarixim, Füzuli mənim mənliyimdir”.

XX əsrdə məktəblərdə şairin “Məni candan usandırdı…”, “Könül səccadəyə basma ayaq”, “Heyrət, ey büt…”, “Əql yar olsaydı, tərki-eşqi-yar etməzmidim?”, “Söz” qəzəlləri, “Padişahi-mülk” qitəsi, “Su” qəsidəsi, “Leyli və Məcnun”, “Söhbətül-əsmar” mənzumələrindən parçalar tədris edilirdi.

Müstəqillik illərində digər fənlər kimi ədəbiyyatın tədrisi sahəsində də ciddi dönüş yaranmış, ədəbiyyat tədrisi sovet sisteminin ideoloji ehkam və qəliblərindən azad olmuşdu. Ulu öndər Füzuli irsini “Azərbaycan xalqının, türk dünyasının, türk xalqlarının bu günü və gələcəyi üçün böyük örnək” kimi dəyərləndirərək deyirdi: *“...Elmimizlə, mədəniyyətimizlə, mənəviyyatımızla çox ehtiyatlı, çox diqqətli davranmaq lazımdır. Bu işləri bazar iqtisadiyyatının ixtiyarına vermək olmaz...”*.

Müstəqillik illərində məktəblərdə klassiklərin, o cümlədən M. Füzulinin tədrisinə diqqət artırılmış, yeni fənn proqramında (kurikulumunda) VIII və X siniflərdə şairin həyat və yaradıcılıq yolunun, bəzi əsərlərinin tədrisi nəzərdə tutulmuşdur. Mövzuların

fəal / interaktiv təlim metodları ilə keçirilməsi rəsmi tələb kimi qarşıya qoyulmuşdur. Bunun üçün həmin siniflər üzrə ədəbiyyat dərsliklərinə əlavə kimi hazırlanmış metodik vəsaitlərdə kifayət qədər metodiki göstərişlər verilmişdir. Həmçinin ötən dövrdə Füzulinin tədrisi ilə əlaqədar qabaqcıl iş təcrübəsindən bəhs edən məqalələr, dərslik və proqramlarla müəllimlərin səmərəli işləməsini təmin etmək üçün əlavə metodik vəsaitlər hazırlanmışdır.

Hazırda məktəblərin VIII siniflərində dahi şairin "Söz" qəzəli, X siniflərdə isə "Məni candan usandırdı" qəzəli və "Leyli və Məcnun" poeması tədris olunur. "Söz" qəzəlinin tədrisinə (1 saat əsərin məzmunu üzərində işə, 1 saat təhlil üzrə işə, 1 saat tətbiq, yaradıcı iş və müzakirəyə ayrılmaqla) 3 saat vaxt verilmişdir. X sinifdə isə "M.Füzulinin həyatı, yaradıcılıq yolu" mövzusu üçün 1 saat, "Məni candan usandırdı" qəzəlinin tədrisinə 2 saat (məzmunu üzərində işə 1 saat, təhlil üzrə işə 1 saat olmaqla), "Leyli və Məcnun" poemasının tədrisinə isə (əsərin məzmunun öyrədilməsinə 2 saat, təhlilinə 2 saat olmaqla) 4 saat vaxt ayrılmışdır. Şairin əsərləri sinifdənxaric oxu üçün də tövsiyə olunur.

Etiraf edək ki, hazırda dərketmə forması, təfəkkür tərzi və dili xeyli dəyişmiş, fərqli bir mədəniyyətə yiyələnməkdə olan, Füzulinin yaradıcılığına qərəzli yanaşan, onun əsərlərinə "anlaşılmaz" damğası vuran bir nəsillə üz-üzəyik. Fikrimizcə, bu, böyük şairin əsərlərinin anlaşılması və tədrisindəki bir sıra çətinliklərlə bağlıdır [10, s. 196]. Təsadüfi deyildir ki, 1994-cü ildə ümummilli liderimiz H. Əliyev M. Füzulinin 500 illiyi ilə əlaqədar yubiley üzrə Dövlət Komissiyasının iclasında demişdir ki, *"Füzuli xalqımız arasında nə qədər məşhur olsa da, onun dahiliyi, yaradıcılığının dərinliyi heç də hamıya məlum deyildir"* ["Azərbaycan" qəzeti. 02 yanvar 1994].

Araşdırmalar, şagird və müəllimlərlə aparılmış sorğular, həqiqətən, müasir dövrdə M. Füzulinin şagirdlərə sevdirilməsində və mənimsədilməsində bir sıra çətinliklərin mövcud olduğunu göstərir. Məsələn, şairin mədəniyyət və düşüncə tərzinin indikindən fərqli olması, əsərlərinin əruz vəznində yazılması, dilinin çətinliyi, onlardakı təsəvvüf görüşləri, rəmzləri və s. belə çətinliklərdən sayıla bilər.

Aydın məsələdir ki, sənət əsəri yarandığı dövrün tarixi, mədəniyyəti, adət-ənənələri, düşüncə tərzi içərisində məna kəsb edir və var olur. Füzulinin əsərləri də öz dövrünün obyektiv poetik salnaməsidir. Ümummilli lider H. Əliyev deyirdi: *"Məhəmməd Füzuli öz dövrünün həyatını əks etdirərək, öz mühitindən qida alaraq yaratdığı əsərləri uzaq gələcəyə istiqamətləndirmişdir. Ona görə də Füzulinin əsərləri 500 ildir ki, yaşayır və bundan sonra da yüz illərlə, min illərlə yaşayacaqdır".*

## Nəticə

Beləliklə, Füzulinin əsərlərinin tədrisi yeni yanaşma, ciddi və xüsusi hazırlıq işləri tələb edir. Müəllimlər şagirdlərə onların dərketmə səviyyəsində həmin əsərlərin yarandığı dövrün tarixi, mədəniyyəti (ümumislam mədəniyyəti və türk millətinin özəl mədəniyyəti), zamanın düşüncə tərzi, şairin idealizmi, sufizm ideologiyası, təsəvvüf görüşləri və rəmzləri, bunların bədii təzahür formaları barədə sistemli və şüurlu bilik verməlidirlər. Bundan əlavə, əsərlərin tədrisi zamanı lüğət üzrə iş təşkil edilməli, əsərlərdəki anlaşılmayan kəlmə, ibarə, izafətlər, ərəbizm və farsizmlər aydınlaşdırılmalı, məcazlar sistemindən faydalanmaq bacarığı formalaşdırılmalı, dərin fəlsəfi, dini və irfani mətləblər açıqlanmalı, oradaki elmilik və məntiqilik nəzərə alınmalıdır. M. Füzuli əsərlərinin realistik təsvir obyekti kimi dövr, mühit və müasirlik ilə əlaqələndirilməsinə ehtiyac vardır.

Fikrimizcə, qeyd edilənlər barədə xüsusi dərslər təşkil olunmalıdır. Məsələn, X sinifdə “M. Füzulinin həyatı, yaradıcılıq yolu” mövzusuna ayrılmış vaxtın bir-iki saat artırılması səmərəli olardı. Çünki bu bilik və bacarıqlara sahib olmadan, əsərlərin izahı və təhlili üçün zəmin hazırlamadan Füzulinin əsərlərinin məzmun və ideyasının anlaşılması, dəyərləndirilməsi və müqayisə edilməsi çətinlik yaradar. Şagirdlərin şairin aşılamaq istədiyi əhvali-ruhiyyəni duymaq, daxilən yaşamaq, “özününküləşdirmək” bacarığına malik olması zəruridir. Əks təqdirdə onlarda əzbərçiliyə meyl yaranacaq, mahiyyətini anlamadan dərslikdəki materialları əzbərləməklə kifayətlənəcəklər.

## İstifadə edilmiş ədəbiyyat

1. Ümumtəhsil məktəblərində N. Gəncəvi yaradıcılığının tədrisi məsələləri. (2022). Bakı, “CN Poliqrafiya” MMC. 96 s.
2. Əhmədov H. (2001). Azərbaycan məktəb və pedaqoji fikir tarixi. Bakı, Təhsil. 317 s.
3. Səfərova S. (2023). Azərbaycanda dərsliklərin meydana gəlməsi tarixindən. GDU-nun Elmi xəbərləri, fundamental, humanitar və təbiət elmləri seriyası, № 2. Gəncə, 160 s.
4. Həsənli B. (2016). Ədəbiyyatın tədrisi metodikası (mühazirə mətnləri). Bakı, Müəllim. 10 s.
5. Araslı H. (1958). Böyük Azərbaycan şairi Füzuli. Bakı, *Azərbaycan* Uşaq və Gənclər Ədəbiyyatı Nəşriyyatı. 192 s.
6. Osmanoğlu M. (2019, 14 dekabr). Ədəbiyyatımızda “Füzuli məsələsi”. “Ədəbiyyat” qəzeti, s. 26.

7. Osmanoğlu M. (2017, 15 avqust). Uşaqların baharı və ya klassik üslubun payızı. "Ədəbiyyat" qəzeti.
8. Nərimanoğlu K. V. (2008). Sovet ədəbiyyatı: gerçəkliklər, həqiqətlər, ziddiyyətlər. Türk dünyası dil və ədəbiyyat dərgisi (25), 41 s.
9. Əliyeva E. (2019). İmadəddin Nəsimi yaradıcılığının orta məktəbdə tədrisi. "Azərbaycan məktəbi" jurnalı, № 2. 99 s.
10. Mahmudova A. (2016). Fuzuli eserlerinin öğretiminde karşılaşılan zorluklar ve çözüm önerileri. Uluslararası türk dünyası eğitim bilimləri və sosyal bilimlər konqresi bildiriləri, III cild. Ankara, Türk Eğitim Sen Genel Merkezi Yayınları. 136 s.
11. "Azərbaycan" qəzeti. (1994, 02 avqust).

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2024, № 3 (281), 41–47
doi.org/10.48445/z8500-4527-5940-x

**M E T O D İ K A**

# Azərbaycan dili dərslərində oxu təliminin formalaşdırılması imkanları

***Könül Məmmədova***
Pedaqogika üzrə fəlsəfə doktoru, dosent, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan. E-mail: könül.1970@mail.ru
https://orcid.org/0000-0001-8664-4912

**XÜLASƏ**
Məqalədə ibtidai siniflərdə oxu məzmun xəttinin əsas aparıcı istiqamətlərindən bəhs edilir. Qeyd olunur ki, ibtidai siniflərdə ana dili tədrisinin ən mühüm vəzifələrindən biri *oxu təlimidir*. Gənc nəslin təlim-tərbiyəsində müstəsna rol oynayan oxu məşğələləri vasitəsilə şagirdlər hələ aşağı siniflərdə dünya, cəmiyyət, təbiət və s. haqqında ilkin elmi təsəvvürlər əldə edirlər. Oxu prosesində ən vacib məsələ şagirdlərdə ətraf aləm haqqında düzgün obrazlı təsəvvürlər əsasında yeni biliklər formalaşdırmaqdan ibarətdir. Bu, yuxarı siniflərədək davam edir və oxunun məzmunu hər bir dövrdə – məktəbdən sonrakı dövrlərdə və bütün həyat boyu ideya-siyasi, mənəvi və estetik tərbiyəni təmin etməyə xidmət edir.

**AÇAR SÖZLƏR**
oxu məzmun xətti, düzgünlük, sürətlilik, şüurluluq, ifadəlilik

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 02.07.2024
Qəbul edilib: 14.08.2024

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2024, NO.3, VOL. 281, 41–47
doi.org/10.48445/z8500-4527-5940-x

METHODS

# Possibilities of the Formation of Teaching Reading in the Azerbaijani Language Lessons

***Konul Mammadova***
Doctor of Philosophy in Pedagogy, Associate Professor, Azerbaijan State Pedagogical University. Azerbaijan.
E-mail: konul.1970@mail.ru
https://orcid.org/0000-0001-8664-4912

**ABSTRACT**
The article deals with the main directions of the reading content line in primary classes. The article mentions that one of the most important tasks of teaching the mother tongue in primary classes is teaching reading. Through reading exercises, which play an exceptional role in the education of the youn gergeneration, students get the most basic scientific ideas about the world, society, nature, etc. in the lower grades. The most important issue in the reading process is to form new knowledge on the basis of correct imagery about the surrounding world. This continues into the upper grades, and the content of the reading serves to provide ideological-political, moral and aesthetic education at every age, after school and throughout life.

**KEYWORDS**
reading content line, correctness, speediness, awareness, expressiveness

**ARTICLE HISTORY**
Received: 02.07.2024
Accepted: 14.08.2024

## Giriş

Oxu bacarığı hər bir şəxsin intellektual səviyyəsini təcəssüm etdirən əsas göstəricilərdən biridir. Oxu – şagirdlərin dil duyumunun inkişafını təmin edir, fikrin ifadə olunmasında sözün məna xüsusiyyətlərini açmağa, cümlə və mətnin əhəmiyyətini anlamağa, əldə edilən vərdişlərin məqsədyönlü şəkildə inkişafına nail olmağa, dilin gözəlliyini, üslubi imkanlarının zənginliyini kəşf etməyə imkan yaradır. O həmçinin müxtəlif üslub, məzmun və mövzulara malik mətnlərin mahiyyətinin açılmasına, qavranılmasına, ana dilində yazılmış elmi-kütləvi və ədəbi-bədii əsərlərin oxunmasına marağı dərinləşdirməyə, nitq mədəniyyətini və ümumi mədəni səviyyəni yüksəltməyə, lüğət ehtiyatını zənginləşdirməyə, hadisələri təhlil etməyə və s. xidmət edir.

İbtidai siniflərdə oxu dərsləri şagirdlərin nitqini, təfəkkürünü, təxəyyülünü, yaradıcılığını inkişaf etdirir, onlarda yüksək əxlaqi-mənəvi keyfiyyətlər formalaşdırır: "*Oxu dərslərində şagirdlərdə vətənə məhəbbət və sədaqət tərbiyə olunur, onlara xeyirxahlıq, ədalətlilik, namusluluq, mərdlik, fədakarlıq, təvazökarlıq, düzlük və doğruçuluq kimi sosial-əxlaqi keyfiyyətlər aşılanır, onların dünyagörüşünün formalaşması üçün ilkin bünövrə qoyulur*".

## Əsas hissə

Oxu şagirdlərin fikirlərini şifahi və yazılı şəkildə ifadə etmək bacarığını artırır, onlarda oxunmuş materialın məzmununu şüurlu, düzgün, sürətli və ifadəli şəkildə nəql etmək bacarıqlarını formalaşdırır.

İbtidai siniflərdə oxu təliminin icrasında əsas fənn olan Azərbaycan dilinin tədrisi milli dövlətçilik maraqları baxımından ən vacib məsələlərdən biridir. Bu məsələnin həlli ibtidai siniflərdən məhz oxu təlimi vasitəsilə həyata keçirilməyə başlanır. İbtidai sinif kurikulumunda Azərbaycan dili fənnindən oxu təliminin məzmununda siniflər üzrə aşağıdakılar nəzərdə tutulur:

**I sinif üzrə:**

Şagird mətndə rast gəldiyi yeni əşya və hadisələri adlandırır, müəyyən olunmuş sözləri yaxınmənalı sözlərin köməyi ilə izah edir, öyrəndiyi yeni yaxınmənalı sözləri cümlədə işlədir, kiçikhəcmli mətnləri düzgün tələffüz edərək oxuyur, müxtəlif bədii mətnləri (nəzm, nəsr) fərqləndirir, mətnin şəkilli planını tutur, mətndəki əsas fikri müəyyənləşdirərək onu sadə formada ifadə edir və mətnin məzmununu nəql edir.

**II sinif üzrə:**

Şagird mətndə frazeoloji ifadələrin mənasını izah edir, rast gəldiyi yeni əşya və hadisələrin adlarını müvafiq məna qrupuna aid edə bilir, yaxınmənalı və əksmənalı sözləri fərqləndirir, müvafiq mətnləri tələffüz normalarına uyğun düzgün və sürətli oxuyur, kiçikhəcmli bədii mətnləri janrlara görə fərqləndirir, oxu bacarıqlarına yiyələndiyini nümayiş etdirir, mətnin hissələrinə başlıqlar verməklə məzmununa aid sadə plan tutur, məzmunu tərtib etdiyi plana uyğun nəql edir və mətndəki əsas fikri həyatla əlaqələndirir.

**III sinif üzrə:**

Şagird mətndə rast gəldiyi yeni əşya və hadisələrin xarakter əlamətlərini adlandırır, sözlərin həqiqi və məcazi mənasını, çoxmənalı sözləri fərqləndirir, müvafiq mətnləri düzgün, sürətli, intonasiya ilə (cümlə növlərinə görə) oxuyur, bədii və elmi-kütləvi mətnləri fərqləndirir, mətnin geniş planını tutur, əsas fikrə münasibətini bildirir və vacib hissələrini seçib nəql edir.

**IV sinif üzrə:**

Şagird mətndəki terminləri, obrazlı ifadələri fərqləndirir, mətnləri düzgün, sürətli, intonasiya ilə (obrazların xarakterinə uyğun) oxumaqla oxu vərdişlərinə yiyələndiyini nümayiş etdirir, mətni genişləndirmək, dəyişdirmək və ya davam etdirmək məqsədi ilə yaradıcı plan tutur və mətnin məzmununu genişləndirir, dəyişdirir, yaradıcı şəkildə davam etdirir, əsərin ideyasını müəyyənləşdirir, obrazları sadə şəkildə səciyyələndirir, bədii və elmi-kütləvi mətnlər haqqında kiçik təqdimatlar edir [Azərbaycan Respublikasında ümumi təhsilin dövlət standartları].

“Söz ən gözəl tərbiyə vasitəsidir” – deyən müdriklərimiz milli-mənəvi dəyərlərimizə yiyələnməkdə oxunun müstəsna əhəmiyyətə malik olduğunu bildirmişlər. Dil duyumunun inkişafı, sözün məna xüsusiyyətlərinin öyrənilməsi, mətnin rolunun anlaşılması, bu istiqamətdə zəruri vərdişlərin məqsədyönlü şəkildə təkmilləşdirilməsi, dilin gözəlliyi və üslubi imkanlarının zənginləşməsində oxu təliminin əhəmiyyəti inkaredilməzdir. Bu baxımdan məzmun xətti ibtidai siniflərdə müxtəlif üslublarda yazılmış mətnlərin tədrisi vasitəsilə ana dilinə, ədəbiyyata, ümumilikdə mütaliəyə marağı dərinləşdirməkdə mühüm əhəmiyyət kəsb edir.

Oxu təlimi ümumilikdə təhsilin əsas funksiyalarından biridir. İbtidai siniflərdə oxu təlimi nəqletmə, təhliletmə, münasibət bildirmə, müqayisəetmə, əlaqələndirmə və s. bu kimi bacarıqları formalaşdırmaqla yanaşı, şagirdlərin nitq və təfəkkürünün inkişafında da əsas rol oynayır. Bu baxımdan oxu texnikasına yiyələnmək oxunun keyfiyyətini şərtləndirir.

Oxu texnikası eşitməyə, görməyə, tələffüzə, təhlilə, mənanın anlaşılmasına əsasla-

nan bir proses olub, özündə bir sıra cəhətləri ümumiləşdirir. Oxuya verilən tələblər oxu texnikasının əsasını təşkil edir və onlara riayət edilməsi oxunun səmərəliliyini artırır. İbtidai siniflərdə oxuya verilən tələblər aşağıdakılardır:

- düzgünlük,
- oxunun sürəti,
- şüurluluq,
- ifadəlilik.

Oxunun düzgünlüyü dedikdə, aşağıdakılar nəzərdə tutulur:

1) sözləri aydın, səlis tələffüz etmək (təhrif etmədən, heca və səsləri buraxmadan, əlavə etmədən, yerini dəyişmədən oxumaq);
2) sözlərdə vurğudan düzgün istifadə etmək;
3) ədəbi tələffüz qaydalarına (orfoepiya qaydalarına) riayət etmək;
4) mətni rabitəli şəkildə, yəni sözlərarası deyil, cümlələrin sonunda fasilə verməklə oxumaq;
5) mətndə durğu işarələrinin vəzifələrinə riayət etmək;
6) sözü qrammatik cəhətdən dəyişməmək;
7) sözü başqa bir sözlə əvəz etməmək;
8) cümləni söz buraxmadan oxumaq, yeni söz əlavə etməmək;
9) söz və cümlələri təkrar etmədən oxumaq;
10) kəkələmə, tıntınlıq, pəltəklik kimi nitq qüsurlarına yol verməmək.

Oxunun düzgünlüyü artikulyasiyanın dəqiqliyindən asılıdır. Belə ki, ibtidai siniflərdən başlayaraq, oxu prosesinin şagirdlər tərəfindən yuxarıda göstərilən tələblərə riayət edilməklə icrasına diqqət edilməli, sözlərin yazıldığı kimi deyil, Azərbaycan dilinin orfoepiya qaydalarına uyğun şəkildə oxunmasına nəzarət edilməli, sözlərin düzgün tələffüzü təmin edilməli, orfoepik-orfoqrafik qaydalar öyrənilməlidir. Danışıq üzvlərinin qüsurlu olması şagirdlərdə oxu qaydalarının pozulmasına səbəb ola bilər (Məsələn, “z”, “r”, “s”, “ş” kimi hərfləri düzgün tələffüz edə bilməmək və s.).

İbtidai siniflərdə düzgün oxu bacarığına verilən əsas tələblərdən biri də oxunun sürətidir. Düzgün və sürətli oxuya nail olmağın ən səmərəli yollarından biri mətndəki çətin sözləri əvvəlcədən müəyyənləşdirib təhlil etməkdir. İbtidai siniflərdə şagirdlər ilk vaxtlar səsləri hecalarda tərtib etməklə, daha sonra sözləri hecalara bölüb oxumaqla oxu vərdişlərini təkmilləşdirirlər. Bu, oxu texnikasına yiyələnməni sürətləndirir. Oxunmuş mətnin yenidən oxunması “oxu sahəsini” genişləndirir. Təkrar oxu zamanı marağın artırılması üçün yeni tapşırıqlar vermək lazım gəlir.

Oxunun şüurluluğu təqdim edilən mətnin məzmununun mənimsənilməsinə xidmət edir. İbtidai sinif səviyyəsində oxu zamanı əsas məsələ səsləri hecalarda, hecaları sözlərdə birləşdirməkdir. Bu zaman oxunun mənası tam başa düşülmür. Digər tərəfdən, yazılı nitqin qavranılması şifahi nitqin qavranılmasından daha çətin olduğu üçün oxunan mətnin səs obrazı asan, qavranılması isə çətin olur. Mətnə dair illüstrasiyalar bu çətinliyin aradan qaldırılmasına xidmət edir.

**Nəticə**

Oxuya verilən ən vacib tələblərdən biri də oxuda ifadəliliyin təmin edilməsidir. İntonasiya, məntiqi vurğu, fasilə və oxunun sürəti ifadəliliyin ən mühüm vasitələrindəndir. İfadəlilik təkcə oxu zamanı deyil, məzmunun nəql edilməsində, əzbər söyləmə, deyişmə və danışıqda da gözlənilməlidir. İbtidai siniflərdə şagirdlərin ifadəli oxu üzrə ilkin vərdişlərə malik olması müəllimin özünün bu vərdişə nə dərəcədə yiyələnməsindən, şagirdlərə necə nümunə olmasından asılıdır. Müəllim oxuyacağı əsərin ideya-məzmunu üzərində düşünməli, yazıçının nə demək istədiyini bilməli, oxuyarkən hadisənin iştirakçısı kimi hərəkət etməlidir.

İbtidai siniflərdə oxu metodikasını mənimsəmək, xüsusilə ifadəli oxu qaydalarına riayət etmək düzgün, savadlı nitqə yiyələnməyə yardım edir, şəxsin əxlaq və mənəviyyatının zənginləşməsinə, yaradıcı təfəkkürünün inkişafına, natiqlik qabiliyyətinin yüksəlməsinə şərait yaradır və oxunun səmərəliliyini artırır. Azərbaycan dili fənn kurikulumunda oxu məzmun xətti mətndə tanış olmayan sözlərin mənasını müəyyənləşdirməyi, həmçinin mətnin məzmun və strukturunu mənimsəməyi özündə əks etdirir.

**İstifadə edilmiş ədəbiyyat**


1. "Azərbaycan Respublikasında ümumi təhsilin dövlət standartları". (2020, 29 sentyabr). Bakı.
2. "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası". (2013). Bakı, Azərbaycan məktəbi, № 5, s. 6 – 17.
3. "Azərbaycan Respublikasında dövlət dili haqqında" Azərbaycan Respublikasının Qanunu. (2 yanvar 2003). Bakı.
4. "Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun istifadəsinə və ölkədə dilçiliyin inkişafına dair Dövlət Proqramı" haqqında (2013 – 2020-ci illər). (2012, 23 may). Bakı.

5. "Azərbaycan Respublikasının ümumtəhsil sistemində Qiymətləndirmə Konsepsiyası". (2009, 13 yanvar). Bakı.
6. Kərimov Y. (2013). İbtidai siniflərdə Azərbaycan dilinin tədrisi metodikası. Dərslik. Bakı, Səda, s. 178.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2024, № 3 (281), 48–55
doi.org/10.48445/g8493-5608-4055-j

METODİKA

# Durğu işarələrinin tədrisində qarşıya çıxan aktual problemlər

***Mətanət Mehdiyeva***
Filologiya üzrə fəlsəfə doktoru, baş müəllim, Azərbaycan dili və onun tədrisi texnologiyası kafedrası, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan.
E-mail: mehtiyeva_m@mail.ru
https://orcid.org/0009-0005-0068-4590

**XÜLASƏ**
Bu gün durğu işarələri ilə bağlı müəyyən qayda və normalar mövcuddur. Bəzən onların say etibarı ilə çoxluq təşkil etməsi, bəzən praktikada tətbiqinin mümkünsüzlüyü, bəzən də elmi mülahizələrin bədii mətnlər üzərində aparılması müəyyən çətinliklərə səbəb olur. Hazırkı dövrdə durğu işarələrinə aid yetərincə ədəbiyyatlara rast gəlmək mümkündür. Amma orada verilən qaydaların əksəriyyətinin təkrar olduğunun şahidi oluruq. Bu sahədə yeni fikirlər formalaşmalı, tədqiqatlar aparılmalıdır. Mübahisəli, birmənalı qəbul olunmayan məsələlərə aydınlıq gətirilməli, istər orta, istərsə də ali məktəb qrammatikasının “Sintaksis” bölməsində bu məsələlər yer almalıdır. Fikrimizcə, bu gün sosial şəbəkələrdə istifadə olunan müəyyən şərti işarələr də sistemləşdirilə bilər. Punktuasiya qaydaları sabitləşsə, ondan istifadə qaydaları da dəqiq və elmi olar.

**AÇAR SÖZLƏR**
durğu işarələri,
vergül, intonasiya

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 13.07.2024
Qəbul edilib: 19.08.2024

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2024, NO. 3, VOL. 281, 48–55
doi.org/10.48445/g8493-5608-4055-j

**M E T H O D S**

# Actual Problems Encountered in the Teaching of Punctuation Marks

***Matanat Mehdiyeva***
Doctor of Philosophy in Philology, Head teacher, Azerbaijani Language and its Teaching Technology Department, Azerbaijan State Pedagogical University.
Azerbaijan. E-mail: mehtiyeva_m@mail.ru
https://orcid.org/0009-0005-0068-4590

**ABSTRACT**
Today, there are certain rules and norms regarding punctuation. Sometimes their large number, sometimes the impossibility of applying them in practice, and sometimes conducting scientific considerations on literary texts cause certain difficulties. We find enough literature on punctuation. But we witness that most of the rules in them are repeated. New ideas should be formed in this field, researches should be conducted. Controversial and unequivocally accepted issues should be clarified, and these issues should be included in the "Syntax" section of both secondary and higher school grammar. In our opinion, certain conventional signs used in social networks today can also be systematized.

**KEYWORDS**
punctuation marks, punctuation, intonation

**ARTICLE HISTORY**
Received: 13.07.2024
Accepted: 19.08.2024

## Giriş

Durğu işarələrindən bəhs edən bölmənin ümumiləşmiş şəkildə *punktuasiya* (latınca *nöqtə* deməkdir) adlandığı hamımıza məlumdur. Punktuasiya durğu işarələrindən istifadə qaydalarının cəmi olub, orfoqrafiya və kalliqrafiya ilə birlikdə yazı qaydalarının nizama salınmasında xüsusi əhəmiyyətə malikdir. Təəssüflər olsun ki, yazılı nitqimizdə durğu işarələrindən heç də həmişə yerində və düzgün istifadə edilmir. Onlardan düzgün istifadə etmək üçün punktuasiyaya daxil olan qaydaları bilmək lazımdır. Fikrimizcə, bu qaydalar say baxımından mümkün qədər az olmalıdır ki, onları öyrənib yadda saxlamaq və yazılı nitqdə tətbiq etmək asan olsun.

## Əsas hissə

Yazılı nitqin düzgün formalaşmasında durğu işarələrinin böyük rolu vardır. Onlar mətnin düzgün anlaşılmasında yardımçı vasitə olub, mühüm kommunikativ funksiya daşıyır. Punktuasiya da orfoqrafiya kimi dilin qrafik sistemini təşkil edir. Durğu işarələri fikrin aydın başa düşülməsində, yazının düzgün, ifadəli tələffüzündə çox mühüm və əhəmiyyətli qrafik vasitədir. Bunları yerində işlətmədikdə fikirdə dolaşıqlıq yaranır. Şifahi nitqlə yazılı nitq arasında məzmun eyniliyi pozulur [1, s. 3].

Durğu işarələrinin yaranması tarixinə nəzər saldıqda görürük ki, onlar yazıdakı digər işarələrlə bir dövrdə meydana çıxmamış, hərflərdən sonra təşəkkül tapmışdır. Durğu işarələri, əsasən, fonoqrafik yazıdan başlanır. Onlar ilk dəfə Finikiya və Yunanıstanda istifadə olunmuşdur. Yazıda durğu işarələrindən geniş miqyasda istifadə XIII əsrdən başlanılmışdır.

Hər bir dilin milli xüsusiyyətlərinə uyğun sistemlər formalaşır. XV əsrdə kitab çapının yaranması ilə durğu işarələrinin sayı çoxalmışdır. XVIII əsrdən etibarən sual, nida kimi işarələr indiki vəzifəsində işlədilməyə başlanmışdır. Azərbaycan dilində verilən yazılarda durğu işarələrindən nöqtəni əvəz edən xüsusi işarəyə 1073-cü ildə yazıya köçürülmüş "Kitabi-Dədə Qorqud" dastanında rast gəlirik. Əsərin XV əsrdə köçürülmüş Drezden nüsxəsində hər bir cümlənin sonunda qoyulan ulduzvari işarə, təəssüf ki, geniş yayıla bilməmişdir. XIX əsrin 30-cu illərindən başlayaraq, rus və Avropa yazı sistemi ilə bilavasitə tanışlıq, yeni məktəblərin yaranması, yeni üsulda dərs vəsaitinin hazırlanması kimi məsələlər durğu işarələrindən istifadəyə ehtiyacı artırmışdır. Bu səbəbdən qərb xalqlarının işlətdiyi durğu işarələrinə meyil artmış, bəzi alınma durğu işarələrinin tətbiqinə təşəbbüs göstərilmişdir. Məsələn, professor Mirzə Kazım bəy 1839-cu ildə çap etdirdiyi "Грамматика турецко-татарского языка" dərsliyində tələbələrin çalışması üçün ərəb əlifbası ilə verdiyi səkkiz səhifəlik mətnlər-

də hər biri iki yerdə olmaqla cəmi 2 durğu işarəsindən – nöqtə yerinə ulduzabənzər işarədən (*) və tiredən (–) istifadə etmişdir. Eyni mətnin rus hərfləri ilə verdiyi transkripsiyasında müəllif Avropa yazı sistemindəki durğu işarələrindən yeddisini işlətməli olmuşdur (nöqtə, vergül, nöqtəli vergül, iki nöqtə, tire, defis və mötərizə) [2, s. 181].

Professor Q. Kazımov punktuasiyanın əsaslarının izahında 3 meylin olduğunu qeyd edir. Onlardan bəziləri mənaya, bəziləri sintaktik quruluşa, bəziləri isə intonasiyaya əsaslanır. *Birinci* halda durğu işarəsinin işlədilməsi mətnin mənalı hissələrə bölünməsi ilə izah edilir. *İkinci* halda cümlənin sintaktik quruluşu, *üçüncü* halda isə nitqin ritmik-melodik axını, vurğu, fasilə və s. əsas götürülür [3, s. 486]. Alim bunlardan məna məsələsinin daha həlledici amil olduğunu bildirir. Qeyd edir ki, durğu işarələrinin işlədilməsi hər 3 məna ilə əlaqədardır. Lakin cümlənin quruluşu da, intonasiyası da müəyyən məqsəd, mənanın ifadəsi ilə bağlıdır. Qəzənfər müəllimin bəzən durğu işarələrinin işlədilməsinin intonasiya ilə heç bir əlaqəsi olmadığı fikri maraqlıdır. Doğrudan da, vasitəsiz nitqin dırnaqda verilməsi, müxtəlif emosiyaları çatdırmaq üçün mötərizə içərisində sual işarəsi və s. intonasiya ilə əlaqəsi yoxdur və ya çox zəifdir.

Professor Ə. Dəmirçizadə də durğunun ifadənin tərkibindəki sözlər arasında, cümlə üzvləri arasında, mürəkkəb cümləni təşkil edən cümlələr arasında, nəhayət, cümlənin sonunda müxtəlif məna ilə, məqsəd və psixoloji hal ilə sıx surətdə bağlı olan çox mürəkkəb bir proses olduğunu qeyd edir [4, s. 167].

Ümumiyyətlə, dilçiliyimizə nəzər saldıqda görürük ki, durğu işarələri haqqında bir çox dilçi alimlər maraqlı fikirlər söyləmişlər. Ancaq Azərbaycan dilində verilən yazılarda işlənən durğu işarələrinin xüsusiyyətləri haqqında, əsasən, C. Əfəndiyev, M.Şirəliyev, Z. Budaqova, M. Həsənov, M. Hacıyev, M. Hüseynova, N. Qulamoğlu kimi dilçilər daha ətraflı məlumat vermişlər.

Qeyd edək ki, bu gün tələbə qəbulu prosesində durğu işarələri ilə bağlı testlərdə bəzi mübahisə doğuran məqamlar ortaya çıxır. Ümumiyyətlə, *durğu işarələrinin tədrisi orta məktəblərdə nə vəziyyətdədir*, *şagirdlərə bu mövzu ilə bağlı yetərincə bilgi verilirmi*, *şagirdlər praktik olaraq durğu işarələrinin işlədilmə məqamları ilə tanış olurlarmı* və s. kimi suallar maraq doğurur.

Durğu işarələri mövzusu ümumtəhsil məktəblərinin Azərbaycan dili dərslərində ibtidai siniflərdən başlayaraq əvvəlcə bir qədər bəsit şəkildə, V sinifdən isə daha dəqiq və geniş şəkildə tədris olunur. Mətnlər üzərində işləyərkən şagirdlər dil qaydası məzmun xəttinin standartlarına uyğun olaraq sintaksis təlimin məzmunu, norma və qaydaları, eyni zamanda üslubi sintaksis məsələləri ilə də tanış olur, intonasiyanın linqvistik xüsusiyyətlərini müəyyənləşdirməyi bacarırlar.

Durğu işarələri cümlənin məqsəd və intonasiyaya görə növləri, həmcins üzvlər, tabeli və tabesiz mürəkkəb cümlələr, cümlə üzvü olmayan qrammatik vahidlər və s. sadə və mürəkkəb cümlə konstruksiyalarından kənarda mənimsənilə bilməz. Bildiyimiz kimi, durğu işarələri şifahi nitqdə intonasiyanın yazıdakı ifadə formasıdır. Əslində, durğu işarələri özləri də iki yerə ayrılır: durğu və şərti işarələr. Durğu işarələrinin sayı ondur. Şərti işarələr isə elmi-texniki ədəbiyyatlarda rast gəldiyimiz "vurma", "bölmə", "çıxma", "toplama", "bərabərlik" və s. kimi işarələrdən ibarətdir. Diqqət etsək görərik ki, hazırda sosial şəbəkələrdə fərqli emosiyaları ifadə etmək üçün müxtəlif şablon işarələrdən istifadə olunur. Məsələn, (( , )). Yəqin ki, zamanla bu işarələrdən də seçilib durğu işarələri sırasına daxil edilənlər olacaq.

Müasir Azərbaycan dilində aşağıdakı durğu işarələrindən istifadə edilir: nöqtə, vergül, nöqtəli vergül, qoşa nöqtə, sual, nida, tire, üç nöqtə, mötərizə, dırnaqlar. Etiraf edək ki, bu gün yazılı nitqdə heç də hamı durğu işarələrindən düzgün qaydada istifadə etmir. Xüsusən də, sosial şəbəkələrdə bunun şahidi oluruq.

Durğu işarələrindən düzgün istifadə etmək üçün müəyyən olunmuş qayda və normalar mövcuddur. Bu qaydaları bilmədən yazılı nitqdə durğu işarələrindən düzgün istifadə edə bilmərik. Düzdür, qaydalar olmalıdır, amma onlar say etibarı ilə nə qədər az olsalar, bir o qədər yaxşıdır. Çünki qaydaların çoxluğu onları yadda saxlayıb tətbiq etməkdə çətinlik yaradır. Məsələn, bugünümüz üçün dinamik bir dil olan ingilis dilində vergül işarəsindən çox az, demək olar ki, ən zəruri hallarda istifadə olunur. Gəlin dilimizlə müqayisə aparaq. Dilimizdə təkcə vergüllə bağlı 56 qaydanın mövcud olduğunu deyə bilərik. Fikrimizcə, bu sayda qaydanı əzbərləyib yazıda tətbiq etmək heç də asan məsələ deyil. İkinci bir tərəfdən, bu qaydalar stabil deyil. Məsələn, *o* və *bu* işarə əvəzliyinin mübtəda kimi işlənən zaman ondan sonra vergülün nə zaman qoyulması mübahisə doğurur.

*O* və ya *bu* əvəzliyi ilə ifadə olunan mübtəda isim, sifət və ya say ilə ifadə olunan cümlə üzvündən əvvəl gələrsə, ondan sonra vergül qoyulur. *O* şəxs və ya *bu* işarə əvəzliyi ilə ifadə olunan mübtəda əvəzlik, feil, zərf və köməkçi nitq hissələrindən əvvəl gələrsə, ondan sonra vergül qoyulmur. Bu qayda Z.Budaqovanın fikridir. Professor B.Xəlilov Zərifə xanımın bu fikirlərini təsdiq edir və əlavə olaraq onu da vurğulayır ki, mübtəda *o* şəxs əvəzliyi ilə ifadə olunduqda ondan sonra *bu* işarə əvəzliyi gələrsə, *o* şəxs əvəzliyindən sonra vergül işarəsi qoyulmalıdır. Müəllif vergüldən bəhs edərkən maraqlı məqamları diqqətə çatdırır. Qeyd edir ki, mübtədanın özündən sonra gələn üzvün təyini kimi başa düşülməməsi üçün ondan (mübtədadan) sonra vergül qoyulur. *Qoca, əmioğlu ilə görüşdü, salamlaşdı* (S. S. Axundov). Professor Q. Kazımov isə yazıda şəxs əvəzliyindən sonra (isim, sifət, say və zərfdən əvvəl) vergül qoyulduğunu

bildirir. V. Dumanoğlu və İ. Əsgər isə *o, bu* şəxs əvəzliklərindən sonra feil və köməkçi nitq hissələri gəldikdə vergül qoyulmadığını diqqətə çatdırırlar. Onlar bir məqamı da qeyd edirlər ki, bir vaxtlar mübtəda vəzifəsində işlənən *o, bu* əvəzliklərindən sonra, feil və köməkçi nitq hissələri ilə yanaşı, zərf də gəldikdə vergül qoyulmurmuş [5, s. 46]. B. Xəlilovun fikirləri Z. Budaqovanın fikirləri ilə üst-üstə düşür. Əslində, bu cür fikir müxtəlifliyinin olması vergüldən istifadədə bir sərbəstlik yaradır. Etiraf etmək lazımdır ki, hal-hazırda da bu cür fikir müxtəlifliyi hökm sürür, yəni dəqiq sistem yoxdur. Professor Ə. Əfəndizadənin bir fikri diqqətimizi çəkir: "Bəzən ismin də qarşısında gələn *o, bu* mübtədalarından sonra vergülə ehtiyac duyulmayan hallar olur. Məsələn, "*O Kiyevdən dünən qayıdıb*", "*Bu Nəsiminin heykəlidir*" kimi cümlələrdə *o, bu* əvəzlikləri yalnız mübtəda kimi çıxış edir, təyinlə qarışdırılmır. *O, bu* əvəzlikləri mübtəda vəzifəsini daşıyarkən onları təkcə köməkçi sözlərin qarşısında vergüllə fərqləndirməyə ehtiyac yoxdur. Ona görə ki belə halda həmin əvəzliklər heç vaxt təyin ola bilmir. Məsələn, "*O da qaynaqçıdır*" [6, s. 76]. Professor Ə. Əfəndizadə *o, bu* əvəzlikləri ilə ifadə olunan mübtədalardan sonra yalnız köməkçi söz gəldikdə vergüldən istifadə etməyi məqsədəuyğun hesab edir. Fikrimizcə, *o, bu* əvəzlikləri mübtəda vəzifəsində işlənərkən onlardan sonra vergül işarəsinin qoyulmasına dair vahid bir qayda yaradılmalıdır. Bu zaman vergüldən istifadədə sərbəstliyin qarşısı alınar.

Professor M. Şirəliyev və M. Hüseynov *o, bu* əvəzliklərindən sonra isim, sifət, say gəldikdə vergül qoyulmasını məqbul hesab etmişlər [7, s. 9].

Arif Rəhimoğlu "Azərbaycan türkcəsi ədəbi dilində bütövləşmə və düzgün yazı qaydaları" kitabında durğu işarələrindən bəhs edir, amma *o, bu* əvəzlikləri mübtəda yerində işlənərkən onlardan sonra vergülün işlənmə məqamlarına açıqlama vermir [8, s. 183].

Professor İ. Məmmədli *o, bu* əvəzliklərindən sonra feil və köməkçi nitq hissələrindən başqa, qalan nitq hissələri ilə ifadə olunan cümlə üzvü gəldikdə vergül qoyulmasını məqbul hesab edir. *O, bu* əvəzlikləri mübtəda vəzifəsində işlənərkən özündən sonra feil və köməkçi nitq hissələri (feili sifət və modal sözlərdən başqa) gələrsə, vergül qoyulmadığını vurğulayır [9, s. 9]. Professor A. Axundov qeyd edir ki, durğu işarələri haqqında yazılan kitablarda ən çox onların qrammatik mahiyyəti açıqlanır, fonetik vəzifəyə önəm verilmir. Xüsusən vergül işarəsi başdan-başa qrammatik yüklə yüklənir. Alim yazır: "Doğrudanmı belədir? Nə üçün, məsələn, "*O kitab oxumaqla vaxtını keçirirdi*" cümləsində *o* sözü ilə *kitab* sözü arasında heç bir fasilə olmadığı halda, biz *o* sözündən sonra vergül işarəsi qoymalıyıq? Və yaxud, nə üçün "*O özü də kitab oxumağı sevirdi*" cümləsində isə *o* sözü ilə *özü də* sözü arasında fasilə verildiyi halda həmin durğu işarəsindən istifadə etməyək? Ancaq ona görəmi ki,

dilçilik kitablarında belə yazılır? [10, s. 185]. A. Axundov qoşa nöqtə, nöqtəli vergül, tire işarəsi ilə bağlı məqamları da diqqətə çatdırır. Alim yazılı dildə durğu işarələrindən çox istifadəni məqbul hesab etmir, rus dili, eləcə də Avropa dillərində durğu işarələrindən istifadənin məhdudluğunu alqışlayır. Fikrimizcə, durğu işarələri yazılı nitqimizdə zəruri olan hallarda işlənərsə, onların işlənmə yeri də dəqiq və mübahisəsiz olar. Təəssüflə qeyd etmək lazımdır ki, punktuasiya sahəsinə yetərincə diqqət yetirilməmişdir. Bu gün işlədilən qaydalar, demək olar ki, sovet dövrünün qaydalarıdır. Düşünürük ki, bu sahədə yeni-yeni tədqiqat işləri aparılmalıdır. Məsələn, punktuasiyaya aid beş kitab müəllifi olan Nabatəli Qulamoğlu bu sahədə tədqiqat aparmış, kreativ fikirlər irəli sürmüşdür. Müəllif belə bir təklif irəli sürmüşdür ki, ardıcıl gələn saylar arasında orfoqrafik işarə sayılan drobdan (maili xətt) istifadə edilə bilər. Həmçinin o, eyni intonasiya ilə deyilən qrammatik vahidlər arasında tirenin işlənmə məqamlarını da qeyd etmişdir [11, s. 6].

Qəbul imtahanlarına salınan testlərdə durğu işarələri ilə bağlı yaranan bəzi səhvlərin başlıca səbəbi punktuasiya ilə durğu işarələrinin eyniləşdirilməsidir.

Bəzən dərsliklərdə bədii mətnlərdən parçalar verilir. Təəssüflər olsun ki, onlarda müəyyən durğu işarəsi səhvləri olur. Düşünürük ki, bu sahədə aparılan tədqiqatlarda bədii nümunələrə əsaslanan zaman diqqətli olmaq lazımdır.

**Nəticə**

Durğu işarələrindən istifadəni tənzimləyən qaydalar çoxdur, lakin onlar nitq prosesində yaranan yeni situasiyaları nizamlamaq cəhətdən azlıq təşkil edir. Bəzən yazılı nitqlə şifahi nitq arasında uyğunluq tapmaq asan olur, bəzən isə bu proses çətinləşir. Bu zaman müəyyən kriteriyalar axtarmaq lazım gəlir.

Yazıçı A. P. Çexovun “oxunun notları” adlandırdığı durğu işarələri və onlardan istifadə qaydaları dəqiq və məntiqli olmalıdır. Çünki durğu işarələri dinamik bir sistemdir.

Məqalədə durğu işarələrindən ümumi şəkildə danışsaq da, daha çox vergülün üzərində dayandıq. Çünki ən çox edilən səhvlər də məhz vergüllə bağlıdır. Amma qeyd edək ki, digər durğu işarələrinin işlədilməsi ilə də bağlı müəyyən çətinliklər mövcuddur. Bu mövzuda tədqiqat işlərinin aparılmasına ciddi ehtiyac duyulur.

**İstifadə edilmiş ədəbiyyat**

1. Budaqova Z. (1977). Azərbaycan dilində durğu işarələri. Bakı, "Elm" nəşriyyatı. 315 s.
2. Cahangirov M. (1978). Azərbaycan milli ədəbi dilinin təşəkkülü. I hissə. Bakı, "Elm" nəşriyyatı. 234 s.
3. Kazımov Q. (2007). Müasir Azərbaycan dili (Sintaksis). Bakı, Təhsil. 496 s.
4. Dəmirçizadə Ə. (1972). Müasir Azərbaycan dili. I hissə. Bakı, "Maarif" nəşriyyatı.
5. Əsgərov İ., Dumanoğlu V. (2016). Müasir Azərbaycan ədəbi dilində durğu işarələri. Bakı, Elm və təhsil. 179 s.
6. Əfəndizadə Ə. (1988). İki halda vergüldən istifadəyə dair. Nitq mədəniyyəti məsələləri, s. 66 – 76.
7. Şirəliyev M., Hüseynov M. (1945). Azərbaycan dilinin durğu işarələri. Bakı, Azərnəşr. 14 s.
8. Rəhimov A. (2008). Azərbaycan türkcəsi ədəbi dilində bütövləşmə və düzgün yazı qaydaları. Bakı, 215 s.
9. Məmmədli İ. (2014, 27 fevral). Durğu işarələrinin yazıda işlənməsi məqamları haqqında. "Azərbaycan" qəzeti. Bakı, 9 s.
10. Axundov A. (1992). Bir daha durğu işarələri haqqında. Dil və mədəniyyət. Bakı, s. 181 – 189.
11. Pələngov N. (2019). Müasir Azərbaycan dili punktuasiyasının bəzi problemləri. Bakı, 124 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2024, № 3 (281), 56–71
doi.org/10.48445/p8442-8805-1737-s

METODİKA

# Qrammatikanın kommunikativ tədrisinin psixo-linqvistik əsasları

***Nərminə Rəcəbova***
Müəllim, İngilis dili kafedrası (təbiət fakültələri üzrə), Bakı Dövlət Universiteti.
Azərbaycan. E-mail: narmina_87@yahoo.com
https://orcid.org/0000-0003-2558-5458

**XÜLASƏ**
Məqalədə qrammatikanın kommunikativ tədrisi, onun psixoloji və linqvistik əsaslarından bəhs olunur. Məlum olduğu kimi, müasir dövrdə xarici dil tədrisinin əsas məqsədi kommunikasiyadır. Qrammatikasız kommunikasiya isə, demək olar ki, mümkün deyil. Qrammatikanın kommunikativ tədrisi dedikdə, kommunikasiya məqsədilə ilə tədris edilən qrammatika nəzərdə tutulur. Tədqiqat işində qrammatikanın psixoloji və linqvistik əsaslarını müəyyən edərkən H. H. Klark, D. Nunan, J.R.Anderson, T. Payls və A. Con kimi görkəmli tədqiqatçıların araşdırmalarına istinad edilmişdir. Məqalədə qeyd edilir ki, ingilis dili qrammatikasının öyrənilməsi və özününküləşdirilməsinin psixoloji əsaslarına qavrama, diqqət, yaddaş, düşünmə, yaradıcı fəaliyyət və təsəvvür daxildir. Məlum olduğu kimi, ingilis dilinin müxtəlif variantları mövcuddur. Məqalədə bu variantlardan hansının tələbələrə tədris edilməli olduğu əsaslandırılmış və qrammatikanın tədrisinə verilən proqram tələbləri müəyyən edilmişdir.

**AÇAR SÖZLƏR**
qrammatikanın kommunikativ tədrisi, psixoloji əsaslar, linqvistik əsaslar, proqram tələbləri

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 11.07.2024
Qəbul edilib: 21.08.2024

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2024, NO. 3, VOL. 281, 56–71
doi.org/10.48445/p8442-8805-1737-s

**M E T H O D S**

# Psycho-Linguistic Bases of Communicative Teaching of the Grammar

***Narmina Rajabova***
Teacher, Department of English (for Natural Sciences), Baku State University. Azerbaijan. E-mail: narmina_87@yahoo.com
https://orcid.org/0000-0003-2558-5458

**ABSTRACT**
The article deals with the communicative teaching of grammar and its psychological and linguistic bases. As is known, nowaday the main goal of foreign language teaching is communication. Communication without grammar is almost impossible. Communicative teaching of grammar means teaching grammar for the purpose of communication. In the article for defining the psychological and linguistic bases of grammar researches of prominent scholars such as H. H. Clark, D. Nunan, J. R. Anderson, T. Pyles and A. John are explored. The research paper states that the psychological bases of learning and mastering English grammar include perception, attention, memory, thinking, creative activity and imagination. As it is known, there are different variants of the English language. In the article, it is justified which of these options should be taught to students and the program requirements for teaching grammar are defined.

**KEYWORDS**
communicative teaching of grammar, psychological bases, linguistic bases, program requirements

**ARTICLE HISTORY**
Received: 11.07.2024
Accepted: 21.08.2024

## Giriş

Bəzi tədqiqatçılar və metodistlər belə fikirləşirlər ki, qrammatika tədris edilməli deyil, o, təbii olaraq öyrənilir. Lakin digərləri bu fikirlə razılaşmırlar. Hər bir dilin kökü onun qrammatik sistemini yaradan ardıcıl modellər sistemidir. Bu, danışanlara yazıda və nitqdə onların kommunikasiya etmək arzularını ifadə edən müxtəlif növ söyləmlər yaratmağa imkan verir. Qrammatika dilin özülü olub, kommunikativ yanaşma vasitəsilə dəqiq və aydın tədris olunmalıdır. Kommunikativ qrammatika tədris edilərkən öncə onun psixoloji və linqvistik əsasları müəyyən edilməli, daha sonra proqram tələbləri nəzərə alınaraq həyata keçirilməlidir.

## Əsas hissə

### Qrammatikanın kommunikativ tədrisinin psixoloji əsasları

Kommunikativ qrammatikanın tədrisi qavrama (cognitivism) adlanan psixoloji yanaşmaya əsaslanır. Onun əsas prinsiplərinə görə, insan düşünməyi, çətinliklərin öhdəsindən gəlməyi bacaran və hər cür təhlükəni analiz, emal edən və məlumatı dinamik assimilyasiya edən şəxsdir. “Qavrama” əqli proses və ya qabiliyyət deməkdir ki, onun vasitəsilə də bilik əldə edilir [Leontyev A. Moskva, 2003].

H. H. Klarka görə isə dil anbarı beynin iki mühüm hissəsinin inteqrasiyası vasitəsilə əldə edilir: *söz anbarı* mərhələsi və *anlama* mərhələsi. Birinci mərhələdə söz formaları (tələffüz, vurğu, izah, cins, hecaların sayı, səs və hərf və s.) ehtiyat anbarında saxlanılır, digər mərhələdə isə sözlərin məna və obrazları uyğunlaşır [4, p. 60]. Anlamlar real həyatdakı situasiyalarda olduğu kimi, şəxslərin qarşılıqlı əlaqəsində mənalanır. Tələbələr dili kommunikativ məqsədlərlə istifadə etdikdə öz beyinlərində qrammatikanın, quruluş və situasiyaların obraz və anlamlarını real situasiyada istifadə etdikləri formada yaradırlar. Buna görə də qrammatikanı əzbərləmək vacib deyil, çünki əzbərləmək dilin nəzəri aspektinə aid olan birinci mərhələyə çatır. Məsələni praktikada və kommunikativ istəklə kontekstdə öyrənmək beyində bu iki mərhələnin inteqrasiya etməsinə kömək edir. Müəyyən qrammatikanı öyrənməyi təmin etmək üçün əlverişli şərait yaradılmalıdır. Bu, müəyyən vaxt tələb edir. Əgər tələbə yalnız birinci mərhələyə çatsa, demək, öyrənmə əldə edilməmişdir, çünki dili yadda saxlamaq kifayət deyil, bu iki mərhələni birləşdirmək üçün strategiya da tapılmalıdır. Element o zaman yadda saxlanılır ki, müəyyən bir vaxt ərzində və bir neçə müxtəlif kontekstlərdə tətbiq edilsin.

Öyrənmə fəaliyyəti üçün dildə inkubasiya prosesi yaradılmalıdır. Bu, tələbələrə qrammatikanı mənimsətmək üçün kontekstdə daimi praktika ilə təmin etməlidir. Tələbələr inkubasiya prosesində müəyyən bir modellə nə qədər çox işləyərlərsə, o qədər

də çox öyrənərlər.

D. Nunan bildirir ki, fəaliyyət tələbələrdə yaratdığı qavrama və yerinə yetirilmə funksiyasına görə dərəcələrə bölünür [5, p. 222]. Tədris ardıcıllığında aşağıdakı mərhələlər mümkündür ki, bu da tələbələrə irəliləyiş etmək üçün daha böyük öhdəliklər götürməyə imkan yaradır. Tələbələr sadə, başa düşülən çalışmalardan idarə edilən produktiv çalışmalara keçməli, nəhayət, real kommunikativ qarşılıqlı əlaqəyə girməlidirlər:

**A. Reseptiv**

1. Mətni oxu və ya dinlə – açıq cavab.
2. Mətni oxu və ya dinlə, şifahi yox, fiziki cavab ver (məs., tələbələr hər dəfə açar sözü eşitdikdə əl qaldırırlar).
3. Mətni oxu və dinlə, nə şifahi, nə də fiziki cavab ver (məs., hər dəfə açar sözü eşitdikdə qutuya və ya cədvələ işarə et).
4. Mətni oxu və dinlə, şifahi cavab ver (məs., açar sözləri eşidəndə onları ya təkrar et, ya da yaz).

**B. Produktiv**

1. İşarə edilmiş söyləmi, dialoq parçasını dinlə və təkrar et.
2. İşarəni dinlə, əvəzetməni və çevrilməni tamamla.
3. İşarəni dinlə (məs., sual) və mənalı cavab ver (tələbə üçün doğru olanı).

**C. İnteraktiv**

1. Simulyasiya (məs., insanların öz ailələri haqqında söhbətlərini dinləmək, rol kartları üzərində işləmək və ailənin digər üzvlərini tapmaq).
2. Müzakirə (məs., kiçik qruplarda tələbələr öz ailələri haqqında söhbət edirlər).
3. Problem həlli (məs., informasiya boşluğu tapşırığında uşaqlar üç qrupa bölünür; hər qrup tamamlanmayan ailə təsvirini dinləyir; tələbələr onları yenidən birləşdirir və ailə ağacını tamamlayır, şəkildəki alternativ nümayəndələrdən hansının ailə üzvü olduğunu müəyyən edirlər).

Bu ardıcıllıqda tələbələrdən tələblər getdikcə artır. İlkin mərhələlərdə bilik və bacarıqlar əldə edilir və təcrübədə həyata keçirilir, sonra isə kommunikativ məqsədlərdə daha geniş istifadə edilir.

Psixoloq və psixolinqvistləri maraqlandıran məsələlərdən biri də qrammatik qaydaların, cümlələrin hafizədə necə saxlanılması və onların mənimsənilməsində hansısa məhdudiyyətlərin olmasıdır. İnsanlar qrammatik qaydaları zəncirvari düzülüş kimi deyil, konkret, mənalı şəkildə yadda saxlayır və təsadüfi ardıcıllıq tez unudulan xarakter daşıyır. Sintaktik strukturlar və məna qrammatik qaydaların yadda saxlanılmasında böyük rol oynayır. Məsələn, qısa müddətdən sonra cümləyə qulaq

asan insan onun ümumi məzmununu təkrar etmək gücünə malik olur, baxmayaraq ki, bəzi strukturlar unudulur: başqa sözlə, insan yenicə eşitdiyini bəzən dərk etməyərək sözbəsöz xatırlaya bilər. Adətən, biz tezliklə mənanı tutur və sintaksisi unuduruq. Məna üçün mahiyyət daşımayan formalar hafizədə saxlanılmır. Cümlənin formal strukturu hafizədə çox qısa müddətə saxlanılır. Amma ifadənin məna ilə bağlı formasında kiçik dəyişmələr hiss olunur. Alınan nəticələr göstərir ki, qavrayış nəzəriyyəsinə uyğun olaraq, cümlənin mənası birinci söz zəncirindən aktiv şərh prosesinin köməyilə aşkarlanır. Qavranılan çıxış cümlələr tez unudulur, hafizədə cümlədə olan informasiya saxlanılır.

Cümlə sadə söz silsiləsi deyil, strukturlaşmış silsilədir və vahidlərin iyerarxiyasından ibarətdir.

Tədqiqatların nəticələri göstərir ki, "müxtəlif qrammatik əlamətli cümlələr – neqativ, passiv transformasiyalar vasitəsiz hafizədə cümlədən aralı müxtəlif cür kodlaşırlar". Belə nəticəyə gəlmək olar ki, insan dilin qrammatikası haqqında biliklərə uyğun eşidir və yadda saxlayır.

J. Anderson belə bir eksperiment aparmışdır [3, p. 333]:

Passiv cümlənin iki tipi:

1. *Gloves were made by tailors – Əlcəklər dərzi tərəfindən tikilib.*

2. *Gloves were made by hand – Əlcəklər əllə tikilib.*

Birinci cümlədə belə bir təsdiq var ki, dərzi əlcək düzəldir. İkinci cümlənin əsasında belə bir təsdiq var ki, kimsə əlcək düzəldir və bu əllə icra olunur.

Anderson resipientə kömək edərək sonuncu ismi (tailors) işlətməyi təklif etmişdir. O müəyyən etmişdir ki, subyektə uyğun gələn dərinlik strukturu (tailors) yadda saxlanılanın xatırlanmasına daha yaxşı kömək edir. "Hand" tipli isimlər – bu əsas dərinlik strukturuna daxil olmur və "by hand" ikinci dərəcəli üzvə aid olmaqla əsas struktura birləşmişdir. Başlanğıc isim olan "gloves" hər iki cümlədə eyni effekt doğurmaqla obyekt rolunu oynayır.

Cümlənin anlaşılması kontekstdən çox asılıdır, nəinki onun struktur quruluşundan, başqa sözlə, məlum qrammatik formanın mənimsənilməsindən danışmaq mücərrəd olaraq çətindir. Cümlələr situasiyalarda mənaları ifadə etmək üçün işlənir və dildə müxtəlif sintaksis vasitələr var ki, onlar da müxtəlif kommunikativ situasiyalar tələb edir. Passiv cümlələr anlama üçün çətin deyil, nəinki aktiv cümlələr, inkar cümlələr də təsdiq cümləyə nisbətən həmin mövqedə maraq doğurur. J. Uotson belə hesab edir ki, müəyyən kontekstdə inkar cümlələr təsdiqə nisbətən asan mənimsənilir. İnkarla əməliyyat aparmaq kontekstdə asandır. Məsələn, donuzun həşərat olmadığına yox demək vaxt tələb etmir.

Belə bir nəticəyə gəlmək olar ki, ingilis dilinin qrammatikasını öyrənmək və onu özününküləşdirmək üçün aşağıdakı psixoloji əsasların mühüm rolu vardır:

- qavrama,
- diqqət,
- yaddaş,
- fikirləşmə,
- yaradıcı fəaliyyət,
- təsəvvür.

Yeni qrammatik qaydanı başa düşmək üçün, ilk növbədə, onu qavramaq lazımdır. Bunun üçün isə yalnız qrammatik qaydaları əzbərləmək yox, onun mənasını başa düşmək də lazımdır.

İndiki davamedici zamana aid cümləyə diqqət yetirək:

*The child is sleeping. Do not make noise*.

Tələbələrə yalnız indiki davamedici zamanının *"to be+v+ing"* kimi düzəlməsini bilmək kifayət deyil. Tələbəyə həm də onun mənasını, yəni hərəkətin hal-hazırda da davam etdiyini bilməsi vacibdir.

Bu zaman tələbələrdən tələb olunan digər bir psixoloji halət onların diqqətli olmalarıdır. Əgər onların diqqəti təqdim olunan qrammatik qaydalarda və onun mənasında cəmlənə bilməsə, heç bir nəticə əldə edə bilməzlər.

Reseptiv və potensial informasiya eşidən tərəfindən subyektiv olaraq anlanılır, mövzudan asılı olaraq, qavrayışın şəraiti, məlum və naməlum qrammatikanın qarşılıqlı əlaqəsi və bir sıra mümkün hipotezalarla istifadə olunur.

Əvəzləyici dil vasitələri (əlavə sözlər, təkrar, ritorik suallar, sinonimik ifadələr, rabitəli sözlər) dil formalarını mürəkkəbləşdirmədən məlumatın uzunluğunu artırmaqla proqnozlaşdırma ehtimalının vaxt ehtiyatını artırır. Sürətli inteqrasiyanın vasitəsi olaraq onlar nitqi qavramağı və anlamağı asanlaşdırır.

Proqnozlaşdırmanın inkişafı tələbənin yalnız dil hazırlığı ilə deyil, həm də onun həyat təcrübəsi ilə, ana dilindəki vərdiş və bacarığı xarici dilə keçirməklə bağlıdır. Belə keyfiyyətlərə dinləmək və hər hansı kommunikasiya siqnallarına tez cavab vermək, məlumatın məzmununu sürətli tapmaq bacarıqları aiddir.

Qrammatik qaydaların dinlənilib-anlanılması hafizə fəaliyyəti ilə bağlıdır. Tələbələr mənimsədikləri qaydaları yadda saxlamalıdırlar. Bildiyimiz kimi, hafizə qısa müddətli və uzun müddətli olur. Qısa müddətli hafizə yeni informasiya üçün bilavasitə yaddaşdır, buna əks olan uzunmüddətli yaddaş informasiya anbarıdır, yeni olmayan, yəni əvvəllər əldə edilmiş informasiyanın xatırlanılmasında iştirak edir. Öncə onlar öyrəndikləri qrammatik qaydaları qısamüddətli hafizədə saxlayır,sonra isə həmin qram-

matik qaydalardan təkrar-təkrar istifadə edir və uzunmüddətli hafizəyə göndərirlər. Bu zaman isə tələbə bu qaydaları artıq beyninə həkk etmiş olur və uzun müddət yaddan çıxarmır, lazım gəldikdə yada sala və istifadə edə bilir. Artıq tələbələrdə bilik, bacarıq və vərdişlər formalaşır.

Qısamüddətli hafizə qavrayış proseslərinin bütün fazalarında daxil olan informasiyanı yadda saxlamağa, onun uzunmüddətli hafizəyə daxil olmasına və emalına şərait yaradır. Uzunmüddətli hafizə eşitmə artikulyasiyalı söz obrazlarını, söz birləşmələrini, sintaksis konstruksiyaları, qayda və sxemləri, onların biliklərini hafizədə saxlayır. Ona görə cümlələrin kommunikativ tipləri və frazanın strukturlarının anlanılması baş verir.

Əksər psixoloqlar hesab edirlər ki, qısamüddətli hafizənin formasiyasının unudulması interferensiyasının nəticəsi ola bilər – müəyyən qavrayış elementlərinin oxşarlığı ifadəsindən asılıdır. Qısamüddətli hafizənin xarakter əlamətləri uzunmüddətlidən onunla fərqlənir ki, onun üçün qavranılan materialın yaxınlığı vacibdir.

Qrammatikada qaydanın qavranılması prosesi hafizənin mərkəzləşmə səviyyəsindən asılıdır.

Fikirlərimizi ümumiləşdirərək qeyd etmək lazımdır ki, ingilis dilində birləşmələrin strukturu danışanlara birləşmələrin düzülməsində kömək edir. Bu da, öz növbəsində, qısa müddətli yaddaşın həcmində özünü göstərir.

Beyin travmasından əziyyət çəkən insanlarda idraki qabiliyyətlərin pozulması “aqrammatizm” adlanır. “Aqrammatizm” dedikdə, əsasən, funksiya sözlərin buraxılması nəzərdə tutulur. Bu cür sözlər semantik cəhətdən, eyni zamanda sintaktik təşkil olunması üçün çox vacibdir. Aqrammatizmin baş verməməsi nəinki qısa müddətli hafizəni tam tələb edir, eyni zamanda eyniləşdirmək, fərqləndirmək, əlaqə yaratmaq, sıralamaq və inteqrasiya etmək kimi bacarıqların iyerarxiyasını bilməyi tələb edir.

Tələbələrdə bilik, bacarıq və vərdişlər formalaşdıqdan sonra digər mərhələ – *yaradıcılıqdır*. Onlar öz təsəvvür və təxəyyüllərindən istifadə edərək heç bir nəzarət olmadan cümlələr və mətnlər yarada bilərlər.

Qrammatik biliklər əldə edildikdən sonra qrammatik bilik, bacarıq və vərdişləri formalaşdırmaq lazım gəlir.

Qrammatik vərdişlər müxtəlif növ nitq fəaliyyətinin komponentləri olub, bir-birindən nitq kommunikasiyasının növləri kimi fərqləndirilir. Qrammatik vərdişlər özünü nitqdə və yazıda göstərə bilər.

Danışmanın qrammatik vərdişi dedikdə, şifahi nitqdə stabil, düzgün və avtomatlaşmış, kommunikativ cəhətdən motivləşmiş qrammatik hadisələrin istifadəsi

nəzərdə tutulur. Dilin qrammatik vasitələrinə yiyələnmə dinamik nitq stereotip formalarına, onların mənaları ilə vahidliyə səslənmə və mənanın vahidliyinə əsaslanır. Qrammatik vərdişin əsas keyfiyyəti onun avtomatlaşması, qrammatik əməliyyatları yerinə yetirmədə tamlığı, situativ və kommunikativ şərtlənmə ilə müşayiət olunur. Şifahi nitqdə forma yaratma və sözlərin formal işlətməsinin avtomatlaşması nitqin *morfoloji vərdişləri* adlanır. Bu vərdişlərə şifahi nitqdə hal şəkilçiləri, cəm və cins şəkilçiləri, feilin şəxs sonluqları aiddir.

Morfoloji və sintaktik nitq vərdişləri yazılı nitqi mənimsəyərkən eyni mexanizmlərə malik olurlar, lakin onlara qrafik və orfoqrafik vərdişlər də əlavə etmək lazım gəlir.

Reseptiv nitq fəaliyyətinin növləri içərisində qrammatik vərdişlər *reseptiv qrammatik vərdişlər* adlanır. Bu vərdişlər morfoloji və sintaksis konstruksiyaların tanınması və anlanılmasının avtomatlaşdırılması deməkdir. Oxu, eşidib anlama zamanı istifadə olunan qrammatik vərdişlər *reseptiv-aktiv qrammatik vərdişlərdir*. Reseptiv-aktiv qrammatik vərdişlər görmə-qrafik və nitq motor obrazlarının rabitələrinə əsaslanır.

*Reseptiv-passiv qrammatik vərdişlər* mətndə qrammatik hadisələri tanıma və anlama hadisələrini əhatə edir, bu hal həmçinin özündə dilin qrammatik vərdişlərini ehtiva edir.

Qrammatik vərdiş və bacarıqların yaradılması psixoloji cəhətdən əqli hərəkətlərin mərhələlərdə formalaşdırılması ideyası ilə izah olunur.

İlkin olaraq qrammatik hadisələr mərhələlərlə təqdim olunur və bu vərdişlərin yaranması üçün əsas rol oynayır. Daha sonra ilkin əqli hərəkət daha yüksək fazaya daxil olaraq qrammatik vərdişləri şifahi nitqdə avtomatlaşdıraraq qrammatik nitq vərdişləri formalaşdırır. Yeni yaranmış vərdişlər müxtəlif nitq növlərinə daxil edilir və nitq bacarığı inkişaf etdirilir.

*Reproduktiv* qrammatik bacarıq və vərdişlər qrammatik hərəkətlərə yiyələnməyi nəzərdə tutur ki, onlarla da şifahi və yazılı formada fikri ifadə etmək mümkündür. Aktiv qrammatik materialın ardıcıl olaraq təlim materialları sırasına yerləşdirilməsi nitqin kommunikativliyinə kömək edir və reproduktiv qrammatik bacarıq və vərdişlər sırasında yer alır.

Xarici dildə nitqə yiyələnmək üçün əsas qrammatik bacarıqlar bunlardır:

1. Xarici nitqdə söz və söz birləşmələrini işlətmək üçün qrammatik hərəkətləri bir dildən digər dilə keçirmək bacarığı.
2. Düzgün qrammatik formanın seçilməsi bacarığı.
3. Qrammatik hadisəni düzgün işlətmək bacarığı.
4. Şüurlu tətbiqetmə və s.

Xarici dilə yiyələnmədə *tapşırıqlar* təlimin məzmunun əsas komponentlərindən biri

olub, xarici dili mənimsəmək üçün vərdişlərin yaradılmasında mühüm rol oynayır.

Nitq və dil tapşırıqları "vərdiş-bacarıq" xətti ilə qarşı-qarşıya da qoyula bilir. Aşağı səviyyəli tapşırıqlar vərdişlərin yaradılmasına, yuxarı səviyyəli tapşırıqlar isə nitq bacarıqlarının inkişaf etdirilməsinə xidmət edir. Nitq tapşırığı konkret dil materialına istiqamətlənməlidir ki, o da xarici dili dərinliklə mənimsəməyə kömək etsin.

Göründüyü kimi, qrammatikanın tədrisinin psixoloji əsasları mürəkkəb bir prosesdir. Tədris işi ilə məşğul olan müəllim bu əsasları bilməli, bunları öz işində nəzərə almalı və tətbiq etməlidir. Müəllimlərdən tələb olunan əsas iş də, elə məhz budur.

**Qrammatikanın tədrisinin linqvistik əsasları**

Qrammatikanın tədrisinin psixoloji əsasları olduğu kimi, linqvistik əsasları da mövcuddur. XIX əsrin sonu XX əsrin əvvəllərində müasir linqvistikanın inkişafı dilin təbiətinin başa düşülməsində, eyni zamanda inşa yazılışını tədris etmək üçün daha səmərəli yollar axtarılmasında mühüm rol oynamışdır. Əvvəllər çox az sayda müəllim dilin quruluşunun linqvistik nəzəriyyəsini qrammatikanın təliminə tətbiq edirdi. Müəllim hazırlığı proqramında linqvistikanın vacibliyi günü-gündən artırdı. Bu ingilis dili jurnallarında və ingilis dili ilə bağlı təşkil edilmiş konfranslarda özünü göstərirdi.

Həyatın həqiqəti ondan ibarətdir ki, insanların əhəmiyyətli hissəsi kommunikasiyanın standart ingilis dilində olmasını gözləyirlər. Beləliklə, standart ingilis dili qaydalarının tədrisinin əsas məqsədi tələb edilən situasiyalarda tələbələrə nitqdən lazımi qaydada istifadə etmələrini öyrətməkdir.

Bundan başqa, qaydaları öz tarixi və sosial kontekstində təqdim etmək tələbə və müəllimlərdə maraq oyadır: biz qaydaların dildə necə təqdim edildiyini görə bilərik; onların bəzilərinin necə kəmağıl olduqlarını görə bilərik (faktiki olaraq, bu qaydaların yumoristik təqdimi maraq oyada bilər); öyrənildikdən sonra lazım olanda istifadə edə bilərik. Bununla əlaqədar olaraq, Sterlinq Leonard XVIII əsrdə müxtəlif qrammatik və istifadə qaydalarının siyahısını hazırlamışdır.

Müdafiə etdiyimiz fikri əsaslandırmaq üçün gələcək zaman formasını düzəldən "shall / will" qaydasına diqqət yetirək. Payls və Algeoya görə "will" II və III şəxsin emosiyasız formasını yaratmaq üçün istifadə olunduğu halda, "shall" I şəxs formasını düzəldir və "nəzərə çarpdırma", "arzu" və ya "israr" bildirir, bu isə onun mənasının tam əksidir ("will" I şəxs, "shall" digər şəxslər üçün) [6, p. 342]. Hal-hazırda isə ingilis dilində istifadə faktiki olaraq belə deyil. Tarixən gələcək zamanı bildirən feillər "arzu", "istək" (will), "öhdəçilik" (shall) bildirmişdir. Lakin müasir dövrdə bu formalar tamamilə dəyişmiş, müasir amerikan dilində "shall" istifadədən çıxmış, artıq gələcək zamanın bütün şəxsləri "will" ilə düzəlir. Buna görə də bu qaydanı 200 il əvvəldə olduğu kimi tədris etmək doğru olmaz.

Digər bir misala nəzər yetirək: İkiqat inkarlıqdan, demək olar ki, ingilis dilinin bütün tarixi dövrlərində istifadə olunmuşdur (Şekspirin "Man delights not me: no, nor woman, neither". Hamlet, Act 2, Scene 3). Bu qadağanı belə əsaslandırırdılar ki, iki inkarlıq bir-birini dəf edir və ya iki inkarlıq bir təsdiqə bərabərdir. Hal-hazırda müasir ingilis dilinin bir çox dialektlərində ikiqat inkarlıqdan istifadə olunur. Eyni zamanda müasir ingilis dilində kommunikasiya zamanı ikili inkarlıq işlənir.

Müəllim tələbələrə standart ingilis dilinin qrammatikasını və sözlərdən istifadəni tədris etməlidir, hətta onların bir çoxu danışıq standartlarında istifadə olunub, yazılı standartlarda istifadə olunmasa da. Bəzi müəlliflər "qəbul edilmiş" standart variantından da danışırlar. Lakin digər dialektlərin – onların necə inkişaf etmələrinin, hansı cəhətlərin standartlara uyğun seçilməsini öyrənməyin də üstün cəhətləri vardır. Bundan sonra tələbə və müəllimlər digər dialektlərə qarşı münasibətdə daha ehtiyatlı olur və tədris planını daha yaxşı mənimsəyirlər.

Qrammatikanın linqvistik əsasını təşkil edən əsas məsələlərdən biri də dilə qabillik və dil fəallığı problemidir. Dilə qabillik linqvistika sahəsinə, dil fəallığı isə psixologiyaya aiddir. Dilə qabillik birbaşa dillə əlaqədardır və məlum dildə danışanın bacarığı nəzərdə tutulur. Dil aktivliyi, əslində, dil daşıyıcısının dil istehsal etməsini nəzərdə tutur.

Hər şeydən əvvəl, qrammatika tələbələrin əldə etmək istədikləri biliyin bir hissəsi kimi vacibdir. Bu, ilk növbədə, doğma dil daşıyıcılarının biliyinə uyğun olan, müəllimin istifadə etmək istədiyi proqramda, ikincisi, öyrənmə prosesi ilə əlaqədar olan elementləri təqdim etmənin ardıcıllığında, üçüncüsü, müəllimin tətbiq etdiyi sinif texnikasında öz əksini tapır. Hətta dil tədrisinin məqsədi kommunikasiya ilə məhdudlaşsa belə, qrammatika bu mərhələlərdə müəyyən rol oynayır; tətbiqi linqvistlər müasir qrammatik nəzəriyyələrin onların hər biri ilə əlaqəsini nəzərə almalıdırlar.

**Qrammatikaya verilən proqram tələbləri**

Son 25 ildə kommunikativ tapşırıqlar tədris proqramının hazırlanmasında, inkişafında, həyata keçirilməsində və qiymətləndirilməsində xüsusi əhəmiyyət kəsb edir. Kommunikativ qrammatikanın tədrisi zamanı proqramın mövzusu və təlim prosesi dərsdən kənarda da dildən istifadə etmək üçün lazım olan materialların tədris edilməsini şərtləndirir. Dilə bu cür yanaşma aşağıdakı xüsusiyyətlərlə xarakterizə olunur:

1. Kommunikasiyanı tədris olunan xarici dildə həyata keçirmək.
2. Öyrənmə situasiyaları üçün real mətnlər təqdim etmək.
3. Diqqəti nəinki dil materiallarında cəmləşdirməyə, eyni zamanda öyrənmə prosesinin özünə də yönəltməyə imkan yaratmaq.

4. Öyrənmə üçün tələbələrin şəxsi təcrübələrindən istifadə etmək.
5. Dildən sinifdə və sinifdənkənar öyrənmə arasında əlaqə yaratmağa cəhd göstərmək.

Pedaqoji tapşırığın mərkəzi element kimi əhəmiyyətinin artması proqram tərtibçiləri və metodistlər arasında mübahisələrə səbəb olur. Proqram tərtibçiləri məzmunun seçilməsi və dərəcələrə uyğun bölünməsini, metodistlər isə tapşırıqların, çalışmaların və siniflə əlaqədar olan digər fəaliyyət növlərinin seçilməsini əsas götürürlər. Metaforik desək, proqram tərtibçiləri təyinetmə, metodistlər isə onun yolu ilə maraqlanırlar.

Dilin təbiəti və onun öyrənilməsi təhsil sahəsində aparıcı cərəyan idi. Tədqiqatçılar tərəfindən onun yüksəldilməsi proqram tərtibçiləri, material yazanları empirik əsaslarla təmin etdi. Digər metodlarda empirik əsasların olmaması tənqidlərin artmasına səbəb oldu [2, p. 275].

**Empirik əsaslar**

Çalışmaya əsaslanan dil tədrisinin konseptual əsasları güclü empirik ənənələr ilə müdafiə olunur. Bu onları digər pedaqoji yanaşmalardan fərqləndirir.

Tapşırıqların məqsədi proqram planlaşdıranları və material yazanları tapşırıq və proqram arasında aydın əlaqə ilə təmin etməkdir. Məqsədləri tələbələrin sinifdən kənarda da dildən istifadə etməsi kimi sahələrə qarşı çıxmaqdır.

Tipik məqsədlərə aşağıdakılar aiddir:

1. Akademik təhsildə iştirak etmək üçün lazımi bacarıqları inkişaf etdirmək.
2. Bacarıqsız işçidən bacarıqlı nəzarətçiyə çevrilmək üçün lazımi şifahi və yazılı bilik, bacarıqlar əldə etmək.
3. Tədris olunan dildə sosial kommunikasiya yaratmaq.
4. Tədris olunan dilin mədəniyyətini və ədəbiyyatını məhz həmin dildə oxumaq.

Ardıcıl, rabitəli proqramın inkişaf etməsinin vacibliyinə baxmayaraq, digər sahələrlə müqayisədə tədqiqatçılar bu məqsədləri ədəbiyyatda tapmağa çətinlik çəkirdilər. Biz bunun Andersonun tədqiqatlarında öz aydın əksini tapdığını görə bilərik [3, p. 333]. Çox sayda müsahibələrə əsaslanan Anderson bildirirdi ki, tələbələrin kommunikativ ehtiyaclarını əks etdirən və məqsədləri aydın olan proqramlar ardıcıl olmayan, tələbələrin kommunikativ ehtiyaclarını ödəməyən proqramlara nisbətən daha çox həqiqətə uyğundur. Lakin təcrübi olaraq hələ ardıcıl, aydın məqsədi olan proqramların praktik və effektiv nəticələri sübut edilməmişdi.

Tədqiqatların əksəriyyəti Kraşenin hipotezalarına əsaslanmışdır. O bildirir ki, tələbə nə qədər çox xarici dil mühitində olsa, o həmin dili daha yaxşı mənimsəyər. Bunun üçün isə müəllim çalışmalıdır ki, sinifdə xarici dil mühiti yaratsın. Əsas məsələ hansı

növ çalışmalardan istifadə olunma və onun həcminin müəyyən edilməsidir. Əgər bu tədqiqatların nəticəsi sağlamdırsa, növbəti mərhələdə onun metodik olaraq necə tədris edilməsini müəyyən etmək lazımdır.

Kommunikativ yanaşmasının qəbulu kommunikativ proqramın qəbulu deməkdir. Kursun məqsədini və tələbələrin ehtiyaclarını ödəmək üçün müəllim hansı dərslik, material və proqramdan istifadə etməyə qərar verməlidir.

**Praktik təkliflər**

Nəzəri izahlar sinifdə verilir ki, tələbələr kommunikasiyayadək tapşırıqları evdə həll edə bilsinlər. Bu, bacarıqları inkişaf etdirməkdən daha çox vaxt tələb edir. Lakin bu, heç də o demək deyil ki, nəzəri materiala həddən artıq vaxt ayrılmalıdır. Məsələn, 90 dəqiqəlik dərsin 15 – 20 dəqiqəsi nəzəriyyəyə, qalan vaxt isə bu nəzəriyyəyə aid kommunikativ fəaliyyətə həsr olunmalıdır.

1. Müəllim yeni dərsi təqdim edərkən mahnı, dialoq, maqnitafon, video, qəzet, jurnal və bir çox başqa şifahi və yazılı materiallardan istifadə edə bilər.
2. Çalışmalar təqdim olunan mövzu və materiallara uyğun planlaşdırılmalıdır. Qrammatik qaydaları planlaşdırmaq çətin olmasa da, kommunikativ fəaliyyəti planlaşdırmaq mürəkkəb prosesdir. Bunun üçün mövzuya uyğun kontekst və situasiya seçilməlidir. Bu proqrama kommunikativ funksiyanı həyata keçirən birləşmələr də aid edilməlidir. Məsələn, məsləhət funksiyanı bildirmək üçün "should" və "must"dan, arzu və istəkləri bildirmək üçün isə "wish" və "could"dan istifadə etmək mümkündür.
3. Digər məsləhət görülən tapşırıqlar isə inşa, dialoq, məruzə, müxtəlif məqalələrə xülasə yazmaqdır.
4. Tələbələr qrammatik qaydaları mənimsəmək üçün həm fərdi, həm qrup, həm də kollektiv formada işləməlidirlər. Müəllimin işi isə yalnız nəzarət etməkdir.
5. Müəllim tələbələrə xarici dili tədris edərkən öyrənmə strategiyalarının vacibliyini izah etməli və tələbələrin öz strategiyalarını inkişaf etdirməli olduqlarını bildirməlidir.
6. Əksər qrammatik mətnlər kommunikasiyayadək tapşırıqlardan ibarətdir. Buna görə də müxtəlif kitablardan, kommunikativ tapşırıqlardan da istifadə etmək lazımdır.
7. Qrammatik qaydalar şifahi olduğu kimi, yazılı da inkişaf etdirilməli və qiymətləndirilməlidir. Sinifdə dörd bilik və bacarıqlardan istifadə edildiyindən imtahanda da bu nəzərə alınmalıdır.
8. Qiymətləndirmənin fərqli olması məqsədəuyğundur. Əgər çoxcavablı testlərdən istifadə edilibsə, onda nəinki quruluşlar, eyni zamanda kommunikativ funksiyalar

da əlavə edilməlidir. Bu qaydalar təcrid olunmuş cümlələrdə deyil, kontekstdə təqdim olunmalıdır.

Göründüyü kimi, kommunikativ qrammatika daha böyük prinsiplərə əsaslanır. İnsanlar dildən kommunikasiya və qarşılıqlı əlaqə saxlamaq üçün bir vasitə kimi istifadə edirlər.

Oyunlar, çalışmalar, krossvordlar və s. dilin tədrisində köməkçi vasitələr kimi təklif edilmişdir. Bu gün internetlə əlaqə kommunikativ imkanları daha da genişləndirir.

İngilis dilini kommunikativ dil kimi tədris edən xarici dil müəllimləri proqram tərtibində beş əsas komponenti müəyyənləşdirmişlər. Bu komponentlər kommunikativ kompetensiyanın inkişafına köməklik göstərir. Öyrənmə fəaliyyətinin aşağıdakı komponentlərdən təşkil edilməsi daha çox proqram planlaşdırma işini yüngülləşdirir və tələbə xeyrinə əlaqə yaratmaq yollarını təklif edir. Proqrama aşağıdakılar daxildir:

1. Dil məşğələsi.
2. Məqsəd üçün dil.
3. Mənim dilim mənəm: şəxsi ikinci dil istifadəsi.
4. Teatr məşğələsi.
5. Sinifdən kənar.

*Dil məşğələsi* siyahının birinci komponentidir. Bu məşğələlərə dildən düzgün istifadə üçün lazım olan tapşırıqlar aiddir. İkinci və ya xarici dil proqramında dil məşğələlərinə sintaksis, morfologiya və fonetika aid edilir. Əgər yazı məqsəd kimi götürülərsə, tələffüz testləri vacib hesab edilə bilər. Əgər diqqət sözün formasına yönəlibsə, tərcümə, imla və ya sözün kökünün əzbərlənməsi daha yaxşı fayda verə bilər. Lüğət fondu isə sözlərin izahı, sinonim və antonimlərlə möhkəmləndirilə bilər. Hər yaşda olan tələbələr üçün müxtəlif oyunlar və ya qrupda birgə fəaliyyət maraqlı ola bilər.

*Məqsəd üçün dil* və ya *dil təcrübəsi* ikinci komponentdir. Birincidən fərqli olaraq, dil təcrübəsi dildən real kommunikativ məqsədlər üçün istifadə edir. Heç də bütün öyrənənlər dili eyni məqsədlə öyrənmirlər. Vacib məsələlərdən biri də odur ki, müəllim tələbələrin xüsusi ehtiyaclarını nəzərə alsın. Tələbələr öyrəndiklərini tez tətbiq etmək istəyirlər. Bunun üçün isə dil mühiti lazımdır. Buna görə də müəllim sinifdə o mühiti yaratmalıdır. Tarix, musiqi və ya ədəbiyyat xarici dildə tədris edilə bilər.

Kommunikativ proqramın üçüncü komponenti olan *mənim dilim elə mənəm*: *şəxsi ikinci dil* yeni dildə özünü ifadə etmək deməkdir. Münasibət, şübhəsiz, tələbənin uğurunda ən vacib faktordur. Ən uğurlu proqramlar tələbələrin həvəsləri ilə bərabər, dil öyrənməsinin idraki aspektlərini nəzərə alan və onları həm psixoloji, həm də intellektual cəlb edən proqramlardır.

Kommunikativ dil tədrisini planlaşdırarkən müəllimlər yadda saxlamalıdırlar ki, heç də hamı eyni rolda özünü rahat hiss etmir. Cəmiyyətdə olduğu kimi, sinifdə də bəziləri rəhbər, bəziləri isə tabe olmağı xoşlayırlar. Qrup diskussiyalarında az sayda tələbələr danışıqlarda iştirak edir. Qrup fəaliyyətində sakit olmağı xoşlayanlar, cüt birləşmələrdə daha fəal olur, və ya tək – individual layihələrdə daha yaxşı iştirak edirlər. Kommunikativ çalışmalar nə qədər çox və müxtəlif olarsa, o qədər də çox tələbə cəlb etmək olar.

"Mənim dilim mənəm" daha çox özünü ifadə etməyi nəzərdə tutur. Baxmayaraq ki, dil məşğələləri diqqəti formaya yönəldir, şəxsi ikinci dil isə yox. Bir çox müəllimlər bunu bilir və buna görə diqqəti mənaya yönəldirlər. İfadəetmə, mənaları birləşdirmə imkanlarının vacibliyinin başa düşülməsi dil məşğələləri və "mənim dilim mənəm" arasında fərqlərdə görünür.

Tələbələrə xarici dildə təkcə istədiklərini demək imkanları vermək azdır, onlara eyni zamanda xarici dildə öz şəxsiyyətlərini inkişaf etdirmək imkanları da yaradılmalıdır. Onlar xarici dildə formal danışıq yox, təbii danışığı öyrənməlidirlər. Soruşanda ki, ingilis dilində yazmaq nə deməkdir, koreyalı yazıçı Mia Yun "Küləklər evi" əsərində (1998) buna belə cavab verir: "İngilis dilində yazmaq təzə paltar geyinmək kimi bir şeydir". Xarici dildə – ingilis dilində yazmaq insanı gümrah, özünü yeni yolda hiss etdirir. "Mənim dilim mənəm" individual şəxsiyyətə münasibəti nəzərdə tutur.

*Teatr məşğələsi* kommunikativ proqramın dördüncü komponentidir. Şekspirin sözləri ilə desək, "bütün dünya bir pəncərədir". Səhnədə müxtəlif rollar oynayırıq. Uşaq, işçi, valideyn, həkim, müəllim və s. dərs vaxtı oynadığımız obrazlardır. Eyni obrazlar hər dəfə fərqli formada oynanılır. Yeni və tanış olmayan rollar təcrübə tələb edir. Bəzən heç nümunə də olmur. XX əsrin ikinci yarısında qadınlar özlərini "kişilərin dünyasında" professor, dövlət başçısı kimi görəndə mövcud olan kişi nümunələrini təkmilləşdirdilər və özlərinə müvafiq yer – model hazırladılar. Bu yerdəyişmə hələ də tamamlanmayıb. Qadınlar dünya əhalisinin 50 %-ni təşkil etsələr də, bəzi sahələrdə onların fəaliyyəti məhduddur. Kişilər də qadınların yerində evdarlıq, katibə və ya dayə kimi rollarda olurlar.

Əgər dünyanı aktyor və aktrisaların ən yaxşı oynadıqları bir səhnə təsəvvür etsək, onda rolları ifa etmək üçün təcrübələr imkanı artar. Fantaziya və rol ifası uşaqlığın təbii və vacib hissəsidir. Dildən istifadə, rolları ifa etmək dili öyrənməyin təbii komponentlərindəndir. Teatr məşğələləri tələbələri onlara ehtiyac olan alətlərlə təmin edir. Bu fəaliyyət növünə həm yazılmış, həm də yazılmamış rollar, hətta pantomina ki-

mi fəaliyyət növləri aiddir. Burada müəllimin rolu yalnız hakimlikdir: tələbələri müdafiə edib strategiya ilə təmin etmək, onları həvəsləndirmək və yeni yollar açmaq.

*Sinifdən kənarda* dildən istifadə etmək beşinci və sonuncu komponentdir. Sinifdə müxtəlif kommunikativ fəaliyyət növlərinin həyata keçirilməsi onların sinifdənkənar dünyada dildən istifadə etmək məqsədini reallaşdırır. Sinif yalnız repitisiyadır. Kommunikativ proqramda dildən sinifdən kənarda da istifadə etmək tələbələrin maraq və ehtiyaclarını bilmək ilə başlayır. Sinif yalnız təlimatlar verilən məhkəmə zalına, ictimai yerə bənzəyir. Tələbələrdən bəziləri şəhərdə ev sahibləri rolunu oynayır, digərləri isə xarici qonaq rolundadırlar. Ev sahibləri qonaqlara tarixi hadisələr, siyasət, tibb sahəsi və s. haqqında məlumat verirlər. Radio, televiziya proqramları, filmlər, qəzetlər və jurnallar istifadə üçün çox yararlıdır. Müasir dövrümüzdə isə internetlə bütün dünya ilə əlaqə saxlamaq və bundan tədris zamanı bacarıqla istifadə etmək olar.

**Nəticə**

Məqalədə müxtəlif alim və metodistlərin tədqiqatlarından istifadə olunaraq qrammatikanın tədrisinin psixoloji və linqvistik əsasları müəyyən edilmişdir. Aparılmış araşdırmalara əsasən müəyyən edilmişdir ki, qrammatik qaydalar sadədən mürəkkəbə doğru yaddaşda saxlanılır. Kommunikasiya zamanı qrammatik qayda qavrama, diqqət, yaddaş, fikirləşmə, yaradıcı fəaliyyət və təsəvvür kimi mərhələlərdən keçərək reallaşır. Tədqiqat işində "aqrammatizm" adlanan psixoloji pozuntudan bəhs edilmiş və onu aradan qaldırmağın mümkünlüyü müəyyən edilmişdir. Məqalədə kommunikativ qrammatikaya verilən proqram tələbinin empirik və praktik əsasları tədqiq edilmişdir. Araşdırmalar göstərir ki, ilkin mərhələdə qrammatikasız kommunikasiya mövcud olsa da fikrini daha dəqiq, səlis və aydın ifadə etmək üçün qrammatikanın müstəsna əhəmiyyəti vardır.

**İstifadə edilmiş ədəbiyyat**

1. Leontyev A. (2003). Osnovy psikholingvistiki. Moskva, 115 s.
2. Allwright R. (2002). Language learning through communication practice. ELT Documents 76, London, British Council. 275 p.
3. Anderson J. (1985). Cognitive psychology and its implications. 2nd ed. New York, W. H. Freeman and Co. 333 p.
4. Clark H., & Clark E. V. (1977). Psychology and Language: An Introduction to Linguistics. United States, Harcourt Brace Jahonovich Inc. 608 p.
5. David N. (1999). Second Language Teaching and Learning. Heinle and Heinle publishers. 222 p.
6. Pyles T., & John A. (1982). The Origins and Development of the English Language. 3rd ed. NY, Harcourt, Brace, Jovanich. 342 p.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2024, № 3 (281), 72–81
doi.org/10.48445/t0587-3795-4249-z

QRAMMATİKA

# Media xəbər diskursunda endoforik proformlar

***Mehriban Mönsümova***
Baş müəllim, Azərbaycan Dövlət Bədən Tərbiyəsi və İdman Akademiyası.
Azərbaycan. E-mail: mehriban_m86@mail.ru
https://orcid.org/0000-0001-6527-6874

**XÜLASƏ**
Dilimizdə "əvəzliklər" adlandırdığımız proformlar, media xəbər mətnlərinin daxilində qrammatik koheziya vasitəsi olaraq əlaqəlilik yaratmaqla bərabər, operativ və ən kiçik jurnalistika janrının müəyyən özəlliklərinə uyğunluğu nöqteyi-nəzərindən aktualdırlar. Lakin əvəz etdiyi referensə görə, yerləşmə mövqeyindən asılı olaraq, anafora və katafora adlandırılan endoforik proformların media xəbər mətnlərində aktuallığı eyni dərəcədə deyil. Bu da anafora ilə kataforanın malik olduqları fərqli xüsusiyyətlərindən irəli gəlir. Məqalənin məqsədi anafora ilə kataforanın media xəbər diskursunda mövqelərini müşahidə edərək onları əlaqəlilik vasitəsi kimi və xəbər janrının xüsusiyyətlərinə uyğunluğu baxımından özəlliklərini araşdırmaqdır.

**AÇAR SÖZLƏR**
anafora, katafora, koheziya, xəbər diskursu

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 16.07.2024
Qəbul edilib: 27.08.2024

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2024, NO. 3, VOL. 281, 72–81
doi.org/10.48445/t0587-3795-4249-z

GRAMMAR

# Endophoric Proforms in Media News Discourse

***Mehriban Monsumova***
Head teacher, Azerbaijan State Academy of Physical Education and Sports. Azerbaijan.
E-mail: mehriban_m86@mail.ru
https://orcid.org/0000-0001-6527-6874

**ABSTRACT**
Proforms, which we call "pronouns", are very relevant from the point of view of compliance with certain features of the operative and smallest journalistic genre, as well as creating coherence as a means of grammatical cohesion within media news texts. However, endophoric proforms called anaphora and cataphora, depending on the position of the reference they replace, are not equally relevant in media news texts. This is due to the different characteristics of anaphora and cataphora. The aim of our article is to observe the positions of anaphora and cataphora in the media news discourse and examine their features as a means of coherency and their compatibility with the features of the news genre.

**KEYWORDS**
anaphora, cataphora, cohesion, news discourse

**ARTICLE HISTORY**
Received: 16.07.2024
Accepted: 27.08.2024

**Giriş**

Media xəbər diskursunda həm ekzoforik, həm də endoforik əlaqəliliyə rast gəlinir. Nəzərə alsaq ki, xəbərlər, adətən, qabaqcadan mətn halına salınıb sonra yayılır, bu janrda endoforik əlaqəlilik üstünlük təşkil edir. Video material yazı (VMY) daxilində "stand-up"lar, birbaşa bağlantılar və ya müsahibə zamanı endoforik əlaqə ilə bərabər ekzoforik əlaqəyə də rast gəlmək mümkündür. Çünki ekzoforik referens xəbər materialına dil vasitəsi ilə deyil, vizual (məsələn, jest ilə və ya kameranın çəkdiyi obyekt göstərilərək "İzdihamın başladığı *o* istiqamətdə..."), bəzən də audio (məsələn, reperaund eşidilir və "İnsanların səsləndirdikləri *bu* şüar...") kanallar vasitəsilə daxil olur. Bununla belə, tədqiqatın obyekti qrammatik koheziya olaraq mətndaxili əlaqəlilik yaradan əvəzliklərdir. Onlar, mətn daxilində özündən əvvəl və sonra gələn söz və ya sözləri əvəz etməsindən asılı olaraq, anafora və katafora adlandırılan iki hissəyə bölünürlər. Ekzoforaya isə, ümumiyyətlə, anafora və katafora kimi koheziya vasitələri xas deyil.

**Əsas hissə**

Qrammatik koheziya vasitələrindən biri olan proformlar konkret olan referensləri daha ümumi olan əvəzliklərlə ifadə edir. Çünki əvəzlikləri digər nitq hissələrindən fərqləndirən xüsusiyyət onun "daha çox ümumilik bildirən nitq hissəsi" olmasıdır [2, s. 263]. Əvəzliklər referenti dəqiq ifadə etmədiyinə görə yalnız kommunikativ situasiya onu referentlə əlaqələndirir.

Digər nitq hissələrindən fərqli olaraq, az sözdən ibarət olan əvəzliklər işlənmə tezliyinə görə digər nitq hissələrini üstələyir. Nitqdə digər nitq hissələrindən daha artıq işlənməsi onların vacib funksiya daşımasından irəli gəlir [7, s. 282]. Belə ki, əvəzliklər nitqdə həm ekzoforik, həm də endoforik əlaqəlilik funksiyası daşıyır. Əksər əvəzliklər mətndən kənar referentlərə istinad edirlər. Belə olduqda, referent mətnə əvəzliklə daxil edilir. Lakin mətndaxili əlaqəlilik yaradan əvəzliklər də var ki, onlar mətndaxili referensə istinad edirlər. Məsələn, "Aliyə tapşırığı tək edir, çünki mən ona kömək edə bilmədim". Burada "mən" əvəzliyi mətnxarici obyektə, "o" ("ona") əvəzliyi isə mətndaxili obyektə istinad edir. Mətndaxili əlaqəlilik yaradan əvəzliklər, əvəz etdiyi sözdən öndə və ya sonra gəlməsindən asılı olaraq, ya anafora, ya da katafora olurlar [3, s. 65 – 70].

Belə ki, qədim yunan dilində "yuxarı aparmaq" mənasını ifadə edən anafora ("ἀνά" + "φορά") özündən əvvəlki referensi, "aşağı aparmaq" mənasını ifadə edən katafora ("κατα" + "φορά") isə özündən sonrakı referensi əvəz edir. Əvəzlikdən öndə gəlib əvəz edilən referensə *antesedent*, əvəzlikdən sonra gəlib əvəz edilən referensə isə *postsedent*

deyilir. Deməli, əvəzlik özündən əvvəlki referensi əvəz edərsə, *anafora*, sonrakı referensi əvəz edərsə, *katafora* olur. Y. Kutinova öz tədqiqatında anaforanın predikasiyaya işarə etdiyini, kataforanın isə izahedici əlaqə ilə oxşarlıqlar daşıdığı qənaətindədir [8, s. 180]. Beləliklə, endaforada proformlar özündən əvvəl (antesedent) və sonra (postsedent) işlənən leksemlərin daha qısa elementlərlə əvəzlənməsidir [Lyu J., Yun J., Finer D. 2021].

Real həyatdakı obyektlərə işarə edərək, onları əvəz edən ekzoforik proformlardan fərqli olaraq, endoforada əvəzliklər real həyatdakı obyektə deyil, nitqdəki referensi nişanlayırlar. Referens isə, öz növbəsində, referenti ifadə etdiyindən, əvəzliyin də ilk mənbəsi referent olur.

əvəzlik → referens → referent

Ona görə də anafora / katafora antesedent / postsedent ilə birlikdə eyni referentə istinad edərək bir-birlərinə koreferent olurlar [4, s. 94]; [6, s. 332]. Bununla belə, mətn daxilində referens olmasa, əvəzliyin ilkin mənbəsi aydın olmaz. Deməli, media xəbər diskursunda referens istər antesedent, istərsə də postsedent olsun, əvəzliklə nisbətdə əsas informasiya daşıyıcısı olaraq çıxış edir.

Lakin anafora birbaşa referensə istinad etsə də, özündə referentlə əlaqədər mətndə ona (anaforaya) qədər deyilmiş (yazılmış) bütün informasiyaları nəzərdə tutur. Yəni anafora mətndə özünə qədər deyilmiş nəinki referensi, həm də digər bütün əlaqəli məlumatları daşıyır. Anafora bir sözdə çox informasiyanın cəmlənməsidir. Fərq ondadır ki, onun daşıdığı informasiya yükü, əlbəttə ki, yeni deyil, yalnız verilmiş məlumatların bir sözdə toplanmış təkrarıdır. Yuxarıdakı misal cümləmizin "mən ona kömək edə bilmədim" hissəsində "ona" anaforası altında "Aliyə" antesedentinə işarə edərək, həm də onun "tapşırığı tək edir" informasiyasını nəzərdə tutur. Yəni "mən ona (tapşırığı tək edən Aliyəyə) kömək edə bilmədim". Deməli, əvəzlik antesedentlə əlaqəlilik yaratmaqla bərabər, mətndə özünə qədər antesedent barədə verilmiş bütün informasiyaları onun əlaməti olaraq bir topladığından həm də bütün bu referensləri özü ilə bağlayır. Anaforadan sonra gələn informasiya (anaforalı cümlədə) antesedentlə əlaqələnir. Bu əlaqəliliyi isə ortada dayanan anafora yaradır.




Şəkil 1.

Media xəbər diskursunda da anaforanın bu xüsusiyyəti formal təkrarçılığa yol vermədən yeni informasiyanın hissə-hissə mətnə daxil edilməsinə və bu hissələr arasında əlaqəliliyin itməməsinə kömək edir. Bu xüsusiyyət fikri sadələşdirərək hər hissədə bir yeni fakt prinsipinə əsaslanan jurnalistikanın xəbər janrının özəlliyi ilə uyğunlaşır. Əvəzliklər, əvəz etdikləri söz və söz birləşmələrindən kiçik olduğundan, xəbər mətnlərinin də həcminin qısaldılmasına imkan verir [1, s. 208]. Anafora cümlələri daha qısa etməklə mətndə oxucu və ya dinləyicilər tərəfindən materialın anlama prosesini sadələşdirməklə bərabər, həm də özündə bütün əvvəlki informasiyaları daşıdığına görə hər cümlədə informasiya itkisinin də qarşısını alır. Anafora özündən öncə verilmiş antesedent və antesedentlə əlaqəli məlumatların “açar sözü” qismində çıxış edir.

Xəbər mətninə nəzər salaq.

“Bu il Şuşa şəhərində “ASAN xidmət” mərkəzi fəaliyyətə başlayacaq. “Report”un xəbərinə görə, bu barədə Azərbaycan Respublikasının Prezidenti yanında Vətəndaşlara Xidmət və Sosial İnnovasiyalar üzrə Dövlət Agentliyinin (“ASAN xidmət”) sədri Ülvi Mehdiyev jurnalistlərə açıqlamasında deyib.

Onun sözlərinə görə, gələcək illərdə Ağdam, Cəbrayıl və Laçın şəhərlərində də regional “ASAN xidmət” mərkəzləri fəaliyyət göstərəcək”[3].

Burada iki anafora ilə qarşılaşırıq. Birinci, “bu” əvəzliyi tam bir cümləyə istinad edir. “Bu barədə...” birləşməsinin yerinə “Bu il Şuşa şəhərində “ASAN xidmət” mərkəzinin fəaliyyətə başlayacağı barədə” yazmaq mümkün olsa da, bu təkrarçılığa, həm də xəbər diskursu üçün xas xüsusiyyət olmayan uzunçuluğa səbəb olardı.

İkinci anafora olan “o” (“onun”) “Ülvi Mehdiyev” referensini əvəz etsə də, həm də onunla (Ülvi Mehdiyevlə) əlaqədar mətndə anaforaya qədər qeyd olunmuş bütün informasiyaları əhatə edir. Burada nəinki Ülvi Mehdiyevin vəzifəsi (Azərbaycan Respublikasının Prezidenti yanında Vətəndaşlara Xidmət və Sosial İnnovasiyalar üzrə Dövlət Agentliyinin sədri), həm də onun jurnalistlərə verdiyi açıqlama (“bu il Şuşa şəhərində “ASAN xidmət” mərkəzi fəaliyyətə başlayacaq”) nəzərdə tutulur. Yəni “Onun sözlərinə görə...” ifadəsində “onun” anaforası “kimin?” sualına cavab olaraq “Bu il Şuşa şəhərində “ASAN xidmət” mərkəzinin fəaliyyətə başlayacağı barədə jurnalistlərə açıqlama verən Azərbaycan Respublikasının Prezidenti yanında Vətəndaşlara Xidmət və Sosial İnnovasiyalar üzrə Dövlət Agentliyinin sədri Ülvi Mehdiyev” geniş açıqlamasını əhatə edir.

[3] https://report.az/daxili-siyaset/bu-il-susada-asan-xidmet-merkezi-fealiyyete-baslayacaq/

Həmçinin anafora özündən öndə gələn məlumatlar ilə özündən sonra gələn aidiyyatı məlumatların əlaqələndirici vasitəsi kimi çıxış edərək axıcılıq yaradır. Baxdığımız xəbər mətnində birinci anafora ("bu") ilk cümlədə verilmiş məlumatla onun mənbəyini (müəllifini) əlaqələndirir. İkinci anafora vasitəsi ilə isə mənbə və yeni məlumat arasında bağlılıq yaranır. Bununla bərabər, Dövlət Agentliyi sədrinin verdiyi məlumatların bir qismi anaforadan öndə ("bu il Şuşa şəhərində "ASAN xidmət" mərkəzi fəaliyyətə başlayacaq"), bir qismi isə sonra gəlir ("gələcək illərdə Ağdam, Cəbrayıl və Laçın şəhərlərində də regional "ASAN xidmət" mərkəzləri fəaliyyət göstərəcək"). Beləliklə, anafora geniş informasiyanın hissə-hissə verilməsinə şərait yaradır ki, bu da xəbər diskursuna xas olan sadə, qısa cümlələr xüsusiyyətinə uyğun gəlir.

Bu mənada katafora əsas informasiya yükünü daşıyan postsedentdən öndə gələrək minimum informasiyalılığa malik olur. Katafora kommunikativ situasiya barədə ilkin giriş etsə də, onun məlumatlılığı "üstüörtülü" xarakter daşıyır. Deməli, anaforadan fərqli olaraq, katafora özündən sonra gələcək informasiyanın bir kiçik sözdə cəmlənməsidir. Lakin bu cəmlənmə anafora kimi aydınlıq ifadə etmir. Çünki kataforanın əvəz etdiyi əsas informasiya mətndə ya cümlənin sonrakı hissəsində, ya da növbəti cümlədə verilir. Ona görə də kataforanın informativliyi minimum olur.

Kataforanın bu xüsusiyyəti onu ciddi xəbər mətnlərinin xüsusiyyətlərinə uyğun etmir. Belə ki, ciddi xəbərlərdə əsas informasiya operativ, aydın, bədiilikdən uzaq hazırlanır. Katafora isə əsas informasiyanı sonraya saxlayaraq operativliyi ləngidir, aydınlığı azaldır, həm də materiala, bir növ, bədiilik gətirir. Katafora iki cümləni və ya bir cümlənin iki hissəsini bir-biri ilə əlaqələndirsə də, tamlığın və ya, ən azından, informasiyalılığın yaranması üçün postsedentin olduğu ikinci cümlənin və ya cümlənin ikinci hissəsinin mövcudluğunu mütləq tələb edir. Məsələn, iki cümlədən ibarət anaforalı bir mətndə ikinci cümləni (anaforalı cümləni) çıxartsaq da, birinci cümlə nisbi bitkin olacaq. Lakin iki cümlədən ibarət kataforalı bir mətndə ikinci cümləni (postsedentli hissəni) çıxartsaq, birinci cümlə nisbi bitkin olmayacaq. Ciddi xəbər mətnləri isə elə prinsiplə yazılır ki, əhəmiyyətli informasiyalar öndə verilərək (tərs piramida qaydası) hər cümlə mütləq tamlığı ilə seçilir. Yəni xəbərin istənilən cümləsindən (və ya cümlənin müəyyən tamlığı ilə seçilən hissəsindən) sonra material oxunmasa (dinlənilməsə) da, öndəki faktlar hadisə haqqında nisbi və bitkin təəssürat yarada bilir. Xəbər mətninin postsedentsiz kataforalı hissəsi isə olay haqqında nisbi bitkin təəssürat yarada bilmədiyindən, mütləq bu iki hissənin (cümlənin) birlikdə mövcudluğunu tələb edir. Əks halda, əvəzlik informativ qüvvəsini itirdiyinə görə diskurs formalaşmır.

Kataforaya əsasən, jurnalistikanın irrasional janrlarında, informasiya materialların-

da isə rəngli, reklam və ya ictimai əlaqələr xarakterli xəbər mətnlərində rast gəlmək mümkündür. Çünki əsas informasiyaya bir növ gözlənti yaradan katafora hədəf auditoriyasının diqqətini cəlb etmək və maraq yaratmaq metodu məqsədilə istifadə olunur. Ciddi xəbər mətnlərində isə nadir hallarda rast gəlinən kataforalar, adətən, postsedentlə cümlənin bir hissəsi olaraq və ya bir-birlərindən ayrılmaz hissələr olaraq təqdim olunur. Məsələn:

"Azərbaycan millisinin AVRO-2020-nin seçmə mərhələsinin Uelslə oyununda avtoqol qeydə alınıb. Kardiffdəki görüşdə hesabı *öz* qapısına qol vuran *Pavel Paşayev* açıb..."[4].

İdman xəbər mətnindən olan bu parçanın ikinci cümləsində katafora ilə postsedent onlarla əlaqəli olan sözlərlə birlikdə bir söz birləşməsi yaradırlar: Kardiffdəki görüşdə hesabı *kim* açıb? *Öz qapısına qol vuran Pavel Paşayev.* Bu cümlədə ciddi xəbər materiallarına xas olan əhəmiyyətli informasiyanın öndə verilməsi prinsipi də qorunub. Belə ki, əsas informasiya avtoqol faktıdır (*"öz qapısına qol vuran"*), sonra isə həmin avtoqolun müəllifi.

Həmçinin bu xəbər cümləsində katafora iki faktı bir cümlədə birləşdirməyə də imkan verdi: 1. Kardiffdəki görüşdə hesabı Pavel Paşayev açıb. 2. O öz qapısına qol vurub.

Deməli, katafora xəbər mətninin daha qısa olmasına və əhəmiyyətlilik (və ya maraq) prioritetinin gözlənilməsinə şərait yaradarsa, ciddi xəbər mətnlərində də uğurlu metod hesab oluna bilər.

Anafora ilə kataforanın daşıdığı informasiya yükü isə antesedent və postsedentin nisbi konkretliyindən asılıdır. Çünki əvəzliklərdə ümumilik olsa da, istinad "nöqtəsi" onları nisbi konkretləşdirir. Belə ki, media xəbər diskursunun önəmli olan xüsusiyyətlərindən biri – dəqiq-dürüstlük əvəzliklərdə birbaşa özünü doğrultmur. Bu səbəbdəndir ki, rəsmi xəbərlərdə əvəzliklər minimuma endirilir, leksik təkrarların isə, əksinə, çoxluğu müşahidə olunur. Bununla belə, əvəzliklərə məxsus əlaqəlilik xüsusiyyəti dolayısı yolla olsa da, antesedent / postsedentin dəqiq-dürüstlük nisbətini əvəzliklərə ötürərək onları yalnız bir tək situasiya üçün konkretləşdirir (yəni konkret situasiya üçün konkret məna; digər situasiya üçün əvvəlki məna uyğun olmaya bilər).

Azərbaycan dilində əvəzliklərin mənaca yeddi növü var: şəxs, işarə, təyini, qayıdış, inkar, qeyri-müəyyən və sual. Media xəbər diskursunda qeyri-müəyyən, inkar və sual əvəzlikləri minimum səviyyədə istifadə olunur. Bu da adı çəkilən əvəzlik növlərinin xəbərləmə prosesi üçün daşıdığı informasiya yükünün azlığından irəli gəlir. Belə ki, adından da göründüyü kimi, qeyri-müəyyən əvəzliklər dəqiq informasiya verməyərək,

[4] https://www.yeniavaz.com/az/news/118187/azerbaycan-millisi-tarixinde-10-cu-defe-topu-oz-qapisina-vurub

əksinə, əlavə suallar yaradırlar. Dəqiq-dürüstlük xüsusiyyəti üstündə qurulan xəbər diskursunda isə təxminlər deyil, faktlar təqdim olunmalıdır. Bu mənada inkar əvəzlikləri daha dəqiq xarakter daşıyır. Lakin xəbər mətnlərində yoxluğun varlığındansa, varlığın yoxluğu prinsipinə üstünlük verilir (məsələn, "Bizə heç kəs cavab vermədi" cümləsinin yerinə "Sualımızı cavablandıran olmadı"). Ona görə də inkar əvəzlikləri xəbər mətnlərində az-az müşahidə olunur.

Sual əvəzlikləri isə ciddi xəbər diskursu üçün kütləvi informasiya kanalından asılı olaraq lüzumsuz vaxt və ya yer itkisidir. Çünki xəbər materialları altı informasiya janrlarının sualı üstündə qurulur: *kim, nə, harada, nə zaman, necə, niyə*. Xəbər diskursunda məqsəd bu sualları cavablandıraraq olayları işıqlandırmaqdır. Materiallar müsahibədəki kimi sual-cavab üstündə deyil, yalnız cavablar üstündə qurulduğundan sual cümlə media xəbər diskursunun qısa-konkretlik və informativlik kimi xüsusiyyətlərinə ziddiyyət təşkil edir.

Media xəbər diskursunda endoforik əlaqəlilik yaradaraq geniş müşahidə olunan əvəzliklərə isə şəxs və işarə əvəzlikləri aiddir. Daha dəqiq ifadə etsək, üçüncü şəxs əvəzlikləri ("o", "onlar") və "bu" işarə əvəzliyi xəbər mətnlərində daha geniş istifadə olunaraq qrammatik koheziya rolunda çıxış edirlər. Həmçinin işarə əvəzliklərindən – *o, elə, belə, həmin*; qayıdış əvəzliklərindən yalnız – *özü, özləri*; təyini əvəzliklərdən – *öz, eyni*; qeyri-müəyyən əvəzliklərindən isə – *hamı, bəzisi, hər kəs, hərə, biri* media xəbər diskursunda müşahidə olunur.

Xəbər materialı birinci şəxsin ikinci şəxsə üçüncü şəxs barədə verdiyi informasiya istiqamətində yazılır. Birinci şəxs qismində jurnalist (kommunikator), ikinci şəxs qismində onun ünvanlandığı auditoriya, üçüncü şəxs qismində isə haqqında danışılan canlı və cansız aləm nəzərdə tutulur. Ona görə də bütün anaforik və ya kataforik əvəzliklər üçüncü şəxsin ya təkini, ya da cəmini nəzərdə tutur (məsələn, "bəzimiz" deyil, "bəzisi", "özünüz" deyil, "özləri" və s.). Həmçinin Azərbaycan dilinə məxsus olan mənsubiyyət şəkilçiləri sayəsində sıfır anafora da yarana bilər. Mənsubiyyət şəkilçiləri anaforanın deyilməyib, nəzərdə tutulmasına baxmayaraq, cümlənin dağılmağına imkan vermir.

**Nəticə**

Beləliklə, mətn daxilində özündən əvvəl və sonra işlənən söz və söz birləşmələrinin daha qısa elementlərlə əvəzlənməsi xəbər mətnlərinin daha yığcam olmasına səbəb olur. Nəzərə alsaq ki, xəbər janrı jurnalistika janrları içində həcminə görə ən qısa janrdır, deməli, əvəzliklər xəbər diskursunun bu xüsusiyyətini gerçəkləşdirmək üçün də bir vasitə ola bilər.

Həmçinin əvəzliklər sayəsində xəbər mətnlərində eyniköklü sözlərin təkrarının qarşısı alınır. Leksik və məzmun təkrarları xəbər diskursunun bir çox xüsusiyyətlərinə uyğun gəlir. Məsələn, leksik təkrarlar xəbər mətnlərində aydınlığı, dəqiqliyi, məzmun təkrarı isə informativliyi artırır. O cümlədən onlar materialın fokus nöqtəsini də müəyyənləşdirməkdə az əhəmiyyətli deyillər. Bununla belə, mətndə təkrarçılığı azaltmaq və axıcılığı artırmaq məqsədilə konstant məsafədə leksik təkrarlar proformlarla əvəzlənir. Həm də əvəzliklər sözün aktuallığını leksik təkrarlara nisbətən azaldır. Deməli, bu koheziya vasitəsi ilə fokus nöqtəni dəyişmək də mümkün olur.

Endafora çərçivəsində proformların mətndə əvəz etdiyi referensə görə, yerindən asılı olaraq, anafora və katafora adlandırılan iki növü var ki, onlar media xəbər mətnlərində eyni dərəcədə aktual deyillər. Belə ki, əgər anaforalar konstant məsafədə xəbər diskursunda aydınlıq xüsusiyyətinə xələl gətirmirlərsə, kataforalar məlumatın aydınlığının kəskin azalmasına səbəb olurlar. Həmçinin anaforalar kataforadan daha artıq informasiya yükünə malikdirlər. Xəbər diskursunda isə informasiyalılıq əsas xüsusiyyətlərdən biridir. O cümlədən, xəbər mətninin strukturu baxımından da anafora kataforadan daha aktualdır. Deməli, media xəbər diskursunda anafora daha çox bu janrın xüsusiyyətləri baxımından onun tələblərinə uyğunlaşa bilir. Katafora isə bəzi adı çəkilən uğurlu istisnaları çıxmaq şərti ilə, adətən, media xəbər diskursunda müşahidə edilmir.

Tədqiqatımız nəticəsində aydın oldu ki, Azərbaycan dilinə xas olan əvəzliklərin bütün məna növləri eyni tezlikdə xəbər diskursunda istifadə olunmur. Bu, həmçinin bir məna növündəki əvəzliklərin işlənmə tezliyinə də aiddir. Buna səbəb onların hər birinin xəbər janrının xüsusiyyətlərinə müxtəlif dərəcədə uyğunlaşmasıdır.

**İstifadə edilmiş ədəbiyyat**


1. Abdullayev K., Məmmədov A., Musayev M., Üstünova K., Novruzova N., Hüseynov Ş., Rzayeva G., Hacıyeva K., Ziyadova L., Fətəliyeva S., Nağıyeva G., Məhərrəmova G., Zeynalova Ş., Səlimova F., Məhərrəmova V. (2012). Azərbaycan dilində mürəkkəb sintaktik bütövlər. Bakı, 608 s.
2. Qurbanov A. (2004). Ümumi dilçilik. I cild. Bakı, Nurlan. 748 s.
3. Xəlilov Ə. (1969). Əvəzliklərin müstəqil cümlələr arasında əlaqə yaratmaqda rolu. Azərbaycan SSR Elmlər Akademiyasının xəbərləri. Ədəbiyyat, Dil və İncəsənət seriyası, № 1, s. 65 – 70.
4. Crystal D. (1997). A dictionary of linguistics and phonetics. 4th edition. Cambridge, MA, Blackwell Publishing.

5. Lyu J., Yun J., & Finer D. (2021). Processing of anaphora and cataphora in weak crossover in English (non)-native speakers. "Chicago Linguistic Society". Proceedings of CLS 56 (2020). 295 – 307 p. inguistics.stonybrook.edu/jiwonyun/publication/2021_Lyu_Yun_Finer_CLS.df
6. Radford A. (2004). English syntax: An introduction. Cambridge, UK, Cambridge University Press.
7. Gvozdev A. N. (1973). Sovremennyy russkiy literaturnyy yazyk. Chast 1. Fonetika i morfologiya, 4-ye izd. Moskva, Prosvesheniye. 432 s.
8. Kutinova Ye. V. (2020). Anaforicheskaya i kataforicheskaya funktsii evfemizmov (na materiale publitsisticheskikh tekstov na angliyskom i nemetskom yazykakh). Filologicheskiye nauki, Voprosy teorii i praktiki. Tambov, Gramota. Tom 13. Vypusk 8, s. 179–184.
9. https://report.az/daxili-siyaset/bu-il-susada-asan-xidmet-merkezi-fealiyyete-baslayacaq/
10. https://www.yeniavaz.com/az/news/118187/azerbaycan-millisi-tarixinde-10-cu defe-topu-oz-qapisina-vurub

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2024, № 3 (281), 82–93
doi.org/10.48445/b8901-5513-3267-n



# Nigari şeiriyyətinin ritm və intonasiya qaynaqları

***Minaxanım Nuriyeva Təkləli***
Filologiya elmləri doktoru, professor, Azərbaycan Dövlət Pedaqoji Universiteti.
Azərbaycan. E-mail: proftomris@gmail.com
https://orcid.org/0000-0002-4985-8134

**XÜLASƏ**
Məqalədə Nigarinin yaradıcılığı üzərində aparılan müşahidələr əsasında şairin şeirlərində özünü qabarıq şəkildə göstərən ritm, intonasiya, bir sözlə, melodiya yaradan özəlliklər şərh olunur; müvafiq örnəklər vasitəsilə fikrin təsdiqinə çalışılır. Göstərilir ki, xüsusi səslərin ritm və intonasiya vasitəsilə Nigari yaradıcılığında ərsəyə gətirdiyi şeiriyyət psixoloji ovqat formalaşdırır; fikir və duyğuların ritmi, akustik rənglər, səsin effekti bu şeirlərin bütövlüyünü təmin edir. Məlum olur ki, şeirin gözəlliyi təkcə obrazlı ifadələrin, məcazların iştirakı ilə deyil, həmçinin intonasiya, ritm vasitəsilə də əldə olunur.

**AÇAR SÖZLƏR**
Nigari, şeir, alliterasiya, intonasiya, melodiya

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 08.07.2024
Qəbul edilib: 25.08.2024

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2024, NO. 3, VOL. 281, 82–93
doi.org/10.48445/b8901-5513-3267-n

AZERBAIJANI LITERATURE

# Rhythm and Intonation Sources of Nigari Poetry

***Minakhanim Nuriyeva Tekleli***
Doctor of Philological Sciences, Professor, Azerbaijan State Pedagogical University. Azerbaijan. E-mail: proftomris@gmail.com
https://orcid.org/0000-0002-4985-8134

**ABSTRACT**
In the article, based on the observations made on Nigari's work, the rhythm, intonation, and, in a word, melody-creating features that manifest themselves prominently in the poet's poems are interpreted; It is tried to confirm the idea through relevant examples. It is shown that the poetry created by special sounds through rhythm and intonation in Nigari's creativity forms a rich variety of psychological poetry; the rhythm of thoughts and emotions, acoustic colors, sound effects ensure the integrity of these poems. It turns out that the beauty of the poem is achieved not only through figurative expressions and metaphors, but also through intonation and rhythm.

**KEYWORDS**
Nigari, poetry, alliteration, intonation, melody

**ARTICLE HISTORY**
Received: 08.07.2024
Accepted: 25.08.2024

## Giriş

Klassik Azərbaycan ədəbiyyatında və davamı XIX yüzillikdə Azərbaycanın siyasi-mənəvi həyatında silinməz iz qoyan ustadlardan biri də Mir Həmzə Nigaridir. Seyid Nigari Şərqi Zəngəzurun indiki Laçın inzibati bölgəsinə bağlı Cicimli kəndində anadan olmuş, gənc yaşlarından Türkiyəyə mühacirət etmiş, Amasiyada məskunlaşmışdır. Nəqşibəndilik təriqətinin tanınmış mürşidlərindən olan Nigari ruslara qarşı Qafqazı, Azərbaycan və Şərqi Anadolunu bürümüş mübarizə hərəkatının, bir növ, öncüllərindən sayıla bilər. Bir yandan Krım müharibəsi (1853 – 1856) ərəfəsində Qafqazda çar Rusiyasının işğalçılıq siyasətinə qarşı gedən milli-azadlıq mübarizəsi, bir yandan da Rusiya və Osmanlı dövləti arasında hərbi-siyasi ziddiyyətlərin kəskinləşməsi ilə regionda vəziyyət ağırlaşaraq təhlükəli hal almışdı. Böyük nüfuz sahibi Nigari və tərəfdarları bu təhlükə səbəbi ilə mühacirət etməyə məcbur olmuş, Qarsda, Muşda, Merzifonda, bir çoxu isə Amasiyada məskunlaşmışdılar. O, uzaqdan-uzağa daim Azərbaycanı düşünmüş, rus işğalı altında olan vətənin müqəddəratına biganə qala bilməmiş, istək və amallarını ona yönəltmişdi. Bu amal uğruna nəfəsi, qayəsi və qələmi ilə insanlığı elmə, inkişafa istiqamətləndirmiş, amma yenə də həyatı boyu onu anlamayanların, qəbul etməyənlərin yanlış münasibətlərinin əziyyətini çəkmişdi. Onun qəzəlləri, şeirləri, qəsidələri təkcə şagirdləri, müridləri arasında deyil, həm də xalq arasında oxunur, sevilirdi. Bu şeirlər indi də əski türk adət-ənənələrinin davamı kimi müxtəlif məclislərdə kollektiv şəkildə öz ritmik tempini saxlayaraq ifa olunur, birlik, birgəlik ifadə edir. Ölkəmizin elmi ictimaiyyətində Nigari irsinə güclü maraq oyanmış, şeirlər divanı tərtib olunaraq çap olunmuşdur. Həmin vaxtlardan başlayaraq "Qarabağdan Amasiyaya könül körpüsü" devizi altında dəfələrlə beynəxalq simpoziumlar təşkil olunmuş, Mir Həmzə Nigari irsi öyrənilməklə yanaşı iki qardaş xalq arasındakı mədəni əlaqələr tədqiqata cəlb edilmişdi. Günümüzdə olduğu kimi, keçmiş zamanlarda da Anadolu türkləri ilə Azərbaycan türkləri arasında körpülər ilk növbədə mədəniyyət sahəsində qurulmuş və bu zaman təbii ki, həmin mədəni mübadilənin ana xətti ədəbiyyat (şeir) olmuşdur.

## Əsas hissə

Təsəvvüf ədəbiyyatının görkəmli şairlərindən sayılan Mir Həmzə Nigarinin adı günümüzdə Azərbaycan türk fəlsəfəsinin unudulmayan səhifələrini yaradanların sırasında yer almaqdadır [12, s. 291]. Belə ki, ədəbiyyat tariximizdə Mir Həmzə Nigarinin adı XIX əsrin yarısında Seyid Əzim Şirvani, Natəvan, Kəminə, Abdulla bəy Asi, Mirzə Məhəmməd Tağı Qüdsi, Hacı Əbülhəsən Raci ilə bir yerdə çəkilir [9, s.353].

Bu məqamda Nigari yaradıcılığı ilə davamlı məşğul olan amasiyalı soydaşımız prof. Mətin Haqverdioğlunun da qeydlərini yada salaq: *"Amasya öz alimləri, şairləri, mistikləri və şahzadələri ilə dünya miqyasında layiqli nüfuza malikdir. Onun şöhrətinin yeganə səbəbini "Şahzadələr şəhəri" olması ilə əlaqələndirənlər yanılır; çünki bu şəhər hələ şahzadələrə ev sahibliyi etməzdən əvvəl, şahzadələr dövrü bitdikdən sonra alimlərin, şairlərin və mütəsəvvüfçülərin mərkəzi olmuşdur. XIX əsrdə yaşamış Mir Həmzə Nigari də bu dəyərli şəxsiyyətlərdəndir"* [6, s. 101].

Füzuli ədəbi məktəbinin davamçısı, eyni zamanda nəqşibəndilik təriqətinin nümayəndəsi kimi tanınan Nigari poeziyasının əsas məzmununu dini-təsəvvüfi və insanın mənəvi dünyasını əks etdirən, klassik şeir janrı olan – qəzəl, qəsidə, rübai, qitə, müstəzad, tərkibənd və s. təşkil edir. Mir Həmzə Seyid Nigarinin şeir dili bir sıra cəhətlərinə görə yüksək səviyyəli ədəbi-bədii dil nümunəsi hesab oluna bilər [9, s. 344]. Nigarinin xalq poeziyası ruhunda yazdığı, mənəvi aləminə işıq tutan həssas, eyni zamanda səmimi şeirləri onun öz mənəvi dünyası, hiss və duyğularını böyük coşqunluqla təsvir etmişdir. Şairin türkcə və farsca divanları Füzulinin təsiri hiss olunan aşiqanə şeirlərindən ibarətdir. Şeirin hər iki divanı sağlığında İstanbulda çap olunmuşdur. Bu əsərlərdəki şeirlər də Əhməd Yəsəvinin şeirləri kimi müqəddəs mətnlər səviyyəsində qəbul edilmiş, zikr əsnasında da daim ehtiramla oxunmuşdur [6, s. 104]. Musiqiylə dolmuş sözlərin, misraların xüsusi avazlanma prinsipi üzrə düzümü, onların yaratdığı xəfif, habelə coşqun melodik çalarlar oynaq, canlı obrazlar aləmi ilə birləşərək ortaya möhtəşəm bədiilik çıxarır. Məlum olur ki, şeirin gözəlliyi təkcə obrazlı ifadələrin, məcazların iştirakı ilə deyil, həm də intonasiya, ritm vasitəsilə əldə olunur. Məhz həmin gözlənilən obrazlılıq ritmin, melodiyanın yaratdığı dərin hiss-həyəcan, solmayan duyğuların ifadəsində özünü göstərir. Həqiqətən, Seyid Həmzə Nigarinin şeirlərini anaların söylədiyi laylalara bənzədənlər yanılmamışlar. Şairin yaradıcılıq məharətindən doğmuş obrazlılıq ritmin, melodiyanın yaratdığı dərin hiss-həyəcan solmayan duyğularda özünü göstərir.

Ləlindir ömrüm səfası,
Ağzındır dərdim şəfası.
Ey sənəm, zülfün həvası
Əldə sərmayə, sərmayə...
Gözlərimdən axar al qan,
Cigərgahım dolu peykan.
Bağrım başın qaşı kaman
Etdi nişanə, nişanə.

Yaxud: *“Qara bağrım qanlı Qarabağımdır”; “ənisim, munisim, yarım, nigarım”; “Allah! Allah! Bu nə dilbər, bu nə sərvər, bu nə mövla, mövla!”; “bu nə rəna, bu nə hüsna, bu nə surət, surət! bu nə şəklü nə şəmail, bu nə ziba, ziba!”* ritmləri gözəl poeziya nümunəsinin əsasını təşkil edir; necə deyərlər, ahəngdar ritm intonasiyaya səbəb olur, onu meydana gətirir, intonasiyanın ifadə etdiyi qiymətli effektlər məhz ritmdən doğur... Bu yolla meydana gələn “Qara bağrım, Qarabağım” ifadəsi hazırda qanadlı sözlər cərgəsinə keçmişdir.

Bizim də Nigarinin şeir divanı üzrə apardığımız müşahidələr bunu göstərir; odur ki, həqiqətən, ritm, intonasiya, yəni melodiya yaradan hər bir özəlliyin şərh olunmasına və müvafiq örnəklər vasitəsilə fikrin təsdiqinə çalışılmasına zəruri ehtiyac bu səbəbdən yaranır; əslində, təmiz, parlaq, axıcı bir söyləyiş ədası məhz şeirə hakim olan” mühüm əlamətlərdir [3, s. 96]. Səslərin alliterasiyası, səslərin yaratdığı və türk şeirinin canı, qidası olan harmoniya hər zaman şeirimizi şərqiyə çevirmişdi. Aşağıda təqdim edilən parçada [*c*], [*n*], [*m*] səsləri vasitəsilə yaradılan alliterasiya ilə əldə olunan ahəngdarlıq möhtəşəm ana dili abidəmiz – “Kitabi-Dədə Qorqud”dan başlayan qiymətli sənət ənənəsidir.

Fikri-cananım, canani-canım,
Zikri-cahanım, Qurani-canım.
Ləli-cananım, imani-canım,
Çeşmi-cananım, sultani-canım.
Qəmzi-cananım, xaqani-canım,
Rəmzi-cananım, loğmani-canım.
...Olmaz bibadə dövrani-canim,
Dutar mərdanə cami-gərdanim.
Cami-gərdanım, gərdani-canim,
Gərdani-canim, canani-canim.
Dərdi-cananım, dərmani-canim,
Zəhri-cananım, rəvani-canim...

Örnək olaraq təqdim edilən parça göstərir ki, “canlı insan duyğularını ehtizaza gətirən alliterasiya çətin yaradıcılıq işidir, tək-tək şairə nəsib olan sənətkarlıq amili, sənət yoludur” [7, s. 35]. Yəni morfem və söz daxilindəki... təkrar özəlliyi özəl dil olan poetik dilin bədii-ekspressiv yükünü çəkmiş olur. Bu sıralanma, ən sadə şəkildə böyük mürəkkəbliyin daşıyıcısı olaraq formalaşmış təbii sistemdir [4, s. 380].

Nigari şeirlərində bu mənada qalın və incə saitlərin assonansına, samitlərin alliterasiyasına, assonans və alliterasiyanın eyni misra daxilində təzahürünə daha çox

təsadüf olunur. Şairin poetik dilindəki ecazkarlıq da məhz bu cür detallarda təsdiqini tapır; anaforalar, epiforalar, zəngin qafiyələr, xüsusən də ayrı-ayrı misralarda epifora kimi işlənən sözlərin həmqafiyə olması təkcə mətnin poetik mənasını yox, həm də musiqililiyini qüvvətləndirir [2, s. 101]. Epiforaların özünü büruzə verdiyi ən effektli hal ayrıca hallarda işlənən bir sözün təkrarən qafiyəyə çevrilməsidir ki, bunun örnəklərinə də Seyid Nigari şeiriyyətində kifayət qədər rast gəlirik: şərarət, nə şərarət; şəqavət, nə şəqavət; səfahət, nə səfahət; səadət, nə səadət... (Aşiq oldum yenə tazə / Bir növ*cavanə*, *cəvanə* / Qanı bir əhli-dil, yazə / Ərzim *cananə, cananə*)...

Deməmk, “şeir dilini gündəlik və elmi dildən və ya nəsr dilindən fərqli qılıb onu bir üst dil halına gətirən niteliklərin başında ahəng, başqa sözlə desək, musiqi gəlir. Şeir bir nəğmədir” bu nəğməni ifadə etmək üçün vəzn və lisan ancaq və ancaq alətdir” [3, s. 30]. Nigarinin şeirlərinin dil materialının dil və üslub baxımdan təhlili göstərir ki, “lirikanın simmetrik səs-söz tərtibi ilə bağlı ahəng və intonasiya, poetika elementlərinin biri digərini şərtləndirən əlaqəsindən ibarət ritm modelləri mahiyyət etibarı ilə əsl bədii ləyaqət səlahiyyəti qazanmışdır [8, s. 5]. Bu “simmetrik səs-söz tərtibi” keyfiyyətinə malik olmanın nəticəsidir ki, şairin dilində rəngarəng poetik ifadələr, o cümlədən bədii təyinlər səslərin yaratdığı füsunkar şeiriyyətin bariz nümunələridir; təkcə şairin bir şeirindən götürdüyümüz və yalnız Qarabağ adı ilə formalaşan, heyranlıq yaradan: *seyri-şikari-Qarabağ; söhbəti-yari-Qarabağ; ənhari-pünari-Qarabağ; çayi-çinari-Qarabağ; dar-diyari-Qarabağ; vəsfi-həzari-Qarabağ; nar-nigari-Qarabağ*... misraları buna sübutdur. Uşaqlığını keçirdiyi Qarabağ, oradakı təbiət, uzun zaman ayrı qaldığı vətən guşələri, daim ona ilham verən sevimli diyarın xatirəsi, qəlb təbəddülatları sanki sızıltı və hönkürtüləri səslərin qoşduğu musiqi, harmoniya ilə qulaqlarımıza çatdırır...

Həqiqətən, şeir müxtəlif dil faktorlarının vəhdətindən meydana çıxır. Əlbəttə, adi danışıqda da belədir, lakin bu zaman nitqin söz varlığını təşkil edən lüğəvi vahidlər sərbəstdir, elə bu sərbəstliklə də sıralanır. Burada şeirdən fərqli olaraq intonasiya, habelə ritm fikrə, məqsədə tabedir. Şeir dilindəki intonasiya isə melodiyada qarışır. Belə çıxır ki, həqiqi şeir dili musiqili olmalıdır. Bu mənada Nigarinin dilindən götürdüyümüz tərkiblər... *“meyi-mirad”; “ruzi-əzəl”; “rəhməti-Rəhman”; “haleyi-mah”; “ahi-pənah”; “aşiqi-şeyda”; “pəndi-pədər”; “didari-dilara”; “dideyi-dildar”; “gənci-pənc”; “əshabi-səfa”; “sudi-sevda”; “sineyi-süzan”; “əhli dilan”; “türreyi-tərrar”; “canani-canım”; “nari-dərun”; “qəzali-nazənin”; “bayraqi-bala”; “badeyi-dil”, “badeyi-mey”; “bülbüli-şəb”, “bülbüli-dil”; “buyi-reyhan”; “əşari-şəkərbar”; “şəmi-şəbistan”; “şahi-üşşaq”; “şürbi-şirin”; “şiri-xurşid”; “xurşidi-rəxşan”; “əksi-rüxsar”; “iqrari-qədəh”; “zümzümeyi-saz”; “zülfi-zərnigar”; “zülfi-*

*zərəfşan*”... sırf alliterasiyanın bəhrələridir. Şeirdə alliterasiya emosional effekt verən ciddi poetik hadisədir və “onların işləndiyi mətndə hissi məqamlar istər-istəməz ön plana keçir” [8, s. 35]. Belə bir şəraitdə, təbii olaraq, “nizam, ahəng yaradıcılığı, sözə qənaət, dərin mənanın yığcam ifadəsi, tərkiblərin potensial imkanlarından istifadə” hər zaman olduğu qədər incələmək istədiyimiz situasiyada da şeirin üslubi fiqurları olaraq son nəticədə şairin dilin estetikasını duyma qabiliyyətini nümayiş etdirir [8, s. 166]. Tərkiblərə aid örnəklərimiz mənşə baxımından sırf türk sözlərindən düzəlməməsinə baxmayaraq, eynicinsli səs izlənişi ilə bərabər, məhz “heca vəzninin milliliyi” bu şirinliyi ortaya çıxarmışdır [2, s. 41].

Dil və ya kəlmələrin səslərindəki uyum şeir dilinin ruhumuza və mənəviyyatımıza öz xoş təsvirini göstərir... Unudulmamalıdır ki, şeir bir söz sənətidir, yəni duyulan bir sənətdir. Onun üçün şeir “inşad” edilir, yəni vəzninə, qafiyəsinə, vurğularına və ehtiva etdiyi ruh hallarına görə səsli bir biçimdə oxunur [3, s. 32]: “can *yaxan*-evlər *yıxan*”; “ey şiri-*xurşid*, ey *rəşid”*; “*çəmənim-yasəmənim-vətənim*”; “*bu nə dilbər-bu nə sərvər*”; “*səndən cəfa-bəndən vəfa*”; “*səndən əda-bəndən qəza*”; “*Fərhad* gedüb, gəldi bana növbəti *fəryad*”; “tök *ləxtə-ləxtə* qanımı, al *gilə-gilə* canımı” parçalarında tükənməz enerji çağlayır... “sanki ərrəbin altında mümkün olan min sözdən birini seçmişdir” [1, s. 225].

Mir Həmzə Nigarinin sənət sirləri çoxdur, rəngarəngdir...

Xüsusi səslərin ritm və intonasiya vasitəsilə Nigari yaradıcılığında ərsəyə gətirdiyi şeiriyyət zəngin çeşidlərdə psixoloji ovqat formalaşdırır; fikir və duyğuların ritmi, akustik rənglər, səsin effekti bu şeirlərin bütövlüyünü təmin edir. Musiqiylə dolmuş sözlərin, misraların xüsusi avazlanma prinsipi üzrə düzümü, onların xəfif, habelə coşqun melodik çalarlar yaratdığı oynaq, canlı obrazlar aləmi ilə birləşərək ortaya möhtəşəm bədiilik çıxarır. Başqa cür ifadə etsək, bu, “kəlimələrin musiqisidir” [5, s. 96].

Şeirin ən mühüm, ən vacib ünsürünün qafiyə olduğunu deməklə qafiyəni əmələ gətirən sözlərin özünəməxsus akustik keyfiyyətləri hər bir dilin malik olduğu musiqi, ritm, harmoniya özəlliklərini ortaya çıxarır. Demək olar ki, “şeiri bir nəzm parçasından ayıran xüsusların başında ritm və harmoni başarısı gəlir” [11, s. 166].

Qafiyələr ayrıca bir mövzu olsa da, yığcam olaraq Nigari burada cüt qafiyə, təkrir və daxili qafiyələrdən də istifadə etməklə misraların musiqisini meydana gətirmişdir. Qafiyə əsas etibarılə “şeir mətninin daxili quruluşunun təşkilində həlledici rol oynayır və mahiyyət etibarilə səs tərkiblərinin yaxınlaşmasına səbəb olur” [7, s. 175]. Məsələn, az qala daxili qafiyəyə çevrilən aşağıdakı misralar şairanəlik doğuran güclü effekt fiqurlarıdır:

Çakəri-mehri-vəfayəm, *xidmətim* oldur bənim
Rindiyi-məsti-müdaməm, *izzətim* oldur bənim
Sayeyi-fəqrü-fənada *dövlətim* oldur bənim,
Baxmazam bir dəm ki, zira *adətim* oldur bənim,
Aləmi-bədnamlıqdan ş*övkətim* oldur bənim,
Qılmaq olmaz tərk, zira *şöhrətim* oldur bənim
Yanmışam gülgün sərapa, *niyyətim* oldur bənim
Kamiyabəm, *baisi-cəmiyyətim* oldur bənim,
Xablıq, bidarlıqda *söhbətim* oldur bənim,
Başqa yox, Seyyid Nigari, *nisbətim* oldur bənim...

Obrazlı məzmun, fikir tutumu qafiyələrin imkanlarına söykənəndə ritmik səslənmə şairin estetik məqsədinə daha yaxın olur... Qafiyənin fonetik cildi, deyiliş qiyafəsi şeirin musiqi ilə doğmalığını təsdiqləyir, onların hər ikisi arasındakı mənəvi-ruhi əlaqəni bütün dolğunluğu ilə göstərir... intonasiya təzahürü orijinal ahənglə meydana çıxır [8, s. 256 – 257].

Əslində, incə zövqə söykənən və bacarıq əlaməti sayılan “poeziyanın əsas formal elementi” [13, s. 272] “qafiyəyə məxsus vacib əlamət – sadəcə sözlə yox, daha çox səs təsəvvürləri ilə qavranılır; misra sonluğunda və sətir qonşuluğundakı sözlərdə, yaxud söz qruplarında eyni məxrəcli səs cərgələrinin oxşarlığının şeir dili üçün əlamətdar cəhəti ondadır ki, o, sözün füsunkar gücünü aşkarlamaqda əvəzsiz xidmət göstərir [7, s. 175].

Orijinal qafiyələr:

Çəküb eşqin şərabın sübhdən ol *binəva bülbül,*
Anınçün bənd-bənd eylər dəmadəm *bin nəva bülbül.*

Yaradıcılıq instinkti müxtəlif təkrar növlərini bir-birinə calaya bilir. Şeir dilində xüsusi ahəng yaratmaq üçün şair tərəfindən təkrarların işlənmə çevikliyinə söykənən koloritli danışıq konstruksiya ilə işlənir. Bu forma-konstruksiya xüsusiyyəti elədir ki, təkrar söz şeirin ən fəal sözü, başqa sözlə desək, müəllifin ifadə etdiyi mənanın əsas daşıyıcısı olur [7, s. 254 – 255]. Söz təkrarlandıqca bədii təsir imkanları çoxalır: şairin düşüncə tərzi dilinin enerji potensialında əks olunur və bununla paralel şəkildə bədii intonasiyanın çalarları əyanilәşir [7, s. 254].

Bir cünbüş ilə yaxdı evim, eylədi bərbad,
Aya, bu nə *qamət*, nə *qiyamət*, nə *qiyafət*.

Yaxud

Mən aşiqi-sevdayəm, könlüm nə *şərab istər*,
Nə zümzümeyi-mütrüb, nə *cəngü-rübab* istər.

Ovuc boyda olan ürək bir dünya sığacaq qədər böyük olmalı ki, bu misraların açılışı da dastan istər [1, s. 219]. Şeir dilindən kənarda fikrə və hissə tabe olan intonasiyanın şeiriyyətdə hiss və fikir üstünlüyünə melodiya əlavə olunduqda həqiqi şeirin həddən ziyadə musiqili, ritmik zənginliyə malik olduğu təsdiq olunur [7, s. 167]. Demək ki, poetik sözün mükəmməl şeir qəliblərinə çevrilməsindən ötrü əsas şərt ritm və intonasiya gözəlliyidir, bu da, öz növbəsində, o fikri təsdiqləməkdədir ki, geneoloji cəhətdən şeir mahnıdan, şərqidən törəmişdir. Odur ki şeirdə nəfəs və səs iki ünsürdür. Böyük şair Yəhya Kamalın obrazlı dediyi kimi, “misranın ayaqları yerdən qopmazsa, yaxud ən xəfif bir qulağı bir səs kimi doldurmazsa o, xalis şeir deyildir” [3, s. 30]. Demək ki, “ahəng şeiri musiqi sənətinə yaxınlaşdıran ən təməl nitəlikdir. Bununla birlikdə şeirdəki ahəng (musiqi), əlbəttə, saf musiqi deyildir, ola bilməz də. Zira şeir, gerçək musiqi sənətinin səs zənginliyi, düzənliyi və açıqlığı ilə rəqabət edə bilməz. Şeirdə ahəngdən (musiqidən) ilk planda anladığımız və anlamamız gərəkən xüsus – kəlmələrin anlam dünyasında da bulunan – “uyum”dur. Uyum bir varlığı, nəsnəni və ya mətni meydana gətirən pək çox fərqli ünsürün (parçanın) bir araya gəldiklərində sahib olduqları ahəngli haldır. Bunun yuxarıda söz konusu etdiyimiz dilinin tənzimiylə çox yaxın əlaqəsi olduğu mühəqqəqdir. Uyum, sənətin təməl nitəliklərindən biri olan bütünlük və birliyin vazkeçilməz şərtidir. Zira uyumsuzluq gözəllik deyil, çirkinlik doğurur” [3, s. 31].

Şairin klassik ədəbi irsimizdə önəmli yer tutan poeziyasında xüsusi mövqeyə malik məhəbbətdən, sevgidən yoğrulmuş türk-islam motivləri həyəcan doğurur:

Sənə Əhmədmi, Məhəmmədmi, məhəbbətmi deyim?!
Sənə ey taci-sərim, şahi-şəriətmi deyim?!

“Kəlmələrin musiqisinə qapılan oxucunu və dinləyicini ehtizaza gətirən bu cür nümunələrə – misralara təbii, dərin pafos, həyəcanlı ifadə hakimdir [3, s. 96]. Düşüncə və duyğuların musiqi ilə qovuşması göz önündədir. Həqiqətən, belə “şeirin qaynağının insanın psixoloji dünyası və ruhu” olduğu qənaətinə gəlinir; buna tutarlı bir dəlil olaraq tam əminliklə aşağıdakı misraları göstərə bilərik [3, s. 44]:

Dağlayıbdır bəni bir laləüzari – Qarabağ,
Yandırıbdır bəni bir nari-nigari – Qarabağ...

Ahəngə xüsusi önəm verən Nigaridə ahəngdarlığa xidmət edəcək təkrir çox güclüdür (misra başında (anafora), ortasında, axırında (epifora) təkrarlanan söz):

Əlhəmdülillah, fikrimdir Allah,
Fikrimdir Allah, əlhəmdülillah!
Könlümdə vallah, dildari-dilxah
Dildari-dilxah könlündə vallah!
Zikrimdir Allah hər bir məhəldə
Hər bir məhəldə zikrimdir Allah!
Tövbətən lillah ücbü riyadən
Ücbü riyadən tövbətən lillah!
...Keçməzəm billah, bəzmi səmadan
Bəzmi-səmadan keçməzəm billah!
Virdimdir Allah, Seyyid Nigari
Seyyid Nigari virdimdir Allah!

Emosional, habelə məntiqi vurğu yaradan təkrirlər ritorika ünsürü olmaqla, əsasən, hərbi marşlarda, qəhrəmanların tərənnümündə, mədhiyyələrdə, mərsiyələrdə işlənərək təntənəli ovqat yaratmağa xidmət edir [13, s. 235]. Bu mənada “emosionallığın güclənməsində ən qüvvətli əlamət sözlərin qoşa işlənməsi və bədii təkrarlardır” [1, s. 215]. Nigari şeirinin canlılıq və oynaqlılığı cazibə xüsusiyyətini şərtləndirir; şeirə həyəcan, çırpıntı, qəlb təlatümləri qatmaqla dönə-dönə deyildiyi kimi, bu parçaların səma məclislərində yer tutmasına gətirib çıxarmışdır:

Vaiz uğraram, uğraram, *meyxanəyə, meyxanəyə*
*Söylərəm* səni, *söylərəm*, *peymanəyə, peymanəyə*.
*Söyləmin* bana, *söyləmin*, zira *bilirsiz, bilirsiz*
*Qələm yoxdur*, *qələm yoxdur divanəyə, divanəyə*.
Könül *məcnundur*, *məcnun, ey nazənin, ey nazənin*
*Düşürüb*, çeşmin *düşürüb viranəyə, viranəyə*.
*Yandı canım, yandı canım*, *görün bir dəm, görün bir dəm*
*Kərəm eylə, kərəm eylə suzanəyə, suzanəyə*.
*Dönər könlüm, dönər könlüm* səri *kuyində, kuyində*
*Nəzər eylə, nəzər* eylə *pərvanəyə, pərvanəyə*.

“Şeirdə ahəngi (musiqini) saxlayacaq olan uyum, çox böyük ölçüdə kəlmələrin səs dəyərlərindən əldə edilir. Yuxarıda qeyd edildyi kimi, kəlmələrin sahib olduğu önəmli

dəyərlərdən biri səs olmuşdur. Onlar bir və ya birdən çox səsin bir araya gəlməsiylə təşəkkül etmiş səs topluluğudurlar. "Bir səs ovçusu" olan şairin səsdə hecanın ən ritmli qəliblərindən birini istifadə etməsi möcüzələrə yol açmışdır [11, s. 310]:

**s** – Səhni-cənnət içrə sərməsti-şərabi-vəsl ikən...
**s** – Söylə tədbir nə, ey saqiyi-səhbayi-dilim...
**z** – Öylə bir zarəm, nəzarəm zülfi-sövdasında kim...
**b** – Bir bəla ol hal ilə bulmaz bəni. Qılmaz məhəl...
**t** – Eyləmiş tar dünüm tək günümü tar gözün...
**m** – Tarmar eyləmiş imanımı tatar gözün...
**m** – Yerimdir gülşəni-meyxanə, sağər həmneşinimdir
**m** – Ənisimdir sürahi, dəmbədəm kim, məsti-xəndanəm.

Bu uğurlu düzülüş sözləri nəğmə melodiyasının detalları, vacib ünsürləri kimi nəzərəçarpan keyfiyyətlərlə yükləyir [8, s. 134]. Əlbəttə, "məsələ tək-tək sözlərin səs dəyərləri qədər birdən fazla kəlmənin bir araya gəlməsiylə oluşduracaqları səs dəyəri nöqtəsində çox daha böyük önəm ərz edər. Zira şeir deyilən mətn tək kəlmədən deyil, bir çox kəlmədən oluşur. Bu nöqtədə şeir bir kəlmələr izdivacı və ya kəlmələr orkestridir. Şair kəlmələr orkestrini daha yaxşı idarə edə bilmək üçün güclü bir qulağa sahib olmaq durumundadır" [3, s. 31]. "İnsanın duyğu, həyəcan, xəyal, düşüncə və intibaların somutlaşdırılmasında baş vurduğu ən yayğın, ən açıq və ən etkili araç heç şübhəsiz dildir [3, s. 53]". "Ritmi sağlayan sadəcə səs təkrarları deyil, şərtli cümlələrdə qurulan dizələrdə öncə şərtin, sonra gərəkliyin gəlməsi də akışqanlığı saxlar [11, s. 310]".

Biz bu divanəyi, avarəyi, şeydasifəti
Bilirüz, Mir Nigaridi, Qarabağludur.

**Nəticə**

Hazırda da Nigari şeirləri sağlığında olduğu kimi, onun yaşamından keçən iki əsrə yaxın bir zaman ərzində Şərqi Anadoluda, xüsusən Amasiyada, Borçalı ellərində, ölkəmizdə – Qazax, Qarabağ bölgələrində dildən-dilə, ağızdan-ağıza dolaşmaqdadır. Buna səbəb sözlər, o sözlərin düzümü, düşüncələrə, duyğulara, insanın ruh halına təsir edib sığal çəkən o sözlərin musiqisi və bu musiqi altında doğulan həyəcanlı ifadə, gərgin pafos və s. möcüzəvi keyfiyyətlər olmuşdur. Yenə bu səbəbdən şeir adlı bu melodik parçalar asan əzbərlənir, məclislərdə ruh oyadan tərzdə ifa edilir, anaların könlünə köçür, körpələrə söylədiyi sakitlik və təskinlik yaradan laylalara çevrilir.

Sovet illərində kölgədə qalan, lakin XIX əsr milli poeziyanın əsasını qoyan şair və yazıçılarımıza aid edə biləcəyimiz Seyid Həmzə Nigarinin əsərləri ana dilimizin həm dil, həm ifadə zənginliyinin bariz nümunəsidir deyə bilərik. Müstəqilliyimizin bizə qazandırdığı mənəvi sərvətlər içərisində Nigari şəxsiyyəti və irsinin tanınması, onun öyrənilib araşdırılması işi oldu. Bu zamandan etibarən şairin bir-birinin ardınca çap olunan "Seyid Nigari divanı"¸ "Nigarnamə"¸ "Saqinamə"¸ "Həşt-Behişt"¸ "Çaynamə"¸ "Mənaqibi Seyyid Nigari" kimi əsərləri tədqiqat obyektinə çevrildi. Şairin kimliyi, həyat və yaradıcılığına aid ölkə daxilində və Türkiyədə simpoziumlar təşkil edildi. Mənim də görülən bu böyük işlərə əlavəm şairin AMEA-nın Nəsimi adına Dilçilik İnstitutunda hazırlanıb çap olunan divanının (2010) dili üzrə çalışmam oldu. Topladığım dil materiallarının zənginliyi göstərdi ki, Nigarinin istifadə etdiyi, bəhrələndiyi poetik fiqurların miqyası genişdir. Bu fiqurlar içində poetik obrazlılığa xidmət edən səs, ritm, intonasiya sənətkarlığın ayrılmaz mühüm parçasına çevrilə bilmişdir.

**İstifadə edilmiş ədəbiyyat**

1. Kazımov Q. (1997). Sənət düşüncələri. Bakı, Kitab Palatası. 575 s.
2. Tanrıverdi Ə. (2008). Poeziyanın dili, dilin poeziyası. Bakı, Elm. 206 s.
3. Çetişli İ. (2010). Metin tahlillerine giriş. Şiir. Ankara, Akçağ yayınları. 286 s.
4. Nərimanoğlu K. V. (2005). Özümüz, sözümüz. Çinar-Çap, Bakı.
5. Kaplan M. (2006). Şiir tahlilleri. 1 − 2 ciltler. İstanbul, Dergah yayınları. 235 s.
6. Haqverdioğlu M. (2018). Hüma-yi Arş adlı Mir Hamza Nigari menakipnamesindeki şiirler IV Beynəlxalq Həmzə Nigari Azərbaycan Cümhuriyyətinin Quruluşunun 100-cü ilində Türkiyə – Azərbaycan əlaqələri simpoziumu. 25 – 27.10.2018. Amasiya, Türkiyə, s.100 – 135.
7. Hüseynov M. (2008). Dil və poeziya. Bakı, Elm yayınları.
8. Hüseynov M. (2010). Səsin poeziyası. Bakı, Elm və təhsil. 435 s.
9. Nigari Divanı. (2010). (Nəşrə hazırlayan Nəzakət Məmmədli). Bakı, Elm və təhsil.
10. Xudiyev N. (2018). Azərbaycan ədəbi dili tarixi. Bakı, Elm və təhsil. 688 s.
11. Çetin N., Gülendam R., Narlı M. (2011). Tanzimatdan bugüne yeni türk edebiyyatı. Şiir çözümlemeleri. Ankara, Kesit yayınları. 377 s.
12. Paşayeva S. (2018). (Mir Həmzə Seyid Nigarinin təriqət lirikasında xalq poeziyasına münasibət – IV Beynəlxalq Həmzə Nigari Azərbaycan Cümhuriyyətinin Quruluşunun 100-cü ilində Türkiyə – Azərbaycan əlaqələri simpoziumu. 25 – 27.10.2018. Amasiya, Türkiyə, s. 291 – 296).
13. Əliyev R. (2008). Ədəbiyyat nəzəriyyəsi. Bakı, Mütərcim. 360 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2024, № 3 (281), 94–105
doi.org/10.48445/w8130-6015-5357-z

A Z Ə R B A Y C A N   Ə D Ə B İ Y Y A T I

# Mirzə Şəfi Vazehin yaradıcılığında multikultural dəyərlər və tolerantlıq

***Pərixanım Soltanqızı (Hüseynova)***
Filologiya üzrə fəlsəfə doktoru, dosent, Ədəbiyyatın tədrisi texnologiyası kafedrası, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan.
E-mail: huseynovaperixanim1962@gmail.com
https//orcid.org/0000-0001-9391-6162

**XÜLASƏ**
Tədqiqatın obyektini Mirzə Şəfi Vazehin yaradıcılığında multikultural dəyərlər və tolerantlıq təşkil edir. Müəllif bu məqsədlə şairin "Nəğmələr"ini tədqiq edir, "din təəssübkeşləri"ni, xalqlar arasına fitnə-fəsad salan ruhaniləri, qadın hüquqsuzluğunu və s. məsələləri təhlilə cəlb edir. Şairin Bodenştedtlə münasibəti, nəğmələrini tərcümə və çap üçün ona verməsi, Bodenştedtin nəğmələri öz adına çıxarması və s. məsələlərə toxunulur. Məqalədə "Nəğmələr"in digər dillərə tərcümə olunması, bəşəri xarakter daşıması, rus sənətkarlarının şairin şeirlərinə münasibəti də öz əksini tapır. Tədqiqatçı burada şairin humanizmini, digər xalqlara, onların dinlərinə tolerant münasibətini araşdırır. "Nəğmələr"də yəhudi peyğəmbəri Musanın, xristian peyğəmbəri İsanın xatırlanması şairin digər dinlərin müqəddəslərinə münasibətinin, təzahürü kimi şərh edilir. Şairin pedaqoji fəaliyyəti, dərslik müəllifi kimi üzləşdiyi çətinliklər və digər məsələlərin tədqiqatda problem kimi qoyulması diqqət cəlb edir. Tədqiqatçı elmi polemikaya geniş yer verir, fikir və mülahizələrini sitatlar üzərində əsaslandırır.

**AÇAR SÖZLƏR**
poetika, realizm, maarifçilik, humanizm, tolerantlıq

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 18.07.2024
Qəbul edilib: 28.08.2024

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2024, NO. 3, VOL. 281, 94–105
doi.org/10.48445/w8130-6015-5357-z

AZERBAIJANI LITERATURE

# Multicultural Values and Tolerance in Mirza Shafi Vazeh's Works

***Parikhanim Soltangizi (Huseynova)***
Doctor of Philosophy in Philology, Assosiate Professor, Department of Literature Teaching Technology, Azerbaijan State Pedagogical University. Azerbaijan.
E-mail: huseynovaperixanim1962@gmail.com
https//orcid.org/0000-0001-9391-6162

**ABSTRACT**
The object of the research is multicultural values and tolerance in the works of Mirza Shafi Vazeh. For this purpose, the author studies the poet's "Songs", "religious fanatics", clerics who cause mischief between peoples, women's rightslessness, etc. brings issues into analysis. The poet's relationship with Bodenstedt, giving him his songs for translation and printing, Bodenstedt publishing the songs under his own name, etc. issues are addressed. The translation of "Songs" into other languages, its human character, and the attitude of Russian artists to the poet's poems are also reflected in the article. Here, the researcher examines the poet's humanism, tolerant attitude towards other peoples and their religions. The mention of the Jewish prophet Moses and the Christian prophet Jesus in "Songs" is interpreted as a manifestation of the poet's attitude towards the saints of other religions. The pedagogical activity of the poet, the difficulties he faced as a textbook author, and other issues as a problem in research attract attention. The researcher gives ample space to scientific polemics, bases his ideas and opinions on quotations.

**KEYWORDS**
poetics, realism, enlightenment, humanism, tolerance

**ARTICLE HISTORY**
Received: 18.07.2024
Accepted: 28.08.2024

**Giriş**

Mirzə Şəfi Vazeh (1794 − 1852) Gəncədə, Cavad xanın memarı və bənnası olan Kərbəlayi Sadıq kişinin ailəsində dünyaya gəlmişdir. O, Gəncə mədrəsəsində oxuduğu zaman atası vəfat edir. Gəncədə yaşayan, irfani təhsil almış Hacı Abdulla adlı bir şəxs onu himayəsinə götürür. Mirzə Şəfinin elmə, təhsilə marağını görən Hacı Abdulla maddi cəhətdən ona yardım göstərir, onda dini xurafata qarşı nifrət yaradır.

Gəncə mədrəsəsində təhsil alan Mirzə Şəfinin dinə qarşı münasibətində dəyişikliyi hiss edən ruhanilər ona dərs verməkdən imtina edirlər. Beləliklə, şair mədrəsədən uzaqlaşıb fərdi yolla təhsilini davam etdirir. Fars, ərəb dilini, hüsnxəti mədrəsədə öyrənən Mirzə Şəfi bu dilləri mükəmməl mənimsəyir və onların vasitəsilə Xəyyamı, Sədini, Hafizi, Nizamini öyrənir. O, Hacı Abdullanın vasitəsilə Cavad xanın qızına mirzəlik edir (kənd və mülklərin idarə olunmasında). Bir müddət sonra Püstə xanımın qardaşı ilə İrana qaçması nəticəsində işsiz qalır. Bu hadisə Hacı Abdullanın ölümünə təsadüf etdiyindən onun vəziyyəti daha da ağırlaşır. Bundan sonra şair Gəncədəki mədrəsədə uşaqlara nəstəliq xətti ilə yazıb-oxumağı öyrədir. Beləliklə, o, Gəncədə müəllim, xəttat, həmçinin şair kimi də şöhrət qazanır. Görkəmli mütəfəkkir Mirzə Fətəli Axundzadə də ondan nəstəliq xətti öyrənən tələbələrinin sırasında olur. Ruhani olmaq istəyən M. F. Axundzadənin mövqeyini dəyişdirən də məhz Mirzə Şəfi Vazeh olur. Şair Mirzə Fətəlinin realist, maarifçi və filosof kimi yetişməsində, inkişafında əhəmiyyətli rol oynayır.

1840-cı ildə Mirzə Şəfi Gəncə şəhərindən Tiflisə köçür və Mirzə Fətəlinin dəstəyi sayəsində Tiflis qəza məktəbində Azərbaycan və fars dilləri müəllimi kimi pedaqoji fəaliyyətini davam etdirir. O yalnız altı ildən sonra bu şəhəri tərk edir. Bu zaman o, fars dilində "Tiflisə əlvida" şeirini qələmə alır. Bir müddət sonra yenidən Gəncəyə dönən şair burada, dövlət qəza məktəbində müəllimlik edir, bununla yanaşı bədii yaradıcılıqla da məşğul olur. O, Gəncədə böyük nüfuz sahibi olan Seyid Yəhya adlı şəxsin qızı Seyid Nisə ilə evlənir.

1850-ci ildə Tiflisə qayıdan sənətkar zadəganlar gimnaziyasında Azərbaycan dili müəllimi kimi işə qəbul olur və ömrünün sonuna kimi həmin təhsil ocağında çalışır. 1852-ci ilin noyabr ayının 28-də Tiflis şəhərində vəfat edir və burada da dəfn olunur. Mərhum alim Mikayıl Rəfili yazır: "Tənha, unudulmuş, soyulub talan edilmiş bir halda vəfat etdi. Lakin onun bəzi şeirləri xalqın hafizəsində, həmçinin əlyazmaları şəklində qalaraq, Avropa dillərinə tərcümə edilərək şairə dünya şöhrəti qazandırdı".

**Əsas hissə**

Mirzə Şəfi Vazehin nə ədəbi-bədii fəaliyyətində, nə də müxtəlif milli mənsubiyyətə məxsus insanlarla münasibətində etnik baxımdan fərqlilik olmuşdır. O, müxtəlif dinlərə məxsus insanlara eyni gözlə baxmış, xalqlar arasında nifaq toxumu səpən fanatik ruhanilərə hər zaman nifrət bəsləmişdir. Tiflisdə yaşadığı zaman azərbaycanlılarla yanaşı, gürcü, rus və digər xalqların ziyalıları ilə tanış olmuşdur. Bu da onun dünyagörüşünün inkişafına təsirsiz ötüşməmişdir.

Rus, Qərbi Avropa klassiklərini oxumuş, rus şairi B. Beltmanın "Aydın fəcri nə üçün duman bürüdü" şeirini fars dilinə tərcümə etmişdir. 1844-cü ildə açdığı "Divani-hikmət" adlı ədəbi məclisdə tələbəsi, Tiflis şəhərində müəllimlik edən Fridrix Bodenştedt də məclisin üzvü kimi iştirak etmişdir. O, Şəfidən fars dilini, Mirzə isə ondan Qərbi Avropa klassiklərini (Göte, Heyne, Şiller Tomas Mur, Bayron və b.) öyrənmişdir. Fridrix Bodenştedt Almaniyanın Hannover şəhərindən idi. O, Rusiyaya, sonra da Qafqazın baş hakimi general Neydtqartın dəvəti ilə Tiflisə gəlmişdi.

Mirzə Şəfi Vazeh əlyazmalarını Bodenştedtə bağışlamış, o da şairin şeirlərini Almaniyada çap etdirmişdir. Şairin şeirləri Almaniyadan başqa digər xalqların – ingilis, fransız, italyan, isveç, ispan, norveç, çex, yəhudi, rus və s. dillərə tərcümə edilərək yayılmışdır. Rus dilinə M. Mixaylov, B. Markov, M. Ramşev, N. Eyfert və b. tərəfindən tərcümə edilmişdir. Görkəmli rus yazıçısı L. N. Tolstoy da şairin "Şərqilər"inə öz münasibətini bildirərək demişdir: "Orada gözəl şeylər vardır" [7, s. 14].

Şairin şeirlərinin geniş yayılması F. Bodenştedtin niyyətini dəyişdirir. O, ustadına xəyanət edərək şərqiləri öz adı ilə çap etdirir. Şagirdinin namərdliyi üzündən şair uzun illər unudulur və tanınmır. Nəhayət ki, sovet dönəmi tədqiqatçıları tərəfindən "Şərqilər" öz müəllifini tapır. Məlum olur ki, yalançı müəllifin işi ancaq "Şərqilər"i alman dilinə tərcümə etmək və yaymaqdan ibarət olmuşdur. Bu səbəbdən şairin şərqiləri başqa xalqların dillər əzbəri olsa da, öz xalqı arasında onların az bir qismi tanınır. Şairin ilk tədqiqatçısı olan Salman Mümtaz onun şeirlərinin bir qismini – Azərbaycan dilində yazılmış bir müxəmməsini, bir qəzəlini, bir qitəsini, üç beytini, fars dilində yazılmış üç qəzəlini və bir məktubunu üzə çıxararaq toplu şəklində 1926-cı ildə Bakıda "Kommunist" qəzeti nəşriyyatında "Mirzə Şəfi Vazeh" adı ilə çap etdirir.

Mirzə Şəfi haqqında həqiqətlərin ortaya çıxarılmasında, onun bədii yaradıcılığının öyrənilməsində ədib və ədəbiyyatşünas alimlərdən M. F. Axundzadənin, M. Rəfilinin, F. Köçərlinin, M. Qasımovun, X. Yusiflinin, F. Veysəllinin, F. Qasımzadənin, A.Makovelskinin, Ə. Əhmədovun və b. əhəmiyyətli xidmətləri olmuşdur.

Mirzə Şəfi Vazehin şeirləri "Mirzə Şəfinin şərqiləri" adı ilə ilk Almaniyada (1851),

sonra Moskvada (1880), daha sonra isə Azərbaycanda (1924) nəşr olunur. Elmi ədəbiyyatda qeyd olunduğu kimi, "Mirzə Şəfinin şərqiləri" bu günədək 300 dəfədən artıq çap olunub. 1961-ci ilin nəşri əsasında 2004-cü ildə 25000 tirajla, tam toplu halda isə 2019-cu ildə Xalq Bank tərəfindən çap edilib.

Mirzə Şəfi bəşəri şairdir. Əsərləri dünyəvi mahiyyət daşıdığına görə digər xalqların az bir müddət ərzində rəğbətini və sevgisini qazanmışdır. Bu sevginin digər səbəbi isə əsərlərində reallığı tərənnüm etməsidir. Həyatı, insanları sevən şair ömrün qısa olduğunu, ölümün günü-gündən yaxınlaşdığını düşünərək onu sevməyi, sabaha nikbin, ümidlə baxmağı, yaşamağı qənimət bilməyi, ondan ürəyi istədiyi kimi istifadə etməyi insanlara tövsiyə edir:

Özünü şux göstər, özünü saxla,
Getməsin üzündən təravət əsla.
Amma düşünmə ki, ölüm nə gəzir?
O durar qapında bir gün müntəzir
[3, s. 37].

Şair özünün dediyi kimi, yalnız gözəllikləri vəsf edir. Başqaları müharibələri, şahı və məscidi mədh etdikləri halda, o, şərabı, qızılgülü və sevgini tərənnüm edir:

Şərab məclisində, gül məclisində,
Dodaq məclisində, dil məclisində,
Verərkən hürilər şirin busəni,
Şeytanın lənəti qorxutmur məni.

Cəhalət içində olmuşdum sərsəm,
Qocalıb getmişdim ürəyimdə qəm.
Gümrah cavan etdi yenidən məni,
Bir mey, bir məhəbbət, bir də ki, nəğməm.

Mey iç, Mirzə Şəfi, dayanma, gəl boş,
Ol meylə, sevdayla, nəğməylə sərxoş.
Yalnız nəşə çağı coşar nəğmələr,
Odur ki, ey nəğməm, nəşələnib coş.

Şair deyir: "Ey eşqdə sabitqədəm olan! Eşqdən başqa ayrı yolla getmə! Məndən qəmzədən, yarın üzündən başqa bir şey soruşma! Mənə ürəyi sınıqlı dildarın söhbətindən başqa ayrı bir söhbət eləmə! Mənim ürəyimin məhrəmi və sirri ancaq odur".

Nə qədər kim, fələyin sabitü səyyarəsi var,
Ol qədər sinədə qəmzən oxunun yarəsi var.

Şair bu misralarla demək istəyir ki, nə qədər ki göy cismi günəşin ətrafında fırlanıb işıq salacaq, o qədər də mənim ürəyimə yar qəmzələri ilə yarələr vuracaq.

Həqiqəti həyatda görməyən şair onu öz şərqilərində axtarır. O, insanları sevir, insanı poeziyasının fövqünə qaldırır, şeiriyyətinin əsas qəhrəmanı da, idealı da insandır. O, insana sevdalıdır. Bu sevdada ağılla qəlb arasında qalır, onlar arasında təzad yaradır:

Ağlım gecə-gündüz yazıq qəlbimi,
Daima danlayar, daima söyər.
Qəlbimsə sevdaya bir həris kimi,
Daima istəyər, daima sevər.

Eşq dərdidir məni yaxan-yandıran,
Sormayın, kim imiş o ismi pünhan.
Hicran zəhərin də daddım sonunda,
Sormayın, kim imiş onu daddıran.

Mirzə Şəfi bir maarifçi olaraq əsərlərində şeytanı, cənnəti, cəhənnəmi rədd edərək dini xurafatı və cəhaləti tənqid edir. "Teymur", "Dərviş", "Sədi və şah", "Sual-cavab", "Hacı Mirzə Ağası" haqqında həcvləri və əsərlərinə görə ruhanilər ona qənim kəsilir. Hətta Gəncə axundu Molla Hüseyn Pişnamazzadə onu kafir adlandırır: "Sən öz laməhzəb şeirlərinlə cavanların əxlaqını pozursan!" Bu əsərlər eyni zamanda Mirzə Şəfi Vazehin satirik şair olduğunu göstərir. Bir satirasında Müfti haqqında deyir:

Bizi cəhənnəmlə qorxudur Müfti,
Qorxmaz boş sözlərdən ağıllı insan.
Müftinin nə qədər olsa əfsunu,
Uymaz Mirzə Şəfi ona heç zaman!

O, məscidi tərif edən şairlərə nifrətlə səslənir:

Nəğməsindən məscid havası gələn şairlərin,
Başları boşdur yəqin, ağılları deyil dərin
[3, s. 46].

Şair lirik şeirlərində qadın hüquqsuzluğuna qarşı çıxır, qadın azadlığını təbliğ edir:

Bizlərdən bir kişi, bir qadın sevsə,

O, gözəl bir dost sayılar və ona
Nöqsan tutmaq yaxşı görünməz.
Bəs nə üçün qadın bir kişini sevsə,
Dünyanın gözünə xar və pozğun görünər?!

Kişi sevə bilər, nə istəsə edə bilər, bu onun haqqıdır, günah sayılmaz, cəmiyyət, qanunlar kişiyə xor baxmaz, pozğun deməz, lakin qadına sevmək yasaqdır, əks təqdirdə bu, günah sayılar, ona "pozğun" deyilər. Hər iki cins arasında qoyulan fərq şairi düşündürür: nə üçün biri azad, digəri kölədir?! Şair çadraya qarşı çıxır. Bəşəriyyətin gözəlliyi görməkdən məhrum olmasına, qadının çadra altında gizlənməsinə, saralıb-solmasına etiraz səsini ucaldır: "Səni qadir Allah, ey incə çiçək, yaratmış dünyaya verməkçün bəzək".

Sevgi, məhəbbət və qadın gözəlliyi Mirzə Şəfinin bu mövzuda yazdığı şeirlərinin əsas ideyasını təşkil edir:

Kobud əllər toxunmasın gözəlliyə, almaza gərək,
Əsl almaz qaşı mütləq cilalansın almaz tək gərək.

Göy üzünü bəzəyirsə al günəş necə,
Qəlb evimi bəzəyirsən sən də eləcə.
Yetmişəm sayəndə mən bu səadətə,
Könlüm bil ki, düçar olar sənsiz zülmətə.

Lakin mənə küləkdən, tufandan, sudan
Bütün qüvvələrin hamısından inan,
Bir güclü qüvvə var, bir güclü nəsim,
Sənin məlahətli, incə nəfəsin!

Mirzə Şəfi şərqilərinin mövzu əhatəsi geniş və müxtəlifdir. Azadlıq, gözəllik, qadına, insana məhəbbət, dini xurafata, cəhalətə, ikiüzlü ruhanilərə nifrət və s. mövzular bu gün də əxlaqi mahiyyəti ilə aktual və əhəmiyyətli olub, ictimai-siyasi və fəlsəfi xarakter daşıyır. Şairin şeirlərində həm coşqun hiss, həm də dərin fikir vardır. Onun şeirlərini oxuyarkən qarşımızda ürək çırpıntısı ilə yazan lirik bir şairi, həm də dərin düşünən bir mütəfəkkiri görürük [2, s. 187].

Sənətkar şeirlərində əməyə münasibətini, məhəbbətini ifadə edir. İnsana miras qalan var-dövləti o qədər də əhəmiyyətli hesab etmir. Əməklə, alın təri ilə qazanılanı insan üçün şərəf sayaraq deyir:

Mal-dövlət vərəsəlik olsa da asan,
Zəhmət çəkib bir ev tikmək müşküldür yaman.
Babaların, nənələrin şanı-şöhrəti,
Nəvələrin qürurunu artırar qəti!

Lakin verər insanlara əsl ləzzəti,
Öz əliylə qazandığı varı-dövləti
[3, s. 36].

Şair gənclərə tövsiyə edir ki, ata-babalardan, nənələrdən qalan ev-eşik, var-dövlət, ad-san, şöhrət qürurverici olsa da, onlarla fəxr etsəniz də, sizə qalan miras gözünüzü örtməsin. Zəhməti sevin, zənginliyinizi, ev-eşiyinizi əməyinizlə özünüz qurun, onlar kimi əllərinizin zəhməti ilə yaşayın, şöhrət qazanın, əməyinizin sayəsində ucalın!

Xalq ədəbiyyatından bəhrələnən şairin fikirləri – "fərli oğul neynir ata malını, fərsiz oğul neynir ata malını" – el məsəlini xatırladır. Fərsiz oğul ata malını talan edər, fərli oğul isə mirasın qədrini bilər, onu qoruyar, öz alın təri ilə var-dövlət üstünə var gətirər, xoşbəxt, firavan ömür sürər. Şairin bu fikirləri gələcək nəsillərə əxlaqi-tərbiyəvi nəsihətlərdir.

Ədib "Sərv ağacı" şeirində həm özünün, həm də xalqının azadlıq arzularını dilə gətirir:

Azadlıq rəmzidir şux sərv ağacı,
Əyilib budağı toxunmaz yerə,
Tökülməz yarpağı, əyilməz qəddi
Bilməz bu dünyada riyakarlığı.

Bir yaşıl qüllədir – ümid qülləsi,
Ucalıb təpəsi ərşə dayanar.
Altında gəmirər qurdlar məzarı,
Üstündə ulduzlar sayrışıb, yanar.

Sənətkar şeirdə xalqın vüqarlı, əyilməz qamətini, riyakarlıqdan uzaq haqq-ədalət səsini canlandırır. Lakin onun da dünyagörüşü dövrünün maarifçi realistləri kimi ziddiyyətlidir. Azadlıq uğrunda necə mübarizə aparmaq lazımdır? Onun yolunu görmədiyindən göstərə bilməmişdir. "Onun tərənnüm etdiyi azadlıq ideyaları dumanlı və müəyyən dərəcədə mücərrəd mahiyyət daşıyırdı" [2, s. 95].

Mirzə Şəfi elə bir dövrdə yaşayırdı ki, bu zaman dini ehkam xalqlar arasına nifaq toxumu səpir, din təəssübkeşləri müxtəlif dini təmsil edən gənclərin eşqinə mane olur, insanların qəlbinə cənnət və cəhənnəm xofu salırdılar. Şair əsərlərilə onlara qarşı

mübarizə aparırdı. Onun erməni qızına ithaf etdiyi "Süsəni" rədifli müxəmməsi, fars dilində yazdığı aşiqanə məktubu bu silsilədəndir. Şair şeirdə bədii təsvir və ifadə vasitələrinin poetik imkanlarından istifadə edərək erməni qızının bitkin, gözəl bir obrazını yaradır. Müsəlman aşıqinin hiss və duyğularını, həyəcanlarını qələmə almaqla eşqinin aliliyini, təmizliyini, reallığını göstərir. Onu dünya gözəlləri ilə qiyas edərək "gözəllik taxtının sultanı" adlandırır:

Ey nəzakət çəməni içrə xuraman Süsəni,
Xublıq kişvərinin təxtinə sultan Süsəni,
Sədəgin yayı qaşın sədəqəsi qurban Süsəni.
Bir baxışla yaraşur kim, ala qüz can Süsəni,
Belə getsə, tez olur dillərə dastan, Süsəni.

Ey mələk, əbr üzün gündümü, ya bədritamam?
Kim ki, ruyindən olur məst, ona badə həram,
Pərdəsiz cilvələnib, naz ilə ver qəddə qiyam,
Küfri-zülfün dağıdıb, məst çıxıb, eylə xüram,
Bilələr ta ki, nədir küfr ilə iman, Süsəni.

Şair vəsf etdiyi gözəli onun mənsub olduğu xristian dininin peyğəmbəri İsa Məsihlə müqayisə edir. "Edə gər zində ləbin ləfzi Məsiha yaraşır" – şirin danışığı ilə xristian sevgilisini İsa Məsihin nəfəsi və dodaqlarından çıxan söz kimi aşiqinə nəfəs, həyat verdiyini təcəssüm etdirir.

Göründüyü kimi, Vazehin xristian qızının gözəlliyini vəsf etməsi, onun zahiri portretini yaratması, İsa Məsihlə müqayisə etməsi, nəsturi xalqının dininə hörmət və məhəbbətinin ifadəsidir. Müsəlman oğlanın ona olan dərin məhəbbətini dini etiqada qarşı qoyur:

Gün ki, hər gün ki, çıxar dərgahinə səcdə edər,
Sərv rəftarə gəlür, qılsa qədin bağə güzər.
Qönçə gər ağzın ilə qarşu dura boynu əyər,
Küfri eşqin yetişib bir yerə kim, ey kafər,
Desələr Vazehə böhtandı müsəlman, Süsəni! [3, s. 61]

Şair başqa bir şeirində yəhudi peyğəmbəri Musanı xatırladır:

Səbzpuş olmuş qədin rüxsari-atəşgunilə,
Musiyi-imranə guya, tur şəklin göstərir.

Şair bu misralarda məşuqənin qəddi-qamətini oda bənzətmiş, necə ki Allah Musaya od şəklində görünürmüş, gözəlin də yanaqlarının qızartısından düşən atəş bütün vücudunu bürüdüyündən aşiqinə "od" şəklində görünür.

Şair dostluq, sədaqət, etibar haqqında yazdığı şeirlərində saf, ülvi hisslərlə bağlı olan dostluğu tərənnüm edir:

Gülüstandan əsib gələn ətirli külək,
Əziz dostum, söylə sənə vermirmi ürək?
Niyə onda bir xoş xəbər eşidəndə sən,
Özgəsinin sevincinə sevinməyəsən?

Və yaxud:

Deyirəm dost ayağına dəyən daş,
Ona yox, sinəmə dəysin mənim kaş.

Dostlar bir-birinin xoş gününə sevinməli, kədərinə şərik olmalıdırlar. Dostuna toxunacaq bir ziyanı, ağrı-acını ona qıymayıb özünə rəva bilənlər əsl dostlardır. Bu sətirlər "əsl dost necə olmalıdır?" fikrini xarakterizə edir. Ümumiyyətlə, şairin bu mövzu ilə bağlı şeiriyyətində eşqin təməlində bir dostluğun fəlsəfi düşüncəsi ifadə olunur.

Çadırda oturan gözəl saçların üzündən yığdı,
Məcaz zülmətindən həqiqət nuru parladı.
Göz dost üzündə, əl yar qoynunda,
Eşq bir tərəfdən, hüsn bir tərəfdən nazü-niyaza başladılar.

Üzünü saçları ilə gizlədən gözəl elə ki saçlarını yığdı, üzü göründü, gecənin zülmətindən həqiqət ortaya çıxdı. Gözlər baxışdı, dostlar qucaqlaşdı, eşqlə hüsn qovuşduqları üçün dua etməyə başladılar.

Mahmud türbətindən cəza günü bu nida qopar:
Əyaz qılıncı ilə ölmüşə, cənnət nə lazım!?

Bu misralarda şair Sultan Mahmud Qəznəvi ilə Əyaz arasındakı dostluğa işarə edir. Yəni sədaqətli, etibarlı dostun qılıncı ilə ölməyin özü bir cənnətdir, xoşbəxtlikdir.

Tilbə könlüm tillər ilə asılıb, tildir səbəb,
Filməsəl, baxqan kəsə Mənsur şəklin göstərir.

Şair burada eşqində və məsləkində fədakar, sədaqətli sufi, əqidəsindən dönməyən şair Mənsur Həllacı xatırladır. Mənsur Həllacı 918 – 919-cu illərdə Xəlifə Müqtədir Billah Bağdad şəhərində dar ağacından asdırmışdır. Elmi ədəbiyyatdan bəllidir ki, Mənsur Həllac Şərq ədəbiyyatında sufi, əqidəsinə sadiq aşiq obrazı kimi simvolik səciyyə daşıyır.

Sən öz mənliyinin dar sarayından
Kənara çıxmasan, ey dostum, inan,
Anla ki, ömründə ola bilməzsən,
Düzlük evində də bir dəfə mehman.

Şair həqiqəti, dünyaya açıq gözlə baxmağı, fikir, məqsəd-mənəviyyat genişliyini şeiriyyətlə, elmlə, kitabla ülfətdə görür. Ədalətə, düzlüyə insanların arasında olmaqla, dünyagörüşünü genişləndirməklə yetişməyin mümkünlüyünü söyləyir. Tövsiyə edir: Gözlərini aç, dünyaya bax, ətrafında nələr baş verir, ədaləti, düzlüyü gör, seyr et! Biliyin, mənəviyyatın zənginləşsin.

Mirzə Şəfi Vazeh maarifçi-realist kimi yalnız dini xurafata, cəhalətə qarşı çıxmamışdır. O, türk uşaqlarının mənəvi inkişafı üçün maariflənməyi, öz ana dillərini bilməyi, molla məktəbindən, köhnə ruhani təhsildən uzaqlaşaraq yeni üsullu məktəblərə cəlb olunmaları, savadlanmaları üçün çalışmış, bu yolda mübarizə aparmışdı.

1950-ci ildən yenidən Tiflisə dönən şair Tiflis şəhər zadəganlar gimnaziyasında Azərbaycan dilini tədris edir. Rusiyanın daxilində olan vilayət gimnaziyalarında yerli dillər, habelə Azərbaycan, fars dilləri keçirilmirdi. Zaqafqaziyada açılan gimnaziyalarda isə bu dillər tədris edilirdi. Buna görə də həmin dillərdə yazılmış xüsusi dərsliklərə və ya təlim vəsaitlərinə böyük ehtiyac yaranırdı. Bu xüsusatda Bakıxanovun “Qanuni-Qüdsi” kitabı fars dilinin tədrisində əhəmiyyətli dərslik idi. Lakin şagirdlərin maariflənməsi üçün Azərbaycan dilində vəsait yox idi. Bu zərurəti görən M. Ş. Vazeh azərbaycanca dərs vəsaiti tərtib etməyi öz üzərinə götürərək gimnaziyada fars dilindən dərs deyən İ. Qriqoryevlə birlikdə Azərbaycan dilinin ilk dərs vəsaiti və poeziya müntəxəbatı – “Kitabi-türki” tərtib edir. Müntəxəbat nəşriyyat çətinlikləri səbəbindən əsas müəllif olan şairin ölümündən sonra nəşr olunur.

İki hissədən ibarət tərtib olunmuş müntəxəbatın I hissəsi gimnaziyanın yuxarı sinif, II hissəsi isə aşağı sinif və qəza məktəbləri şagirdləri üçün nəzərdə tutulmuşdur.

Müntəxəbatın əvvəl II hissəsi lüğətlə birlikdə 1855-ci ildə İ. Qriqoryev tərəfindən Təbrizdə nəşr olunaraq gimnaziyanın aşağı siniflərində və qəza məktəblərində dərslik kimi istifadə olundu. I hissə bütünlüklə 1856-cı ildə nəşr olunsa da, Peterburq

Universitetinin əksər professorlarının mənfi rəyinə görə dərslik kimi istifadəyə verilmədi. Bu da səbəbsiz deyildi. Müntəxəbat lüğətdən başqa üç bölməyə ayrılırdı. Birinciyə ərəb-fars dillərindən Azərbaycan dilinə tərcümə olunmuş məqalə, əxlaqi-tərbiyəvi nəsihətlər və təmsillər daxil idi. Burada Mirxondun "Rövzətüs-səta" əsərindən Şərqin ən qədim dövrlərindən islamın yaranmasına qədər olan qısa tarix haqqında məlumat verilmişdir. İkinci hissədə "Qarabağnamə"dən, "Dərbəndnamə"dən tərcümələr verilmiş, üçüncü hissə isə Füzulinin "Leyli və Məcnun" əsərindən seçilmiş nümunələrdən ibarət idi. Müəlliflər Füzulidən salınmış nümunələrin bədiiliyini, tərbiyəvi-əxlaqi əhəmiyyətini, gənclərin tərbiyəsində rolunu, onlara mənəvi-estetik zövq aşılayacağını nəzərə almışdılar. M. Ş. Vazeh bununla da Azərbaycan dilində ilk dərs vəsaitinin müəllifi oldu. Bu yolu Mirzə Əbdülhəsən Vəzirov, Seyid Əzim Şirvani, Rəşid bəy Əfəndiyev, Aleksey Osipoviç Çernyayevski və b. şərəflə davam etdirdilər.

Onun şeirlərində "təzahür edən maarifçilik, realizm – satira xüsusiyyətləri sonrakı dövr ədəbiyyatında inkişaf edərək qüvvətli ədəbi cərəyana çevrilmişdir" [2, s. 197].

## Nəticə

Mirzə Şəfi humanizmliyi, realizmliyi, maarifçiliyi, pedaqoji fəaliyyəti, bütün ədəbi yaradıcılığı, şeiriyyəti ilə Azərbaycan ictimai fikrinin inkişafında böyük xidmət göstərmişdir. Əsrlər ötəcək, lakin ədibin ideyaları əbədi olaraq yaşayacaqdır.

## İstifadə edilmiş ədəbiyyat

1. XIX əsr Azərbaycan ədəbiyyatı tarixi. (1963). Azərbaycan SSR EA. 485 s.
2. Qasımzadə F. (2017). Bakı, Elm və təhsil. 552 s.
3. Mirzə Şəfi Vazeh. (2004). Nəğmələr. Bakı, Şərq-Qərb. 95 s.
4. Mirzə Şəfi Vazeh. (2019). Bütün əsərləri I nəşr (4 kitabda). Xalq Bank. Bakı, 464 s.
5. Mümtaz S. (1926). Mirzə Şəfi Vazeh. Bakı.
6. Yenikolopov I. K. (1938). Poet Mirza Shafi. Baku.
7. Tolstoy L. N. (1934). Polnoye sobraniye sochinenii.
8. Rafili M. (1958). Mirza Shafi v mirovoy literature. Baku, Azerneshr.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2024, № 3 (281), 106–113
doi.org/10.48445/f0415-3700-1152-j

A Z Ə R B A Y C A N   Ə D Ə B İ Y Y A T I

# Cəlil Məmmədquluzadənin "Anamın kitabı" əsərində isimlərin etimoloji təhlili

***Zülfiyyə Kərimova***
Magistrant, Bakı Avrasiya Universiteti. Azərbaycan.
E-mail: zulfiyyasuleyman@gmail.com
https://orcid.org/0009-0007-8013-6889

**XÜLASƏ**
Dil ictimai xarakterə malik hadisə və əsas etibarilə cəmiyyətin varlığıdır. Azərbaycan dili rəngarəng və zəngin semantik sistemə malik dillərdəndir. Azərbaycan dilinin lüğət tərkibinin zənginliyini ehtiva edən söz qruplarından biri də *isimlərdir*. Kök sözlərin araşdırılmasında etimoloji tədqiqatlara xüsusi üstünlük verilmişdir. Tədqiqatlar göstərir ki, təkhecalı isim kökləri çoxhecalı isim köklərə nisbətən daha qədimdir. Əksər çoxhecalı isimlər məhz təkhecalı köklər əsasında formalaşmışdır. Bununla da, çoxhecalı isimlər xüsusi inkişaf mərhələsi keçərək dilin lüğət tərkibini zənginləşdirmişdir. Məqalədə Cəlil Məmmədquluzadənin "Anamın kitabı" əsərindən təqdim edilən nümunələr əsasında isimlərin etimoloji təhlili aparılır.

**AÇAR SÖZLƏR**
isim, kök, etimologiya, semantika

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 17.07.2024
Qəbul edilib: 22.08.2024

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2024, NO. 3, VOL. 281, 106–113
doi.org/10.48445/f0415-3700-1152-j

AZERBAIJANI LITERATURE

# Etymological Analysis of Nouns in Jalil Mammadguluzade's "My Mother's Book"

***Zulfiyya Karimova***
Master student, Baku Eurasian University. Azerbaijan.
E-mail: zulfiyyasuleyman@gmail.com
https://orcid.org/0009-0007-8013-6889

**ABSTRACT**
Language is a phenomenon of a social nature and basically an existence of society. The Azerbaijani language is one of the languages with a colorful and rich semantic system. Nouns are one of the word groups that contain the richness of the vocabulary of the Azerbaijani language. Special preference was given to etymological studies in the study of root words. Studies show that monosyllabic noun roots are older than polysyllabic nouns. Most polysyllabic nouns are formed from monosyllabic roots. With this, polysyllabic nouns have passed a special stage of development and enriched the vocabulary of the language. In the article, an etymological analysis of nouns is carried out based on examples presented from Jalil Mammadguluzade's "My Mother's Book".

**KEYWORDS**
noun, root, etymology, semantics

**ARTICLE HISTORY**
Received: 17.07.2024
Accepted: 22.08.2024

**Giriş**

Dilin lüğət tərkibinin əsasını kök sözlər təşkil edir. Ən qədim kök sözlərdən biri isə *isimlər* hesab olunur.

Tipoloji təsnifə əsasən Azərbaycan dili iltisaqi dillərə aid olub türk dilləri ailəsinə mənsubdur. Türk dillərinin kök sözləri haqqında ilkin məlumatlar Mahmud Kaşğarinin "Divanü-lüğat-it-türk" əsərində verilmişdir. Bu əsər türk dünyasının ilk ensiklopediyası, dil məlumatı kitabıdır. XI əsrdə yaşamış Mahmud Kaşğari qədim türk sözlərinin müxtəlif türk tayfaları arasında fərqli şəkil və mənalarda işləndiyini göstərmişdir.

**Əsas hissə**

Kök sözlərin yaranmasında *səs simvolizmi* əsas nəzəriyyələrdən biridir. Səs təqlidi nəzəriyyəsinə görə, dil insanın təbiət səslərini təqlid etməklə çıxardığı səslərdən təşkil olunmuşdur. Bu nəzəriyyə iki müddəaya əsaslanır: 1) dildə ilk sözlər səs yamsılamaları olmuşdur; 2) sözdə səslənmə rəmzidir, şeylər müvafiq mənaya malikdir [11, s. 256].

İsimlərin semantik dəyişmələrinə və onların etimoloji aspektdən təhlilinə C.Məmmədquluzadənin "Anamın kitabı" əsərində verilən nümunələrə əsasən nəzər salaq.

*"Xanımcan, and olsun Allaha, keçən ay sarı əbrəş kərəni canavar dağıdanda Zaman bir gün axşama kimi tütək çaldı, mən axşama kimi* ***bayatı*** *deyib ağladım"* [10, s. 460].

**Bayatı**

1. Azərbaycan xalq musiqisində həzin bir hava adı. *Bayatı çəkmək (demək) – Külli Qarabağın abi-həyatı; Nərmü-nazik bayatıdır, bayatı* (M. V. Vidadi). ...*Çoban da bayatı nəğməsini tütəyində ucaltdı* (S. S. Axundov).
2. Azərbaycan şifahi xalq ədəbiyyatında nəzm formalarından biri.

Bu bağça bar olunca,
Heyvalar nar olunca,
Çatlayır dəli könlüm
Sən mənə yar olmayınca [1, s. 249].

"Bayatı" sözünün *Bayat* tayfasının adı ilə bağlı olmasına dair bəzi mülahizələr mövcuddur. Görkəmli ədəbiyyatşünas alim Salman Mümtazın fikrincə, bayatıların yaratdıqları ədəbiyyata *bəyatı* adı verilmişdir ki, bu gün belə yurdumuzda məşhur,

hafizəmizdə iz qoyan bəyatılar bəyat elinin hünəri və o xalqın nümunəvi qabiliyyətidir. Bəyatı söyləmək, bəyatı çağırmaq şərəfi bəyatlılara və o istedadlı elə aiddir [5]. Bununla əlaqəli olaraq, professor Bəşir Əhmədov qeyd edir ki, "Göyçə gözəlləməsi" yer adı ilə bağlı olduğu kimi, *bayatı* da tayfa adı ilə əlaqədar ola bilər. İ. Abbasov "Ulu nəğməmizin adı" adlı məqaləsində göstərir ki, *"bayatı"* sözü *ayıtmaq* feili zəminində yaranıb. Bu söz həm forma, həm də mənaca dəyişmiş variantda başqa dillərdə də işlədilir: ukraynalılarda *bayatı*, çexlərdə isə *bayiti* "danışmaq" anlamını əks etdirir. Rusların *bayu* sözü də elə "danışmaq" sözü ilə bağlıdır. Bunlar *ayıtmaq* feili ilə bağlı kəlmələrdir [5, s. 41]. "Kitabi-Dədə Qorqud" dastanında işlənmiş "boy-boylama" ifadəsi də *söz söyləmək, demək* mənalarına uyğun gəlir. Bayatı-Kürd muğamının adında olan *bayatı* ifadəsi də oxunma üsulu kimi bu mənaya daha çox yaxındır.

"Anamın kitabı" əsərində verilən digər bir nümunəyə diqqət edək.

*"...otaqda oturub tək Rüstəm bəy öz yerində;* ***gözlərində*** *çeşmək, oxuyub yazmaqla məşğuldur"* [10, s. 438].

**Göz**

Türk dillərində *qöz//güz//kös//qüz* formalarında işlənir. Bu isim etimoloji baxımdan *gö+z* şəklində formalaşmışdır. Adətən, türkologiyada -z cəmlik, ikilik bildirən şəkilçi kimi səciyyələndirilir. Məsələn, *biz, diz* sözlərində -z kəmiyyət şəkilçisidir. *Göz* isminin qədim variantı *köz* şəklindədir: *jana iki közi körmaz erti* (onun iki gözü də görmürdü). V. Aslanovun fikrincə, qədim Azərbaycan yazılı abidələrində işlənən *görklü* və *gözəl* sözləri də *"gö"* kökündən yaranmışdır. Hal-hazırda uyğur dialektində *"kö" baxmaq, görmək* mənasında işlənir [11, s. 56].

A. Axundov "göz" sözünün *gör* (daha qədim forması gö:r) feilindən yarandığını ehtimal edir [2, s. 296 – 297]. *Göz* ismi klassik mənbələrimizdə də bu mənanı ifadə etmişdir:

Canda ki, eşq olmadı, dildə xəbər nə faidə?
*Gözdə* ki, görmək olmadı, nuri-bəsər, nə faidə? [15, s. 28]

*Göz* isminin qeyri-türk dillərində də leksik paralelləri mövcuddur. Nümunə olaraq, ingilis dilində işlənən *gaze* sözünün "baxış", "nəzər-diqqət", "baxmaq", "gözləri ilə süzmək" kimi mənalarını göstərmək olar.

[5] https://525.az/news/116753-mugamlarimizda-bayat-gizlincleri-mustafa-cemenli

Əsərdə verilən digər nümunəyə əsasən "kişi" sözünün etimoloji təhlilinə nəzər salaq.

*"A **kişi**, hələ bilmirəm bu nə deyir ey!"* [10, s. 443]

**Kişi**

1. Cinsə görə qadının əksi, erkək. *Mən gözümün ağı-qarası olan bu qızımı bax bu kişiyə ərə verirəm* (Ü. Hacıbəyov);

2. Mərd, namuslu, sözündə sabit adam. *Bu, kişiyə yaraşan hərəkət deyil. – Özünə kişi deyən kimsə sədaqət sənətin işlər* (M. P. Vaqif) [1, s. 714].

Bu sözün türk dillərinin dialekt və şivələrində də ilkin və geniş mənaları mühafizə olunmuşdur. Məsələn, Altay dilinin şimal dialekti olan tuba-kijilərin dilində *kiji* "adam", "ər" anlamındadır [12, s. 102]. Görünür ki, *kişi* isminin semantikası ən çox Azərbaycan dilində daralmışdır.

Bu söz "Oğuznamə"də "insan" anlamındadır: "*Hər kişi kəndü dərdindən söylər"* [13, s. 170]. "Kişi" sözü həm müasir türk dilində, həm də Azərbaycan dilinin digər yazılı abidələrinin dilində "adam", "insan" mənasını bildirmişdir:

*Kişi* yavuz işə etsə bünyad,
Son ucu andan alır haqqın ustad [4, s. 107].

Ərəb dilindən alınma olan "adam", "insan" sözlərinin təsiri ilə Azərbaycan dilində "kişi" ifadəsi məna cəhətdən daralmış və insanın yalnız cinsə görə növünü bildirmişdir.

Bu söz "Kitabi-Dədə Qorqud" dastanında daha çox müasir Azərbaycan dilində işlənən *cins* mənasında işlənmişdir. *"Bəndən alçaq kişiləri ağ otağa, qızıl otağa qondurdu*; *Bənim suçum nə oldu, kim qara otağa qondurdu?*; *Kişi malına qıymayınca adı çıxmaz; Üç kişi sağ yanından, üç kişi sol yanından dəmür zəncirlə buğayı tutmışlardı"* [7, s. 24 – 27].

M. Kaşğarinin lüğətində həmin söz "adam", "insan", "şəxs", "xalq", "qadın" mənalarında verilmişdir [8, s. 305]. M. Kaşğari eyni zamanda qədim türk dillərində "*kis"* sözünün *"qadın", "arvad"* anlamında işləndiyini də qeyd etmişdir [8, s. 305]. Azərbaycan dilinin digər yazılı abidələrinin dilində də *"adam", insan"* mənasını bildirmişdir:

Yamanlıq sansa bir *kişi* işinə,
Son ucu sandıq gəlir başına [4, s. 93].

Bu alınma sözlər digər türk dillərinə keçsə də, həmin dillərdə ilkin məna (insan) mühafizə edilmişdir.

Əsərdən verilən digər nümunələrə diqqət edək.

*"Alıram* ***ağacı*** *əlimə (Qurbanın əlindən çomağı alır)..."* [10, s. 460].

**Ağac**

Bu isim qədim türk yazılı abidələrində işlənən -*ı* "ağac", "kol", "bitki" kökündən yaranmışdır. Yəni *ağac* ismi etimoloji baxımdan *ı+ğac* şəklində formalaşmışdır [11, s. 58]. Qədim türk dilində *ığaç, yığac* şəklindədir [14, s. 37 – 56]. A. Axundov *ağ//aq* ağmaq feilinin kökü kimi "çıxmaq" mənasını bildirən söz olduğunu bildirmişdir: *bulut a:ğdı* (bulud çıxdı). -*ac//-aç* şəkilçisi isə feildən isim düzəldən qədim şəkilçidir: *sıx+ac; tıx+ac*. Belə ki, ağac "ağmaq" feilindən yaranaraq *bitən, çıxan* mənalarını ifadə etmişdir [2, s. 448]. M. Kaşğarinin lüğətində *yığaç* formasında verilmişdir [8, s. 677].

*"Həmişə gəzdiyimiz və yaşadığımız yerlər çəmənlər, laləli və çiçəkli dağlar, daşlar; içdiyimiz nədi?* ***Bulaq*** *suları və pak qoyun südü"* [10, s. 460].

**Bulaq**

1. Yerin altından sızıb çıxan sərin, soyuq su mənbəyi, çeşmə, qaynaq. *Bulaq başdan bulanar* (Atalar sözü). *Camaatın qara su içməkdən hamısının qarnı şişib; çalışıb kəndə bir bulaq gətirmək lazımdır* (Ə. Haqverdiyev) [1, s. 356].

M. Kaşğarinin lüğətində *"bu"* kökü "buxar, buğ" anlamında verilmişdir. Baba Məhərrəmli qeyd edir ki, bulaq ismi "su" kökündən yaranmışdır. Qədim yapon dilində -*bi* kökü "bulaq", "çay", "quyu" mənalarını ifadə etmişdir. Dünya dillərində *b//p* refleksi ilə *bu//pu* "su" kökünün izləri müşahidə olunur. Məsələn, latınca *potus* – içilmiş, *plüo* – yağış yağmaq; yunanca *potoç* – içməli; ingiliscə *pool* – gölməçə, nohur, *bath* – hamam, yuyunmaq, *pour* – axmaq, tökülmək mənalarını bildirir [11, s. 67 ].

*"Dəxi o əsrlər keçibdi ki, qızı zornan istəmədiyi adama* ***ərə*** *verirdilər"* [10, s. 444].

**Ər**

1. Arvadın qanuni və məhrəm yoldaşı olan kişi, zövc. *Dedi kim, bu məzarıdır ərimin; Ol üzü gül, boyu sənubərimin* (S. Ə. Şirvani). *Zeynəb... ərinə* deyirdi: – *Bilmirəm, mən olmasaydım, sən... necə yaşıya bilərdin?* (S. S. Axundov) *Arvad qab dəsmalı ilə yaşarmış gözlərini silib ərinin qabağında döyükə-döyükə qaldı* (S.Rəhman).

2. Sözündə möhkəm, mərd, qəhrəman, igid, qoçaq.

Yaxşılığa yaxşılıq hər kişinin işidir,
Yamanlığa yaxşılıq *ər* kişinin işidir (Atalar sözü) [1, s. 122].

B. Məhərrəmli qeyd edir ki, *"e"* səsinin ulu türk dilində sonralar yarandığını nəzərə alsaq, *"ər"*in *"er"* variantından qədim olması ehtimalı daha real görünür. Deməli, bu sözün praformasını türk dilləri üçün *ər* şəklində rekonstruksiya etmək olar [12, s. 149].

M. Kaşğari *ər* isminin “kişi”, “adam” və “insan” mənalarında işləndiyini göstərmişdir [8, s. 179]. F. Cəlilov qeyd edir ki, bu sözün türk dillərində *ar//er//yər//ey* kimi müxtəlif variantları olmuşdur. Onun fikrincə, *ər* sözü daha dərin qatda “məkan”, “yer”, “hərəkət”, “adam”, “kişi” mənaları üzrə semantik parçalanma keçirmiş *ar//er* morfemi ilə bağlıdır. Bununla yanaşı ehtimal edir ki, alman dilindəki *herr* (knyaz), latın dilindəki *erus//herus* (knyaz) sözlərinin kökündəki *er//her* sözü həmin dillərə daha qədim dövrlərdə türk dilləri ilə əlaqə nəticəsində keçmişdir. Bu sözü geniş regiona çıxaran saklar ola bilərdi, çünki yunan tarixçisi Herodot *ər (eor)* sözünün sak dilində “kişi” anlamında işləndiyini qeyd edir [3, s. 141 – 142].

Ər sözünün qeyri-türk dillərində paralellərinə nəzər salsaq, ingilis dilində *“hero”*, italyan dilində *“eroe”*, rus dilində *“герой”*, portuqal dilində *“heroi”*, fransız dilində *“heros”* “qəhrəman” mənalarını ifadə etmələri *ər* kökü ilə homogen olmasını ehtiva edir.

Qədim mifoloji qaynaqlarda da *ər* isminin izlərinə rast gəlmək mümkündür. Bu fakt da *ər* sözünün ən qədim söz köklərindən biri olduğunu bir daha sübut edir. Təsadüfi deyil ki, yunan mifologiyasında *Ares* adlı müharibə Allahı olmuşdur. Türk dilləri ilə qohumluğu ehtimal olunan etrusk dilinin mətnlərində də *Ares* “ilahi qüvvə”, “tanrı” mənasını ifadə edir. Həmçinin ərəb mifologiyasında *Aarra* “tanrı adı” anlamındadır. Qədim türk etnonimlərindən olan *arıs* adı da *ər//er//ar* kökündən yaranmışdır [12, s. 160].

*Ər* ismi “qəhrəman” mənasını Ucar, Şamaxı şivələrində işlənən “ərdəmli” sözündə qoruyub saxlamışdır. Bu söz uyğun olaraq, “hünərli” mənasında işlənir. *Ər* sözü klassik yazılı qaynaqlarımızda daha çox “kişi” mənasındadır:

*Ərənlər ər* yolunda *ər* tək gərək,
Meydanda ərkək kişi nər tək gərək.
Yaxşı-yaman, qatı-yumşax olsa xoş,
Sərvərəm deyən kişi ərkək gərək [9, s. 12].

“Kitabi-Dədə Qorqud” dastanında *ər* ismi “igid”, “qəhrəman”, “kişi” mənalarındadır:

Qaranqu axşam olanda güni doğan,
Qar ilə yağmur yağanda *ər* kibi duran... [7, s. 41]

Azərbaycan şairi İmadəddin Nəsiminin şeirlərində də *ər* sözü “igid” mənasında işlənmişdir:

Soyun, ey murdar sallaxlar, Nəsiminin tənin,
Bunca namərdi görün bir *ər* qıyarlar ağrımaz [6, s. 308].

**Nəticə**

Cəmiyyətin inkişafı ilə əlaqədar olaraq tədricən dil də inkişaf etmişdir. Bu inkişaf nəticəsində müxtəlif söz kökü formaları meydana gəlmişdir. Aydın olur ki, bu inkişafın əsasında müxtəlif səviyyələrdə özünü göstərən forma və məna keçidləri, ümumilikdə semantik hadisələr də əsas rol oynamışdır. Bu məqamların aydınlaşdırılmasında etimoloji tədqiqatlar böyük əhəmiyyətə malikdir.

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan dilinin izahlı lüğəti. (2006). I, II cild. Bakı, Şərq-Qərb. 792 s.
2. Axundov A. (2003). Dil və ədəbiyyat. I cild. Bakı, Gənclik. 660 s.
3. Cəlilov F. (1988). Azərbaycan dilinin morfonologiyası. Bakı, Maarif. 285 s.
4. Dastani-Əhməd Hərami. (2004). Azərbaycan klassik ədəbiyyatı kitabxanası. Bakı, Şərq-Qərb. 120 s.
5. Əhmədov B. (2015). Etimologiya lüğəti. Araşdırmalar, mülahizələr. Bakı, Altun kitab. 287 s.
6. İmadəddin Nəsimi. (2004). Seçilmiş əsərləri. II cild. Bakı, "Lider" nəşriyyatı. 345 s.
7. "Kitabi-Dədə Qorqud". (2004). Bakı, "Öndər" nəşriyyatı. 375 s.
8. Kaşğari M. (2006). Divanü-lüğat-it türk. IV cild. Bakı, Ozan. 752 s.
9. Qazi Bürhanəddin. (2005). Divan. Bakı, Öndər. 728 s.
10. Cəlil Məmmədquluzadə. (2004). Seçilmiş əsərləri. I cild. Bakı, "Öndər" nəşriyyatı. 663 s.
11. Məhərrəmli B. (2018). Azərbaycan dilində isim kökləri. Bakı, Elm. 138 s.
12. Məhərrəmli B. (2012). Türk dillərində isim köklərində leksik-semantik inkişaf. Bakı, Elm və təhsil. 399 s.
13. Oğuznamə. (2006). Bakı, Şərq-Qərb. 213 s.
14. Rəcəbli Ə. (2001). Qədim türkcə-Azərbaycanca lüğət. Bakı, "Azərbaycan Milli Ensiklopediyası" nəşriyyatı. 191 s.
15. Şıxıyeva S. (2019). Nəsimi şeiriyyətinin fərdi özəllikləri. Bakı, Azərbaycan şərqşünaslığı, № 1, 32 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2024, № 3 (281), 114–120
doi.org/10.48445/g0793-1471-5789-q



# Nəriman Həsənzadənin "Atabəylər" pyesində milli yaddaş: dünən və bu gün

***Aysun Əsədli***
Bakalavr, Humanitar və dillər fakültəsi, Odlar Yurdu Universiteti. Azərbaycan.
E-mail: aysunasadova99@gmail.com
https://orcid.org/0009-0007-8614-1208

**XÜLASƏ**
Məqalədə Azərbaycanın görkəmli yazıçısı Nəriman Həsənzadənin "Atabəylər" pyesində milli yaddaş, tarixi keçmişimiz və bu günümüzün müqayisəsi tədqiqata cəlb edilmişdir. Araşdırma ilə tanış olmaq şagird və tələbələrin tariximiz haqqında məlumat əldə etmələri və bu əsərdə qarşıya qoyulan tarixi məsələləri düzgün anlaya bilmələri üçün faydalı ola bilər. Məqalədə həmçinin pyesdəki əsas obrazların təhlilinə və onların tariximizdə hansı mövqe tutduqlarına dair məlumatlara da yer verilmişdir. Tədqiqat işinin aparılmasında təsviri, müqayisəli və müşahidə metodlarından istifadə olunmuşdur.

**AÇAR SÖZLƏR**
milli yaddaş, dünən və bu gün, mənzum faciə

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 17.07.2024
Qəbul edilib: 30.08.2024

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2024, NO. 3, VOL. 281, 114–120
doi.org/10.48445/g0793-1471-5789-q

AZERBAIJANI LITERATURE

# National Memory in Nariman Hasanzade's Work "Atabeyler": Yesterday and Today

***Aysun Asadli***
Bachelor, Faculty of Humanities and Languages, Odlar Yurdu University. Azerbaijan.
E-mail: aysunasadova99@gmail.com
https://orcid.org/0009-0007-8614-1208

**ABSTRACT**
In the article, the comparison of national memory, history and the present day in the play "Atabeyler" by the Azerbaijani writer Nariman Hasanzade was involved in the research. The content of the play is rich in historical information that has come as a legacy to our modern times. Familiarizing with the research can be useful for pupils and students to learn about our history and to better understand the main issues raised in this work that reflects our history. At the same time, the article includes the analysis of the main characters in the play and their significance in our history. Descriptive, comparative and observational methods were used in conducting the research.

**KEYWORDS**
national memory,
yesterday and today,
poem tragedy

**ARTICLE HISTORY**
Received: 17.07.2024
Accepted: 30.08.2024

**Giriş**

Tədqiqata cəlb etdiyimiz əsərin mövzusu Atabəylər dövlətinin tarixindən bəhs edir. Pyesin məzmunu Azərbaycan dövlətinin XII əsrdə daha mükəmməl inkişafı, azərbaycançılıq, dövlətçilik ideyalarının möhkəmlənməsinə həsr olunmuş və dövlət quruculuğunun çətin bir proses olduğu diqqətə çatdırılmışdır. Əsərdə eyni zamanda Azərbaycanın görkəmli şairi Nizami Gəncəvi və tanınmış memarı Əcəmiyə aid dialoqlar yer almış, Məhəmməd Cahan Pəhləvanın ölümü və ölümündən sonra cərəyan edən hadisələr təsvir edilmişdir. Həmin hadisələr 1186 – 1191-ci illəri əhatə edərək XII əsr tarixi xronikasını əks etdirir.

**Əsas hissə**

Müasir Azərbaycan poeziyasının görkəmli nümayəndəsi, xalq şairi Nəriman Əliməmməd oğlu Həsənzadə 1931-ci il fevral ayının 18-də Qazax rayonunun Poylu stansiyasında (indiki Ağstafa rayonu ərazisi) anadan olmuşdur [6].

Tədqiqata cəlb etdiyimiz "Atabəylər" pyesini yazıçı 1984-cü ildə qələmə almışdır. Əsərdə Azərbaycanın tarixi keçmişinə, milli şüuruna nəzər salınır, azərbaycançılıq ənənələri təbliğ olunur. Göstərilir ki, *azərbaycançılıq* milli yaddaş, milli şüur, milli maraq, ümumbəşəriliyin, modernizmin vəhdətidir [7].

Əsərdə təsvir edilən hadisələr Naxçıvanda cərəyan edir. Məlum olduğu kimi, Naxçıvan uzun illər Atabəylər dövlətinin paytaxtı olmuşdur. Bu ulu diyar məhz Atabəylər dövründə özünün intibah nümunələri, qüdrətli sənət abidələri və Əcəmi yadigarları ilə diqqət mərkəzində olmuşdur. Tanınmış şair, dramaturq Nəriman Həsənzadənin "Atabəylər" mənzum faciəsi məhz həmin illərin xronoloji bədii nümunəsidir [2, s. 131]. Əcəmi burada qədim Azərbaycan mədəniyyətinin, abidələrinin yaradıcısı kimi təsvir edilmişdir. Əsərdə göstərilir ki, o dövrdə Əcəminin və onun kimi memarların yaratdıqları şah əsərlər olmasa idi, müasir dövrdə Azərbaycan tarixini öyrənə, yaşada bilməzdik. Bu gün gördüyümüz bu abidələr, tarixin izləri ilə zəngin olan memarlıq inciləri o böyük sənətkarların əməyinin bəhrəsidir.

Mənzum faciə şəklində yazılmış bu əsərin ilk misralarında o dövrdə qadına verilən dəyərin şahidi oluruq. Atabəy Şəmsəddin Eldənizin xanımı Möminə Xatunun şərəfinə tikdirdiyi "Möminə Xatun" türbəsi də məhz bu hörmətin bariz nümunəsidir. Həmçinin Nizami Gəncəvinin dilindən verilən aşağıdakı misralar bir Azərbaycan şairinin qadına

[6] https://azkurs.org/n-hesenzadenin-atabeyler-pyesinin-tehlili.html

[7] https://sesqazeti.az/news/mia/212607.html

verdiyi dəyərin göstəricisidir:

Xoşdur bu türbənin hüsnü, camalı,
Susmuş musiqidir, toxunmuş xalı.
Torpağa səcdədir, qadına hörmət,
İnsanı yaradan ana təbiət
Burda sənətkara qısqana bilər,
Daşlara toxunsan, oyana bilər [1, s. 36].

Şair bu misralarla çağdaş dövrümüzdə qadına olan hörməti əks etdirir. Əsərin sonlarına doğru Qızıl Arslanla İnanc Xatun arasındakı dialoqlara nəzər yetirdikdə burada da qadının nə qədər uca tutulduğunun şahidi oluruq. Belə ki, İnanc Xatunun xainliyinə rəğmən, Qızıl Arslan onu hörmət, ehtiram əlaməti olaraq bağışlayıb sarayında saxlayır. Azərbaycan qadınına verilən dəyər yüzillər boyu davam edən ən gözəl ənənələrimizdəndir.

Əsərdə toxunulan digər vacib məsələlərdən biri də müasir dövr üçün hələ də aktuallığını qoruyub saxlayan mövzu − Azərbaycanın görkəmli şairi Nizami Gəncəvi yaradıcılığıdır. Əsərdə Qızıl Arslan şairin yaradıcılığına böyük önəm vermiş, onu "dahi sənətkar" adlandırmışdır. O, Məhəmməd Cahan Pəhləvanın fərmanına uyğun olaraq, əsərdə adı keçən "Xosrov və Şirin" poemasına görə Nizami Gəncəviyə Həmdünyan adlı kənd və çox sayda hədiyyələr bağışlamışdır. Əsərdə Qızıl Arslan şairin bundan narahat olacağını düşünərək onu qarşılayarkən hörmət əlaməti olaraq musiqinin səsinin azaldılmasını, kef məclisinə ara verilməsini istəmişdir. O, şairin ad-sanının hələ uzun illər var olacağını bildirir. Əsər boyu Nizami Gəncəvinin monoloq və dialoqları sayəsində şahid oluruq ki, o, həqiqətən də, dövrünün mükəmməl şairlərindən biri olmuş, sorağı bütün Azərbaycana yayılmışdır.

Pyesdə dramaturq Nəriman Həsənzadə müasir dövr ədəbiyyatı üçün ən mübahisəli mövzu − Nizami yaradıcılığının dili məsələsinə də toxunmuşdur. Əsərdə şairin Qızıl Arslanla dialoqu əsrlər boyu aktuallığını qoruyub saxlayan bu məsələyə də aydınlıq gətirir:

Şahım, qoy bir şeyi mən xatırladım
Mən də fars dilində yazdım, yaratdım.
Ona hörmətimiz, sədaqətimiz,
Ustad Firdovsinin dilidi, şəksiz.
Şifahi danışıq, göstəriş filan
Yazıya köçmürsə, yaşatmır zaman.

Farsın dilindədir dəftərxanalar,
Ana dilimizdə bir yazı axtar?

Yoxdur.

Soruşacaq tarix bir zaman
Bizə mat qalacaq bizi oxuyan.
Sizin vaxtınızda öz diliniz yox,
Fars dili yayıldı, çiçəkləndi, şah
Gedib söz soruşsan birindən əgər
Yalnız fars dilində cavab verərlər.
Nə qan qaraldıram, qibləyi-aləm
Nə qanım qaralır... guşənişinəm.

Şair bu misralarda o dövrdə Azərbaycan dilində yazıb-yaradan şairlərin olmaması səbəbindən farsca yazmaq ənənəsini davam etdirdiyini bildirir. O, şaha öz dilinin deyil, fars dilinin çiçəkləndiyini söyləyir. Görkəmli şairimiz bu dialoqunda həmçinin İran şairi Firdovsinin ustad olduğunu da vurğulayır.

Əsərdə Qızıl Arslanın cavabı da diqqəti cəlb edərək müasir dövrümüzə işarə edir. O, vaxt gələcək ki, Azərbaycan dilinin hər yerə yayılacağını söyləyir:

Şair, inanıram bir gün gələcək
Azərbaycan dili çiçəklənəcək.
Yeganə sərvətdi bu dövlət, bu var,
Nəsildən-nəslə qalıb yadigar.
Öz böyük oğlunu yetirəcək xalq,
Biz də gələcəyik dünyaya o vaxt
Nizami, ölməzdir sənin sənətin,
Canlı bir oğlusan o səltənətin.
Başqadır şairin eşqi, ürəyi,
Çatan əsrlərə sözün səsidir.
Vətən, vətən deyən şair ürəyi
Vətənin ən böyük ərazisidir.
Demə bu söhbətim bir təsəllidir,
Tarixdən misallar sənə bəllidir.

Qızıl Arslan şairlə dialoqunda demək istəyir ki, sadəcə Azərbaycan dilində yazmaq-

la deyil, ürəyi vətən eşqi ilə döyünənlər vətənpərvər şair ola bilərlər. Qəlbi "vətən" deyən bir şair hər zaman sevilər. Buradan aydın olur ki, Qızıl Arslan da Nizami kimi Azərbaycan dilinə dərin məhəbbət bəsləmişdir.

Əsərdə, ümumiyyətlə, yaradıcılığa, sənətə verilən dəyər ön planda göstərilib. Əgər vaxtında o əsərlər yazılmasaydı, sevilməsəydi, indi biz Azərbaycan tarixindən xəbərsiz olardıq. Tarixini bilməyən bir xalq məhvə məhkumdur.

Əsərdə Ruz və Gülaçar arasındakı məhəbbət də onların əsl azərbaycanlı olduğunun göstəricisi kimi qeyd olunmuşdur. Əsl azərbaycanlı qadını olaraq öz fədakarlığını nümayiş etdirən Gülaçar öz sevgisi və vətəni üçün canını fəda edərək yaddaşlara həkk olunur, qəhrəman adını qazanaraq şərəflə ölür. Ruz da vətən sevgisini insan eşqindən üstün tutur və öz ölkəsinə xəyanət fikrindən daşınır.

Məqalədə əsərdəki üç əsas obrazın təhlilinə yer verilir.

Qızıl Arslan – ədalətli Azərbaycan hökmdarı kimi təsvir olunmuşdur. O, İnanc Xatunun xəyanətinə baxmayaraq, onu bağışlamış, rəhmli davranaraq onu özünə həyat yoldaşı seçmişdir. Lakin əsl kişiyə yaraşan hərəkət edərək İnanc Xatuna toxunmamış, öz qardaşının namusunu göz bəbəyi kimi qorumuşdur. Burada əsl Azərbaycan kişisinin namusuna sadiqliyi ön plana çəkilmişdir. O, uzaqgörənliyi və tədbirliyi ilə daim çətin sınaqlardan üzüağ çıxmağı bacarmışdır.

İnanc Xatun – əsərdə xain qadın obrazında təsvir olunmuşdur. O öz dövlətinə, ailəsinə xəyanət edərək ölkəsini düşmənə satır. Məqsədi sadəcə öz oğlunu taxta çıxarmaq olsa da, bu əməli ölkə üçün ağır nəticələnir. Qızıl Arslan ona nə qədər rəhm etsə də, bir sözü ilə onu bağışlasa da, o, əməllərinə davam edir. Əsərdəki bu obraz ölkəni dağıtmaq istəyən xarici qüvvələrin, eyni zamanda Azərbaycanın daxilindəki düşmənlərin simvolu hesab olunur. Burada dramaturq "sapı özümüzdən olan baltalar" olmasa, güclü, bütöv Azərbaycan yaratmaq daha asan olardı" fikrini oxuculara çatdırır.

Əsərdəki salnaməçi tərəfindən Nizami yeddinci personaj olaraq belə təqdim edilir: "Azərbaycanın böyük şairi Nizamidir. "Xosrov və Şirin" poemasını Cahan Pəhləvana həsr etmişdir"[8]. Nizami Gəncəvi əsərdə Azərbaycan mədəniyyətinin, tarixinin, ədəbiyyatının simvolu olan obraz hesab olunur. Məqalədə onun yaradıcılığının gizli və mübahisəli məqamlarına da aydınlıq gətirilir.

[8] https://525.az/news/182668-nizami-genceviye-neriman-hesenzade-baxisi

**Nəticə**

Nəriman Həsənzadənin "Atabəylər" mənzum faciəsinin ideya-məzmunu milli yaddaşımız və çağdaş dövrümüzə aid fikirlərlə zəngindir. Məqalədə əsərdə verilən fikirlərə dair şeir parçaları təqdim olunaraq mənası izah edilmişdir. Ümid edirik ki, pyesin mövzu və tarixinin tədqiqata cəlb olunması onun gənc oxucular arasında düzgün qavranılması istiqamətində öz müsbət təsirini göstərəcək.

**İstifadə edilmiş ədəbiyyat**

1. Həsənzadə N. (2011). Seçilmiş əsərləri. Yeddi cilddə, III cild. Bakı, "Promotey"in kitabxanası.
2. Həsənzadə N. (2014). Seçilmiş əsərləri. Yeddi cilddə, VII cild. Bakı, "Promotey"in kitabxanası.
3. https://azkurs.org/n-hesenzadenin-atabeyler-pyesinin-tehlili.html
4. https://525.az/news/182668-nizami-genceviye-neriman-hesenzade-baxisi
   https://sesqazeti.az/news/mia/212607.html

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2024, № 3 (281), 121–130
doi.org/10.48445/e3142-1125-7990-b

TÜRK ƏDƏBİYYATI

# Azərbaycan və qazax ədəbiyyatının ortaq tənqidi üsluba sahib iki ustadı – Qasım bəy Zakir və Abay Kunanbayev

***Aidə Babutcu***
Filologiya üzrə fəlsəfə doktoru, dosent, Ədəbiyyat fakültəsi, Türk dili və ədəbiyyatı şöbəsi, Ərciyəs Universiteti. Türkiyə.
E-mail: aidababutcu@erciyes.edu.tr
https://orcid.org/0000-0001-9606-2086

**XÜLASƏ**
Qasım bəy Zakir (1784 − 1857) və Abay Kunanbayev (1845 − 1904) XIX əsrdə Azərbaycan və qazax sosial-mədəni mühitinin yetişdirdiyi iki maarifpərvər qələm sahibidir. Onlar realizm ənənələrini daha çox tənqidi-satirik üslubda davam etdirmişlər. Bu dövrdə Rusiyaya birləşdirilən iki xalqın milli kimliyinə və mənəviyyatına tamamilə yad olan "mütərəqqi" düşüncə və həyat tərzinin tətbiqi cəmiyyətdə nəzərəçarpacaq təzadlar, qarşıdurmalar yaratmışdı. Bu təzadı dövrün ədəbiyyatında müşahidə edərkən görürük ki, Qasım bəy Zakir və Abay Kunanbayev eyni ədəbi cərəyanın üzvləri kimi bənzər ədəbi üslublarla eyni milli duruşu və fəaliyyəti göstərmişlər. Məqaləmizdə hər iki şairin həyat və yaradıcılığına müqayisəli nəzər salmaqla milli görüşlərindəki əsas başlıqlar və şeirlərindəki səsləşən mövzular nümunələrlə müzakirə olunur.

**AÇAR SÖZLƏR**
Zakir, Abay, türk, Rusiya, fəaliyyət

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 23.07.2024
Qəbul edilib: 27.08.2024

AZERBAYCAN DİLİ VE EDEBİYAT TEDRİSİ
2024, № 3 (281), 121–130
doi.org/10.48445/e3142-1125-7990-b

TÜRK EDEBİYATI

# Azerbaycan ve Kazak Edebiyatının Ortak Mizahlı Üsluba Sahip İki Üstadı – Kasım bey Zakir ve Abay Kunanbayuulı

***Aida Babutcu***
Doç. Dr., Edebiyat Fakültesi, Türk Dili ve Edebiyatı Bölümü, Erciyes Üniversitesi. Türkiye.
E-mail: aidababutcu@erciyes.edu.tr
https://orcid.org/0000-0001-9606-2086

**XÜLASƏ**
Kasım bey Zakir (1784 – 1857) ve Abay Kunanbayuulı (1845 – 1904) XIX asırda Azerbaycan ve Kazak sosyokültürel muhitinin yetiştirdiği iki eğitim gönüllüsü kalem sahibi olup, realizm geleneklerini daha çok eleştirel-mizahi yönde sürdürmüşlerdir. Rusya'ya yenice birleştirilmiş iki halkın hüviyetine, maneviyatına tamamen yabancı olan "yenilikçi" düşünüş ve yaşayış biçiminin uygulanması toplumda hissedilir karşıtlık oluşturmuştu. Bu karşıtlığın dönemin edebiyatına yansıması açısından izlediğimizde aynı edebi akımın mensubu olarak Kasım bey Zakir ve Abay Kunanbayuulı benzer edebi üsluplarla aynı milli duruşu ve faaliyet çizgisini sergilemişlerdi. Bildirimizde her iki şairin hayatı ve eserlerine karşılıklı göz atarak, milli görüşlerindeki esas başlıklar ve şiirlerindeki benzeşen konular ayrıntılı bir şekilde örneklerle ele alınır.

**AÇAR SÖZLƏR**
Zakir, Abay, türk, Rusya, faaliyet

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 23.07.2024
Qəbul edilib: 27.08.2024

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2024, NO. 3, VOL. 281, 121–130
doi.org/10.48445/e3142-1125-7990-b

TURKISH LITERATURE

# Two Masters of Azerbaijan and Kazakh Literature with a Common Critical Style – Kasim bey Zakir and Abai Kunanbaiuly

***Aida Babutju***
Assoc. Prof. Dr., Faculty of Letters, Department of Turkish Language and Literature, Erciyes University. Turkey.
E-mail: aidababutcu@erciyes.edu.tr
https://orcid.org/0000-0001-9606-2086

**ABSTRACT**
Kasım bey Zakir (1784–1857) and Abai Kunanbaiuly (1845–1904) are two educational volunteers who were trained by the Azerbaijani and Kazakh sociocultural environment in the 20th century and they continued the traditions of realism in a more critical and humorous direction. The application of the “innovative” way of thinking and living, which was completely foreign to the identity and spirituality of the two peoples newly united in Russia, created a noticeable contrast in society. When we observe this contrast in terms of its reflection on the literature of the period, Kasim bey Zakir and Abai Kunanbaiuly, as members of the same literary movement, exhibited the same national stance and line of activity with their similar literary styles. In our paper, by taking a mutual look at the lives and works of both poets, the main topics in their national views and similar topics in their poems are discussed in detail with examples.

**KEYWORDS**
Zakir, Abai, turkish, Russia, activity

**ARTICLE HISTORY**
Received: 23.07.2024
Accepted: 27.08.2024

*Taş taş üste durmaz âlemde asla,*
*Deymese insana insandan medet* (Zakir).

*Üç şey insanı haysiyetli yapar:*
*İyiliği ödev bilmek, aydın bir akıl, sevgi dolu bir yürek* (Abay).

**Özet**

Her ikisi Türkistan'ın bir parçası olan Azerbaycan ve Kazakistan tarihlerinin 19. yüzyılında Rusya'ya ilhak olunmuşlardı. Bu dönemlerde her iki coğrafya ekonomik ve sosyo-kültürel alanda tezatlı bir süreç yaşamıştır. Çarlık Rusya'sının uyguladığı ilhak, benimseme politikası tüm Türkistan coğrafyasında benzer şekilde gerçekleşmişti.

Azerbaycan Güney Kafkasya'da 1747 – 1844 yılları arasında fiilen bağımsız olan ve çoğunlukla Türk kökenli hanedanlarca yönetilen hanlıklara bölünmüş, Rus-İran Savaşları sonrasında, Rus İmparatorluğu'nun baskısıyla Kaçar İmparatorluğu tüm Kafkas topraklarını terk etmek zorunda kalmış, Gülistan (1813) ve Türkmençay (1828) antlaşması ile Çarlık Rusya'sı ve İran Kaçar'ı arasındaki sınır kesinleşmişti.

**Gülistan Antlaşması ile Rusya'ya geçen Azerbaycan Hanlıkları:** *Bakü Hanlığı, Şirvan Hanlığı, Derbent Hanlığı, Karabağ Hanlığı, Gence Hanlığı, Şeki Hanlığı, Guba Hanlığı, İlisu Hanlığı, Lenkeran Hanlığı'*nın bir kısmı.

**Türkmençay Antlaşması ile Rusya'ya geçen Azerbaycan Hanlıkları:** *Lenkeran Hanlığı (tamamen), Nahçıvan Hanlığı, İrevan Hanlığı.*

**İran'da kalan Azerbaycan Hanlıkları:** *Urmiye Hanlığı, Maku Hanlığı, Erdebil Hanlığı, Karadağ Hanlığı, Marağa Hanlığı, Zencan Hanlığı, Halhal Hanlığı, Merend Hanlığı*.

Böylelikle, Azerbaycan topraklarında Rus egemenliği başlamış bulundu.

Kazakistan toprakları üzerinde 15. yüzyıl'da kurulmuş Kazak Hanlığı üç parçadan oluşuyordu: Büyük Cüz, Küçük Cüz, Orta Cüz. Cüzler Hanın oğulları tarafından yönetiliyordu. 1770'lerin sonlarında Kazak cüzleri güçlü Rus İmparatorluğu ve Çin arasındaki mücadele arasında kaldı. 1847'de Kazak Hanı olan Kenesarı Han döneminde Ruslar, Kazak cüzleri üzerindeki egemenliğini tam olarak sağladılar. Türkistan'da bölgeyi bölümlere ayıran Rus Generalliği kuruldu. Bu dönemde Ruslar Kazak bölgesini, "Kazak Kırgızları Hanlığı" olarak adlandırdı. 1900'lerle birlikte pek çok Rus Kırgız bozkırlarına yerleşmeye başladı. 1917 – 1920 yılları arasında Rusya'da ihtilal sebebiyle yaşanan bağımsız dönemde eski Kazak cüzleri bir araya gelerek Kazak halkının efsanevi kurucusunun adını taşıyan, bağımsız Alaş Orda Devleti'ni kurdular. Hükümet başkanı Alikhan Bokeikhanov, başkenti Semey'di. Bu devlet, yeni bir siyasi

sistem altında Rus kontrolünü korumaya çalışan bolşevik yetkililere teslim olunmasından önceki üç yıllık dönemde varlığını sürdürdü. 1920'den sonra rusların egemenliği ele geçirmesiyle Sovyetler Birliği dönemi başlamış bulundu [9].

Bütün tarihi olaylar her iki coğrafyada kültürel hareketlenmeleri de tetikledi.

Azerbaycan ve Kazak edebiyatlarında realizmin yönlendirici edebi akım olarak teşekkülü ve gelişimi de bu dönemde ortaya çıkdı. Genel olarak realizm Türk dünyası edebiyatlarında eleştirel yaklaşımların edebi esere sıkca yerleştirilmesi, neticede yapıtın bir mizah edebiyatı değeri kazanması ile başlar. Bundan sonra edebiyat tarihlerimizde hiciv, tenkit, mizah terimleri toplumsal değişimlerin yazara ve edebî esere olan etkileri ekseninde değerlendirilmeye açık olmuştur.

**Ana konu**

Kasım bey Zakir (1784 – 1857) ve Abay Kunanbayulı (1845 – 1904) XIX asırda Azerbaycan ve Kazak sosyokültürel muhitinin yetiştirdiği iki eğitim gönüllüsü kalem sahibidir. Her ikisi soylu ve zengin ailelerin çocuklarıdır. Zakir Azerbaycan'da Karabağ'ın meşhur Cavanşirler neslinden, Şuşa şehrinin temellerini atan Penah han'ın soyundandır. Çok ferasetli, hoş muhabbetli, edebiyatı ile çağdaşları arasında takdir edilen, asil şahsiyetiyle seçilen biriymiş [13, s. 36].

Abay Orta cüz Kazaklarından Argın boyunun Tobıktı koluna mensuptur. Sert ve feodal olan babasından otoriteyi ve yöneticiliği, yumuşak ve sevecen huylu annesinden de sanatkârlığı almıştır [Ekrem A. Ankara, 2017]. Her iki şairimiz kendini her yönden iyi yetiştirmeye çalışmış; sadece Türk kültürüyle değil, Arap ve Fars gibi farklı müslüman kültürleriyle yakından ilgilenmiş, bununla birlikte Rus kültürünü de öğrenmeye büyük gayret göstermişlerdir.

Zakir ve Abay realizm geleneklerini daha çok eleştirel-mizahi yönde sürdürmüşlerdir. Her iki şairimiz milli edebiyatlarında ilk olanlara imza atmışlar: Zakir Azerbaycan edebiyatında eğitici hicivden realist satiraya geçişin başlanğıcı, Abay ise umumen Kazak yazılı edebiyatının kurucusu, realizmi akım ve üslup olarak Kazak edebiyatına kazandıran isimdir. Her iki üstat şiirlerinde yaşadığı dönemin sevimsiz, yakışıksız manzaralarını olduğu gibi gözler önüne serip; sert bir mizahla onları alaya almıştır. Soydaş halklara mensup bu iki realist yazarın hayatı ve eserlerini karşılaştırmalı şekilde gözden geçirdiğimizde önemli çıkarışlarımız olabiliyor: onların ait oldukları aile değerleri, töre ve gelenekleri, millî kimlikleriyle yaşayıp yazdıkları çevrenin istekleri, ideoloji dayatması arasında keskin uçurumlar vardır. Rusya'ya yenice birleştirilmiş iki halkın hüviyetine, maneviyatına tamamen yabancı olan

[9] https://tr.wikipedia.org/wiki/Kazakistan

"yenilikçi" düşünüş ve yaşayış biçiminin uygulanması toplumda hissedilir karşıtlık oluşturmuştu. Türk toplumu olarak asırlardır aktarılagelmiş fikriyat ve kültür birikimi "eski feodal kalıntıları" olarak yutturulmaya çalışılmış, buna karşılık Rusya ve Avrupa'nın guya özgürlük, demokrasi ve çağdaşlaşma kaynağı oluşu esas götürülerek aydınlanma adı altında siyasi-kültürel baskılar başlatılmıştı. Katı sınıflaşma, hükmetme eylemleri, süründürmeçilik, rüşvetçilik, yıllardan beri maddilerin manevi kazançlarla ödendiği halde, şimdi manevilerin maddi kazançlarla ödenmesi mecburiyeti ve b. sorunlar toplumda aydınların da milli duruşunu, faaliyet çizgisini belirginleştirmişti. Bu karşıtlığın dönemin edebiyatına yansıması açısından izlediğimizde aynı edebi akımın mensubu olarak Kasım bey Zakir ve Abay Kunanbayulı benzer edebi üsluplarıyla aynı milli duruşu ve faaliyet çizgisini sergilemişlerdi. Eserlerinde ele aldıkları bütün konularda her iki şair Türk toplumunun "eski"lerini – milli değerlerini "yeniler"e karşı savunmuşlardır. Bazen aile yakınları tarafından hoş görülmeyen bu savunuşları dönemin yeni edebi tekniğinin – edebiyatta mizahi anlatımın başlanğıcı idi.

Zakir ve Abay'ın şiirlerini karşılaştırdığımızda ortaya çıkan esas başlıkları ve benzeşen konuları aşağıdaki şekilde gruplaştırabiliriz:

– Öncelikle, her iki şairde konuların esasen heceli nazım biçimleriyle ifade olunması millilik yanlarını, halkın ve halkiyatın tarafında olduklarını öne çıkarmıştır.
– İnsanlığı ve maneviyatı kötü durumlara düşüren alışkanlıklar;
– Cahil ve asalak yaşam biçiminin, eğitimsizliğin getirdiği belalar;
– Halkın kurtuluşunun geçmişin gerçeklerinde – kahramanlıklarında aranması, buna istinaden tarihi misyonun halkın geleceğine aktarılması çağrısı; "Hakikat nerdedir, ...onu bulamıyor, idrak edemiyorsun" – söyleyen Abay'ın Kazak halkı hakkında, onun geçmişi ve geleceği ile ilgili öz düşüncesi, isteği vardır: şair halkının gelişimini her alanda engelleyen sebepleri "Ey benim kazaklarım, mazlum, zavallı halkım..." başlıklı şiirinde bütünlükle açıklıyor. Aynen Zakir de "Gönül baha-baha ruhi zibaye" dörtlükleri ile memleketinin adaletsizlikler içinde boğulduğunu anlatıyor, halkının acı talihine sitem ediyor:

**Abay'da:**

Salınan halkım, Kazağım, şaşkın yurdum
Ağzına dolmuş ustura görmeyen bıyığın.
İyi ile kötüyü ayıramadın
Biri kan oldu, biri yağ iki avurdun [Çarboğa K. Ankara, 2021].

**Zakir'de:**

Hadden aşıp bühl ü hased, şeraret,
Yoldaş yoldaşına eyler ihanet.
Alimde amel yok, bayda adalet,
İşlerimiz olup saf gerden-bucak [Zakir K. Bakı, 2005].

Görüldüğü gibi, geçmişine arka çevirerek çarlık yöneticileriyle elbir olan bayların, feodalların zorbalığı ve kanunlarının acı sonuçları, cehaleti yayan ruhaniler, ilimsiz doktorlar, tarikat mürşitleri ve b.larının evler yıkan zulüm ve istibdatları her iki şairin mizah hedefindedir.

– Namuslu, bilgili insanların takip ve tahkir edilmesinin sebepleri ve bunun allegorik ifadesi;

– Çağdaşları ile manzum yazışmalarda her iki yazarın sarsıntı ve dertlerinin mizahlı söyleşisi (Mesela: Abay'da Kojekbay'a, Kulembay'a, Zakir'de Mirze Fetali Ahundov'a, İsmail bey Gutgaşınlı'ya ve b.larına yazılmış manzum mektuplar).

– Yaşadıkları memleketin tabiatı ile insanları arasında karşılaştırmaların sembolikası; Zakir ve Abay eserlerinde en lirik konu bile mizahi muhtevasını kaybetmiyor. Tüm ruhları, düşünceleri ile gerici olanlara düşman kesilmiş her iki şair ülkelerinin tabiatında insanların ürkütücü haraketlerinden çekinen sembolik bir karakter oluşturmuşlar, bu karakterle mağdur yurttaşları arasında uyumlu ve farklı tarafların olduğunu maharetle göstere bilmişlerdir. Mesela: Abay'da – "Güz", "Kış", "Bahar"; Zakir'de – "Turnalar", "Teğafül eyleme, ey badi-seba" ve b. Bu şiirleri okuduğumuz zaman sadece bir mevsim manzaraları görmüyoruz, burada yerinde taş gibi yata-otura kalmış toplumun canlanması arzusu vardır. Bir yandan mevsimin güzellikleri yerine geçen bu terennümler adeta halkta türlü huylar gibidir, fakat çirkindir, hareketlenme gerektiren dönemine aykırıdır, zıttır.

**Abay'ın "Güz" şiiri:**

Bozkır dalgalanmaz otlaklarıyla,
Çiçekler sallanmaz yapraklarıyla,
Ağaçlar kurudu yaşlılar gibi
Göklere yalvarır budaklarıyla [Çarboğa K. Ankara, 2021].

Hiçbir şeye hiçbir yerde faydası dokunmayan insan canlı ölüdür, oysa halkına ondan kurtuluş, direniş yok, ölüme mahkûmdur – kurumuş ve göklere yalvarır budaklarıyla.

**Zakir'in "Turnalar" şiiri:**

Laçin yatağıdır bizim mekânlar,
Yavaş yavaş gidin, sesiniz anlar,
Korkurum dokuna öten zamanlar
Sürbeniz bozula, şaşa, turnalar [Zakir K. Bakı, 2005].

Turna özgürlük, refah ve güzellik, aynı zamanda özlem, dert ortağı, endişe simgesi olarak burada halkın kaderini sembolize etmektedir: öten zamanlara dokunursan – geçmişine vefalı davranışlar sergilersen, özüne dönersen, düzen bozulabilirmiş, şaşabilirmiş… Zakir Türk halklarının o dönemde özgürlük mücadelelerine susamış Rus tehlikesine "laçin yatağı" diye alegorik anlam yüklemiştir.

– Lirik, özellikle aşk konulu şiirlere gazap ve hiddet duygusunun eşlik etmesi, eleştirel görüşlerin didaktik biçimde, yani atasözü, hikmetli kelam ve ibretli-eğitici hikayelerle verilmesi her iki şairimizin ortak edebi özellikleridir. Örneğin: Abay'da – "*Bir daha sevinmez, gülmez bu yürek", "Sinemde gam kervan-kervan"; Zakir'de – "Gece-gündüz hasret çeker gözlerim", "Gözüm yolda kaldı, gönül intizar"* v. b.

**Abay'da:**

Baharda göveren körpe ot, sahi
Bilir mi ömrünün cüceliğini
Çınar olmak ister, çınar vallahi
Yıldıza dek ister yüceliğini
Güneşin nuruyla ayağa kalkar
Ot nereden bilsin dünyada kış var [Çarboğa K. Ankara, 2021].

Dünyaya gelmiş insana hayatın bin bir türlü derdi, kötü yüzü olduğunu ve daha neleri ifade etmek istemiştir bilge Abay.

**Zakir'de:**

Hercayi sözüne itibar olmaz,
Bihayada namus olmaz, ar olmaz,
Cefa çekme, benden sana yar olmaz,
Döne-döne dedi o dilber bana [Zakir K. Bakı, 2005].

## Sonuç

19. yüzyılda Azerbaycan ve Kazakistan coğrafyasında yeni koşullarla bağlı olarakbilimde, kültürde, sosyal ve felsefi düşüncede ve edebiyatta modern eğilimlerin güçlendiğini özellikle belirtmek gerekir. Edebiyatta yeni nitelikte eserler ortaya çıkmaya başlar. Matbaa imkânına kavuşulması ile milliyetçi ve özgürlükçü mücadele konuları revaç kazanarak yayılır.

Zakir ve Abay genetik olarak köklerindeki düşünce yapısına göre yaşamış ve yazmış aynı milletin aydın evlatlarıdır. Özellikle eğitimin, kültürün ve özgürlüğün devletin bel kemiği olduğuna inanan, yaşamları boyunca aynı görüşleri benzer şekillerde ifade eden kalem sahipleridir. Elbette, Zakir her ne kadar halk şiiri üslubunu takip etmişse de, klasik üslubun da kullanıcısıdır, gazeliyatı vardır, şiiriyatına Arap-fars terkiplerinin verdiği bir ağırlık hâkimdir, divan şiirinden tamamen sıyrılmamış bir dönemin üstadıdır. Abay ise halk ozanlarından teslim aldığı geleneğin devamcısı olarak halk diliyle – ağırlıklı olarak arı Kazakçayla konuşuyor şiirlerinde.

## Kaynakça


1. Azərbaycan tarixi. (2007). IV cild. Bakı, Elm. 504 s.
2. Çarboğa K. (2021). Abay'dan Seçme Şiirler (Çeviren Kenan Çarboğa). Ankara, TÜRKSOY.
3. Ekrem A. (2017). Bir Devrin Aynası Abay Kunanbay ve Kara Sözler. Ankara, Hoca Ahmet Yesevi Uluslararası Türk-Kazak Üniversitesi.
4. Emel Aşa H. (1998, 27 aralık). İbrahim Abay Kunanbayoğlu'nun edebi çehresi. Türk Kültürü 36, s. 761 – 768.
5. Köçərli F. (2005). Azərbaycan ədəbiyyatı. I cild. Bakı, Avrasiya Press, s. 560.
6. Zakir Q. (2005). Seçilmiş əsərləri. Bakı, Avrasiya Press. 400 s.
7. Qasımzadə F. (1974). XIX əsr Azərbaycan ədəbiyyatı tarixi. Bakı, Maarif, s. 552.
8. Quliyev E. (2020). Abay Kunanbayev. Ankara, TÜRKSOY. 344 s.
9. Hizmetli S. (2011). Kazak ulusu ve Kazak tarihi üzerine: dünü ve bugünü İstem, Yıl: 9, Sayı: 17, s. 23 – 43.
10. Hüseynov S. (2010). Qasım bəy Zakir. Bakı, "Yazıçı" nəşriyyatı. 344 s.
11. Kunanbayev A. (2020). Qara söz (Mətn, fəlsəfi traktat). Bakı, Qanun. 142 s.
12. Kunanbayev A. (1970). Şeirlər və poemalar. Bakı, Azərbaycan Dövlət Nəşriyyatı. 209 s.

13. Məmmədli R. (2014). Ölməz əsərləri ilə ölümsüzlük zirvəsini fəth edən söz sərrafı Qasım bəy Zakir. Bakı, Azərbaycan Dövlət Mədəniyyət və Turizm Nazirliyi. 36 s.
14. Məmmədov K. (1984). Qasım bəy Zakir. Bakı, Gənclik.
15. Məmmədov K. (1975). XIX əsr Azərbaycan şeirində satira. Bakı, Elm.
16. Mustafa M. (1983). Zakir şeirinin sənətkarlığı. Bakı, Yazıçı. 152 s.
17. Öztürk R., Sembi N. (2017). Kazak millî şairi Abay (İbrahim) Kunanbayev'in pedagojik görüşleri üzerine bir inceleme. SUTAD, Bahar; (41), s. 39 – 51.
18. Xəlilov P. (2017). Ön söz əvəzi. Abay. Bakı, Mütərcim. 252 s.
19. https://tr.wikipedia.org/wiki/Kazakistan

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2024, №3 (281), 131–145
doi.org/10.48445/z2180-8723-9400-d

ƏDƏBİ MÜHİT

# Bədii əsərlərdə obrazlar qalereyasının nəzəriyyəsi

***Ulduz Qəhrəmanova***
Filologiya üzrə fəlsəfə doktoru, baş müəllim, Ədəbiyyat kafedrası, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan.
E-mail: ulduzkahraman1@gmail.com
https://orcid.org/0009-0003-4418-9319

**XÜLASƏ**
Dünya ədəbiyyatının ilk obrazı, bədii təsvirin qayəsi, şübhəsiz ki, insandır. İnsanı təsvir etmək onun həyatını canlandırmaq deməkdir. Hər bir əsər həyat hadisələrinin obrazlı ifadəsi, cəmiyyətin, tarixin güzgüsüdür. Lakin əsərlərdə təqdim edilən həyat hadisələri olduğu kimi deyil, yazıçı tərəfindən müdaxilə edilərək təsvir olunur. Bədii əsərdə həyat hadisələri öz ifadəsini obrazlarda tapır. Belə ki, yazıçı həyat faktlarını ümumiləşdirir, onu surətlər fonunda oxucuya çatdırır. Surətlərin fərdi xüsusiyyətlərinin məcmusu xarakter əmələ gətirir. Xarakter psixoloji anlayışdır. Bədii əsərdə surətin xarakterə çevrilməsi bu obrazın məqsəd uğrunda qətiyyətlə mübarizə aparmasından irəli gəlir. Başqa sözlə, bədii xarakter çətinliyə baxmayaraq, məqsəd uğrunda mübarizə aparmaqla formalaşır. Tip xüsusi şəraitdə yaranmış tipik xarakterdir. Yazıçı real həyatdan öz niyyətinə uyğun olan insan obrazı yaradır ki, bu da prototip, proobraz adlanır. Prototip, proobraz – əsərdəki bədii qəhrəmanın real həyatdakı surəti deməkdir.

**AÇAR SÖZLƏR**
obraz, xarakter, tip, tipikləşdirmə, prototip

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 07.07.2024
Qəbul edilib: 21.08.2024

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2024, NO. 3, VOL. 281, 131–145
doi.org/10.48445/z2180-8723-9400-d

LITERARY ENVİRONMENT

# The Theory of the Gallery of Images in Works of Art

***Ulduz Gahramanova***
Doctor of Philosophy in Philology, Head teacher, Department of Literature, Azerbaijan State Pedagogical University. Azerbaijan. E-mail: ulduzkahraman1@gmail.com
https://orcid.org/0009-0003-4418-9319

**ABSTRACT**
Undoubtedly, the first image of world literature, the rock of artistic representation, is man. Depicting a person means bringing his life to life. Each work is a figurative expression of life events, a mirror of society and history. However, the life events presented in the works are described by intervention by the writer, not as they are. In a work of art, life events find their expression in images. Thus, the writer summarizes the facts of life and conveys them to the reader against the background of images. The totality of the individual characteristics of the images forms a character. Character is a psychological concept. The transformation of the image into a character in a work of art comes from the fact that this image is determined to fight for the goal. In other words, artistic character is formed by striving for a goal despite difficulties. A type is a typical character created under special conditions. The writer creates a human image from real life that corresponds to his intention, which is called a prototype, proimage. Prototype, proobraz means a copy of the artistic hero in the work in real life.

**KEYWORDS**
character, type, typification, prototype

**ARTICLE HISTORY**
Received: 07.07.2024
Accepted: 21.08.2024

## Giriş

Dünya ədəbiyyatının ilk obrazı, şübhəsiz ki, insan olmuşdur. Yalnız insan obrazına surət deyilir. Atın surəti, itin surəti, çiçəyin surəti, dənizin surəti ifadələri doğru deyildir. Bunlara at obrazı, it obrazı, çiçək obrazı, dənizin obrazı və s. demək daha düzgündür. Obraz daha geniş anlayışdır. “Surət”, “obraz” termini lirik və epik əsərlər üçün, “personaj” termini isə dram əsərləri üçün xarakterikdir. Personaj dedikdə çox zaman bədii əsərdəki ikinci dərəcəli, epizodik surətlər nəzərdə tutulur. Bədii əsərdə hadisə və əhvalatlar insan obrazının əlaqələri fonunda yaranır.

İnsan obrazının ictimai həyatla təması və konfliktlər üzərində qurulan əsərlər siyasi, inqilabi, hərbi mövzuları əhatə edən sosial tematikaya daxildir. Sosial tematikaya aid hadisələrin ən çox işlənilən tipi insan əxlaqına və cəmiyyətlə münasibətlərinə aid hadisələr sayıla bilər. Bunlar mənəvi-əxlaqi tipli mövzular adlanır ki, bu da sosial tematikanın əsas mövzusu hesab edilir.

## Əsas hissə

Yazıçı həyat faktları və hadisələri ümumiləşdirir, onu surətlər fonunda oxucuya çatdırır. Surətlərin fərdi xüsusiyyətlərinin məcmusu xarakteri əmələ gətirir. “Surət müəyyən insan qruplarının xarakterik xüsusiyyətlərinin bir fərdin üzərində ümumiləşdirilməsidir” [3, s. 97]. Xarakter bir surəti digər surətdən fərqləndirir. Hər cür personajı xarakter adlandırmaq olmaz. Hər bir surətin özü müəyyən xarakterə malikdir: xarakter fərdi və konkretdir; xarakter bədii əsərdə ətraflı, hərtərəfli işlənmiş insan surəti olub, yazıçı təfəkkürünün məhsuludur; xarakter fərdi xüsusiyyətlərin məcmusudur; xarakter daha çox insan obrazına, surətə aiddir. Lakin xarakter müəyyən dərəcədə heyvan, yaxud təbiət obrazlarına da aid ola bilər. Məsələn: Elçinin “Dolça” povestinin qəhrəmanı olan sədaqətli bağ iti haram tikəyə tamah salıb tədricən xarakterini itirir, yaltaq və sümsük bir varlığa çevrilir.

Realizmin başlıca xüsusiyyəti tipik şəraitdə tipik xarakterlərin yaradılmasıdır. Ədəbiyyatda tipik xarakter insan surətlərinin ən kamil formasıdır.

“Tarixi şəraitin, dövrün diktəsi xarakterin adi obrazdan xarakterə çevrilməsində əsas rol oynayır. Məmməd Əliyevə görə, obraz termini 2 məna daşıyır:

1. Nitqin gözəlliyi, bəlağətli çıxış mənasında.
2. Termin kimi “surət” mənasında. Bu zaman sənətkarın varlığı ifadəetmə formasına xidmət edir [8, s. 98].

O obraz xarakterə çevrilir ki, öz amalı, məqsədi uğrunda hər çətinliyə dözərək mübarizə aparmağı bacarır və qalib obraza çevrilir [4, s. 105]. Aristotel “Poetika” əsə-

rində xarakterin 4 cəhətini göstərir:

1. Xarakterdə nəciblik.
2. Xarakter yaşamalıdır.
3. Xarakter həqiqətə uyğun olmalıdır.
4. Xarakter ardıcıllığı gözləməlidir.

Xarakterin ən yüksək zirvəsi milli xarakterdir. "Ədəbi əsərdə hər hansı əlamət və keyfiyyəti ilə fərqlənən, mükəmməl, qüsursuz yaradılan insan nümunəsinə *xarakter* deyilir. Xarakterdə güclü ümumiləşdirmə olduğu kimi, tipik xüsusiyyətlər də mövcud olur. Bu anlayış daha çox milli koloritlə, fərdi özünəməxsusluqla bağlıdır" [4, s. 105]. Milli xarakter – xalqın milli mənəviyyatının fərdi daşıyıcısı, bədii psixoloji anlayışıdır. Millilik surətin milli keyfiyyətlərini özündə səciyyələndirməkdir. Xarakterdə milli cəhətlərin mövcudluğu qanunauyğun haldır. Milli xarakter hər bir xalqın milli xüsusiyyətlərini özündə əks etdirən obrazdır.

"Milli xarakterli obraz aid olduğu xalqın məişətini, adət-ənənələrini, onun psixologiyasını, illərin sınağından çıxmış əxlaq normalarını özündə əks etdirən obrazdır" [1, s. 97]. Milli xarakter milli-mənəvi dəyərləri, milli mentaliteti özündə cəmləşdirir. Məsələn, İsmayıl Şıxlının "Dəli Kür" romanında Cahandar ağa milli xarakterdir. Çünki o, xalqın yükünü çəkir. Belə ki, bu əsərdə milli xarakterli insanların yumruq kimi müstəmləkəçilərə qarşı birləşməsi açıq-aydın görünür. Ədibin "Dəli Kür" əsəri, əslində, tarixi-siyasi romandır. Burada tarixi faktlar olmasa da, o dövrün tarixi ruhunu görmək mümkündür. Doğrudur, Cahandar ağanın Mələyi qaçırması onun milli xarakterik obraz olmasına kölgə salır və tənqidçilər arasında mübahisə yaradır. Bəli, bu addım Cahandar ağanın baş töhməti idi. Əsər də məhz Mələyin qaçırılması epizodu ilə başlayır. Cahandar ağanın bu hadisəyə görə namussuz adı ilə damğalanması çağdaş düşüncə tərzi idi. O öz səhvini anlayır və buna görə Mələyə əziyyət vermək istəmir. Hətta səhvini düzəltmək üçün Mələyə geri qayıtmağa da icazə verir. Ancaq o qayıtmır. Çünki XIX əsrdə Mələyin belə hadisədən sonra geri dönüşü onun üçün əsl faciə idi. Cahandar ağa da bilirdi ki, bu onun öz səhvidir. Ona görə də günahı öz üzərinə götürməli olur.

"Xarakterin ən üstün əlaməti millilikdir. Millilik xalqın, millətin, min illərdən üzübəri qoruyub saxladığı ənənələr, mənəvi dəyərlərdir. Milli xarakterli qəhrəman milyonlara nümunə olur. Xarakterdə qorunub saxlanılan milli xüsusiyyətlər örnək olaraq gələcək nəsillərə ötürülür" [1, s. 204].

Ədəbi əsərdə təsvir edilən konkretlik həyatdakı konkretliklə eynidir. Həyatın ümumiləşdirilmiş təsvirini vermək üçün yazıçı həyatın konkret cizgilərini müşahidə edərək dərk etməlidir. Sənətkar da həyatda gördüyü konkret hadisə və insanları

ümumiləşdirir, bununla da tip yaradır. Xarakterin daha yetkin forması tipdir. Deməli, konkretlik xarakterə, ümumiləşmə isə tipə məxsus kateqoriyalardır. Bədii ədəbiyyatda tip zəmanənin tarixi xarakterini insan surətində əks etdirən ən dolğun bədii obrazdır. Tip müəyyən tarixi prosesin məhsuludur. Bəs ədəbi qəhrəman kimdir? Antik yunan ədəbiyyatında, Renessans dövrü sənətində, qədim türk eposunda və orta əsr dastanlarında tip yerinə ədəbi qəhrəman anlayışı var idi. Onlar xalqı, müəyyən kollektivi, etnosu və dini icmanı təmsil edən ədəbi qəhrəmanlar idi. Məsələn, "Kitabi-Dədə Qorqud"dakı, "Koroğlu"dakı qəhrəmanlar, surətlər ədəbi qəhrəmanlar idi. Yaxud Renessans dövründə (Avropada Renessans, Şərqdə İntibah – U. Q.) xarakter bir fərd kimi kütləyə qarışır.

Tip eyni zümrəyə məxsus olan xarakterlərin bir fərdin, güclü bir şəxsin simasında ümumiləşdirilməsidir. Məsələn, Cəlil Məmmədquluzadənin "Ölülər" tragikomediyasındakı Şeyx Nəsrullah fırıldaqçı mollaların tipik obrazıdır. Ədib əsərdə İskəndər surətini yaratmaq üçün bir çox "İskəndərləri" müşahidə etmişdir. Həyatda İskəndər kimi insanlar olmuş və onlar yazıçının xəyalı ilə ümumiləşdirilmişdir. Yaxud "Poçt" qutusu hekayəsinin qəhrəmanı Novruzəli XIX əsr mədəni tərəqqi cəhətdən geri qalmış Azərbaycan kəndlisinin tipik obrazıdır. Deməli, "ədəbi tip, surət yalnız bir faktın, bir hadisənin, bir insanın yox, yüzlərlə fakt, hadisə və insanın xarakterik xüsusiyyətlərinin alınıb ümumiləşdirilməsinin nəticəsidir" [2, s. 38].

*Tip* daha çox dünya ədəbiyyatında realizm ədəbi cərəyanının məhsuludur. Yazıçı tipi 2 yolla yaradır:

**I. Abstraklaşdırma.** Bu yolla yaradılan tip yazıçının müşahidələri əsasında yaranır. Belə ki, sənətkar öz həyat müşahidələri və təcrübələri sayəsində müəyyən bir məntiqi nəticəyə əsaslanaraq ədəbi tip yaradır. Çünki yazıçı həyatı müşahidə etdiyi zaman insanları izləyir və öz məqsədinə uyğun, nəzərində tutduğu tipi ümumiləşmələri əsasında yaradır. Bədii tip, bədii surət öz-özünə yaranmır. Bunu yaratmaq üçün yazıçı müəyyən təxəyyül, xəyal qabiliyyətinə malik olmalı, yəni "uydurmağı" bacarmalıdır. Yaradıcılıq işi "uydurmasız" mümkün və mövcud deyildir. Ustalıq, sənətkarlıq da bu yaratmaq qabiliyyətindədir. İnsan çox şeyləri anlaya, görə bilər, lakin yaratmaq qabiliyyətindən, xəyal və təxəyyüldən məhrumdursa, sənət əsəri yarada bilməz. Nikolay Çernışevski də, haqlı olaraq, şairlik istedadına "yaradıcılıq fantaziyası" demişdir. Xəyal və icad olmadan bədii surət yaratmaq mümkün deyil.

**II. Prototipləşdirmə.** Prototipləşdirməyə həm də *ədəbi tip* deyilir. Ədəbi tip real həyatda yaşayan insan surətləridir ki, buna həm də *prototip, proobraz* deyilir. Ədəbi tip ictimai insan deməkdir. Həm mənfi, həm müsbət obraz ədəbi tip ola bilər. Yəni yazıçı bir tacir tipi yaratmaq üçün yüzlərlə tacirin geyimini, yerişini, oturub-duruşunu, danışıq

tərzini xüsusilə pula, bazara və tərəziyə münasibətini müşahidə edib təxəyyülündə ümumiləşdirməyi bacarmalıdır. Çünki ədəbi tip yalnız bir faktın, bir hadisənin, bir insanın deyil, yüzlərlə fakt, hadisə və insanın xarakterik xüsusiyyətlərinin ümumiləşdirilməsinin nəticəsidir. Doğrudur, nəzərimizdə yalnız bir insan, bir sima canlanır. Ancaq həmin insanın şəxsində ictimai zümrəni, qrupu görürük.

"Obraz insan həyatının estetik əhəmiyyət kəsb edən təxəyyül, fantaziya vasitəsilə yaradılan konkret, eyni zamanda ümumiləşmiş mənzərəsidir" [3, s. 99]. Yazıçı öz niyyətinə uyğun olan insan obrazını həyatdan tapır ki, bu prototip, proobrazdır. Prototip, proobraz – əsərdəki bədii qəhrəmanın real həyatda olması, yaşamasıdır. Məsələn, Mirzə Fətəli Axundovun Molla İbrahim Xəlil surətində Nuxa qəzasında Molla İbrahim Xəlil adlı bir hiyləgər zərgər kimya xülyasına qapılaraq yalnız avam xalqı deyil, çar hökumətinin yerli işçilərini də aldatmağa müvəffəq olur. Belə ki, yazıçı Rəşid Əfəndizadəyə görə, Molla İbrahim Xəlil bir qədər gümüşü qumlu torpağa qatıb sərdar dəftərxanasına gətirir. Bir ərizə ilə sərdara müraciət edərək Xaçmaz dağlarında gümüş mədəni tapdığını bildirib həmin mədəni işlətməyə icazə istəyir və hökumətdən maddi yardım tələb edir. Sərdar Molla İbrahim Xəlilin gətirdiyi qarışıq torpağı müayinə üçün Peterburqa göndərir. Müayinə nəticəsində torpağın içərisində 50 % gümüş olduğu məlum olanda həmin mədəni işlətmək üçün hökumət Molla İbrahim Xəlilə icazə və dörd min manat pul verir. Molla İbrahim Xəlil icazə aldıqdan sonra bir müddət Xaçmaz dağlarında çadır qurub yaşayır. Hər tərəfdən pullu tacirlər onun yanına gəlirlər. Molla İbrahim Xəlil yanına saçlı-saqqallı bir dərviş alıb iksir ilə torpağı gümüşə döndərmək haqqında uydurmalar yayır, xalqı aldadır. Beləliklə, qısa bir müddət içərisində Molla İbrahim Xəlil var-dövlət sahibi olur. Mirzə Fətəli Axundov həyatdan alınmış bu əhvalat üzərində ölməz ədəbi surət və tip yaratmışdır. Yaxud Məmməd Səid Ordubadinin "Qılınc və qələm" romanında Nizami obrazı, İsmayıl Şıxlının "Dəli Kür" romanında Cahandar ağa, Səməd Vurğunun "Vaqif" dramında Vaqif, Ağa Məhəmməd Şah Qacar obrazları və b. real həyatda yaşayan insanlar olduğu üçün prototip, yaxud proobrazlardır.

Tip – tipikləşdirmə yolu ilə yaradılır. Tipikləşdirmə − həyat hadisələrinin bir obraz üzərindəki fərdiləşdirilmiş və ümumiləşdirilmiş təsviridir. Yazıçı, əslində, tip yaratmaq üçün bir adamı əsas götürür, ona bənzər yüzlərcə adamdan aldığı yardımçı sifətlərlə onu tamamlayır. Bədii əsərdəki tip həyatdakının fotoqrafiyası deyil, yazıçı xəyalından keçmiş, fərdi xüsusiyyətlərlə verilmiş və ümumiləşdirilmiş tipdir. Bu bədii obrazlar yazıçının biliyi, sənətkarlığı, dünyagörüşü əsasında yaranmış surətlərdir.

Ədəbiyyatda tipiklik, yəni tipikləşdirmə sənətin əsas qanunlarındandır. Tipikləşdirmə aşağıdakılarla əlaqədardır:

- yazıçının dünyagörüşü,
- həyata olan münasibəti,
- həyat məsələlərinə yanaşması,
- yazıçının həyat təcrübəsi.

Yazıçı tipikləşdirmə vasitəsilə irəli sürdüyü həyat məsələlərini özünəməxsus şəkildə həll etməyə çalışır. Tipikləşdirmənin 2 tərkibi var:

1. **Ümumiləşdirmə.** Bədii əsərə gətirilən həyat materialının yazıçı dünyagörüşü və həyat təcrübəsi ilə ümumiləşdirilərək verilməsi.
2. **Fərdiləşdirmə.** Bədii əsərə gətirilən həyat materialının öz fərdi cizgiləri ilə verilməsi [4, s. 106].

Əsl kamil obraz, xarakter ümumiləşdirmə və fərdiləşdirmənin vəhdətindən formalaşır. Tipiklik fərdiləşdirmə və ümumiləşdirmənin cəmi kimi təzahür edir. Tip yunanca *"tupos"* sözündən olub, mənası *"əks", "örnək", "nümunə", "təcəssüm"* deməkdir. Hər dövrün özünəməxsus xarakter və tipləri olur. Realist ədəbiyyatın əsas şüarlarından biri – tipik hadisələrin tipik şəraitdə təsviridir. Bədii əsərlərdə obrazı tipikləşdirmək üçün bədii dildən istifadə edilir.

Hər bir tip xarakterdir, çünki fərdidir. Lakin hər xarakter tip ola bilməz. Bunun üçün o xarakter bir surət kimi geniş formada oxuculara çatdırılmalıdır. Həm də hər personaj xarakter olmadığı kimi, hər xarakter də tip deyildir. Tip xarakterin yüksək formasıdır. V. Belinski yazır: "Tipiklik yaradıcılığın əsas qanunlarından biridir və onsuz yaradıcılıq yoxdur... "Yaradıcılıqda tip nədir? – insandır, adamlardır, şəxsiyyətdir, şəxsiyyətlərdir, yəni insanın elə təsvir edilməsidir ki, o öz varlığında... tam bir dəstə adamları təcəssüm etdirsin".

Lev Tolstoy deyirdi: "Tip yaratmaq üçün bir çox cinsli adamları müşahidə etmək lazımdır". Məsələn, Axundovun "Hekayəti-Mərdi Xəsis" ("Hacı Qara" – U. Q.) komediyasının qəhrəmanı Hacı Qara məhdud, dar, yəni fərdi götürəndə Ağcabədi tacirinin xəsis xarakteridir. Geniş mənada isə xəsisliyin ümumiləşdirilmiş obrazı olduğu üçün tipdir. Bu obraz XIX əsr Azərbaycan şəraitinin tipik xəsis surətidir. Çünki onda ümumən bütün dünyadakı xəsislərə məxsus xüsusiyyətlər vardır. Yaxud "Leyli və Məcnun", "Xosrov və Şirin" poemalarında Leyli, Şirin dar mənada sevən qadın obrazı, geniş mənada götürüləndə isə sevən qadınların ümumiləşmiş obrazı olduğu üçün tipdir. Məhəmmədhəsən əmi dar mənada sadəlöhv kəndçi xarakteri, geniş mənada isə XIX əsr kəndçilərinin ümumiləşmiş obrazıdır.

Cəlil Məmmədquluzadənin "Danabaş kəndinin əhvalatları" əsərinin qəhrəmanı Xudayar bəydir. Bu adamın çirkin simasında bir çox mənfi xüsusiyyətlər cəm olub. Özü də bunlar irsi deyil, ictimaidir. Yəni Xudayar bəy bunları ana bətnindən gətirməmiş,

mühitində, tərbiyədə kəsb etmişdir. O, yalançı, şəhvət düşkünü, yaltaq, pula həris, zalımdır, hər şeydən əvvəl, zorakıdır. Onun aləmində dünyada hər şey güc yolu ilə əldə edilir... Xudayar bəy bütün işlərində zora əl atır, gücün yerimədiyi məqamda da çəkinmir, "görək nə çıxar" deyə zorakılığı təcrübə edir. Onun aləmində dünya zorbazorluq, güclülərin zəifləri əzib öz istəyini əldə etmək dünyasıdır. Onun fikrincə, yaşayış, "hünər" bundan ibarətdir... O, Məhəmmədhəsən əminin eşşəyini zorla əlindən alır. Vəliqulunu ələ keçirir, qazıya zor ilə kəbin kəsdirir və s. Bütün bu xüsusiyyətlər Xudayar bəyi oxucunun gözü qarşısında zamanın ən alçaq, ən çirkin, eyni zamanda ən tipik bir kəndxuda obrazı canlandırır. Xudayar bəy xarakter kimi kobud, xalqa əziyyət verən, mədəniyyətsiz kəndxudadır. Bu onun fərdi xüsusiyyətidir. Həmçinin tip kimi götürəndə Xudayar bəyin timsalında onun kimi kobud, mədəniyyətsiz kəndxudaların ümumiləşmiş obrazını görürük.

Bədii yaradıcılıqda xəyal və fantaziya olmadan bədii obraz yaratmaq mümkün deyil. Belə ki, yazıçı həmin insanın xarakterində müşahidə etdiyi öz idealına uyğun gələn cəhətləri götürür, çatışmayan cəhətləri isə öz fantaziyası hesabına yaradır. Bədii əsərdə iştirak edən obrazların hamısı bədii obrazlardır. Yəni əsərdə iştirak edən əsas obrazdan tutmuş epizodik obrazlara qədər, mənfi və müsbət obrazların hamısı bədii obraz hesab edilir. Bədii obraz 2 yerə ayrılır:

1. Tarixi şəxsiyyətlər. Məsələn, Şah İsmayıl Xətai, Nadir şah, Ağa Məhəmməd Şah Qacar, Vaqif, Natəvan, Şeyx Xiyabani və bu kimi tarixi şəxsiyyətlər bədii əsərə yazıçı tərəfindən obraz kimi gətirilibsə, bu, bədii obrazdır. "Tarixçi tarixi gerçəkliyə, faktlara, yazıçı isə bədii təxəyyülünə əsaslandığı ideyaya söykənir" [4, s. 293].

2. Əgər yazıçının seçib ad verdiyi adi qəhrəmanlar əsərdə işlənirsə, o zaman onlar bədii obrazlar hesab edilir. Məsələn: Xudayar bəy, Məhəmmədhəsən əmi, Qurbanəli bəy və b. Bunlar da bədii obrazlardır, çünki bədii əsərdə işləniblər. Göründüyü kimi, bədii obrazlar həm tarixi şəxsiyyətlər, həm də sənətkarın seçib ad verdiyi adi obrazlar ola bilər.

Bədii obrazı gözdən salan 2 cəhət var:

1. Həyatın kopya olunması.

2. Sənətkarın subyektiv düşüncələrinin obrazda əks etdirilməsi.

Bədii əsərin qəhrəmanı yazıçı ideyasını təbliğ edən surətdir. Hər bir əsərin birinci qəhrəmanı baş, əsas qəhrəmandır. O, yazıçının ideyasını təbliğ edir. Məsələn, Nizami Gəncəvinin "İsgəndərnamə" əsərində azad cəmiyyət haqqında düşüncələrini İsgəndər surəti, "Koroğlu" dastanında yerli feodallara və yadellilərə qarşı mübarizədə Koroğlu surəti, Səməd Vurğunun "Vaqif" pyesində Qacar istilasına qarşı mübarizədə, vətənin müdafiəsində Vaqif surəti baş qəhrəmanlardır. M. F. Axundovun "Hacı Qara" komedi-

yasında əsərin ideyasını, yəni xəsisliyi təbliğ etdiyi üçün əsas qəhrəman Hacı Qaradır. Hərçənd ki Heydər bəy Hacı Qaraya nisbətən qoçaq, mərd surətdir.

Sovet dönəmində bədii ədəbiyyata sinfi-ideoloji silah kimi baxan, onu sosializm-realizmin saxta ehkamları çərçivəsinə salan tənqidçi və nəzəriyyəçilər bədii surətləri, xarakterləri müsbət və mənfi qəhrəman olaraq 2 yerə bölmüşdülər.

1. *Müsbət surətlər*: Sovet ideologiyasının tələblərini təbliğ edən qəhrəmanlar.

2. *Mənfi surətlər*: Sovet rejiminə zidd, öz soykökünə, türk əslinə, milli keçmişə, xalq həyatına, islami dəyərlərə bağlı surətlər, yəni bəylər və xanlar. Məsələn, Səməd Vurğunun "Komsomol" poemasındakı Gəray bəy, İsmayıl Şıxlının "Dəli Kür" romanındakı Cahandar ağa, Fərman Kərimzadənin "Qarlı aşırım" romanındakı Kərbəlayi İsmayıl belə qəhrəmanlara nümunə ola bilər. Bunlar, əslində, xalq mənəviyyatından su içmiş, milli varlığımızın qeyrət və təəssübünü çəkən milli xarakterlərdir. Surətlər aşağıdakı qruplara bölünür:

1. *Əsas surətlər*: Əsərdə fəal iştirak edən, süjet xətti ilə möhkəm bağlı olan, münaqişənin inkişafında, yaxud həllində başlıca rol oynayan şəxs *əsas surət* adlanır. Əsas surətlər I, II, III dərəcəli, bəzən də IV dərəcəli olur. Nizami Gəncəvinin "Xosrov və Şirin" poemasında Xosrov, Şirin, Fərhad əsas surətlərdir. Əsas surət xarakterlərin açılmasındakı rolu ilə müəyyən edilir. Bəzən əsərdə gözə o qədər də görünməyən bir surət əsərin ideyasının açılmasında böyük əhəmiyyət kəsb edir. Məsələn, Cəlil Məmmədquluzadənin "Qurbanəli bəy" hekayəsində Kəblə Qasım nökərdir. Lakin o, Qurbanəli bəyin yaltaqlığını, vəzifə sahiblərinin qarşısında diz çöküb özündən kiçiklərin yanında əjdahaya dönməsini göstərən yaddaqalan əsas surətdir. "Əsas surət" ilə "müsbət surət" anlayışları bir-biri ilə qarışdırılmamalıdır. Əsas surət müsbət olduğu kimi, mənfi də ola bilər. Məsələn, Süleyman Rəhimovun "Mehman" povestində Şəhla xanım, Qaloş mənfi olmaqla yanaşı, həm də əsərin əsas surətləridir.

2. *Epizodik surətlər*: Əsərin mərkəzi xətti ilə bilavasitə əlaqəsi olmayan, hadisələrin inkişafına ciddi təsir göstərməyən və oxucu tərəfindən nəzərə çarpmayan obraz *epizodik surət* adlanır. Məsələn, Nizami Gəncəvinin "Xosrov və Şirin" poemasında Şapur, Büzürgümid, Məhinbanu, Şiruyyə epizodik surətlərdir. Yaxud Cəlil Məmmədquluzadənin "Ölülər" komediyasında Hacı Həsənin qaravaşı Zeynəbə əsərin ancaq bir yerində rast gəlinir. M. F. Axundovun "Molla İbrahimxəlil kimyagər" əsərində Şeyx Salah ancaq əvvəlki məclisdə iştirak edir, hadisələrin inkişafında özünü göstərmir, "Hacı Qara" əsərində isə Qəhrəman və Karapet epizodik surətlərdir. Bu obrazlar əsərin ancaq bir pərdəsində iştirak edirlər.

3. *Əşya surətləri*: Bədii əsərlərdə qeyri-insani varlıqların, yəni ev, məişət avadanlıqlarının və s. iştirak etdiyi surətlər *əşya surətləri* adlanır. Əşya surəti bədii əsər-

də insan həyatında onunla əlaqədar hadisələrə tabe edilir. Məsələn: Süleyman Sani Axundovun "Qaraca qız" hekayəsində "Ağalıq evi"nin təsviri, "Koroğlu" dastanında Misri qılınc, Nizami Gəncəvinin "Yeddi gözəl" poemasında "Xavərnəq" qəsri, Cəlil Məmmədquluzadənin "Danabaş kəndinin əhvalatları" əsərində Xudayar bəyin ev əşyalarının təsviri və s. Deməli, bədii əsərdə insan və təbiət obrazlarından başqa (heyvanlar, fəsillər və s. çıxmaqla) qalan obrazlar, yəni ev, qab-qacaq, qəsr, otaq və s. əşya surətləri adlanır.

4. *Yardımçı surətlər*: Bədii əsərlərdə əşya surətlərindən başqa, heyvan surətləri də iştirak edir ki, bunlara *yardımçı surətlər* deyilir. Bədii əsərlərdə atlar, itlər, quşlar yardımçı qüvvələr rolunda iştirak etdiyi üçün yardımçı surətlərdir. Xalq dastan və nağıllarında belə yardımçı surətlər çoxluq təşkil edir. Məsələn: Nizami Gəncəvinin "Xosrov və Şirin" əsərində Şəbdiz, Gülgün atları, "Koroğlu" dastanında Qırat, Dürat, "Məlikməmməd" nağılında aslan, quş, at, "Qaçaq Nəbi" dastanında Bozat, A. Şaiqin "Köç" hekayəsində Qızıl it və s.

Bədii əsərlərdə *portret* əsərdə surətin xarici görkəminin və daxili keyfiyyətlərinin sözlə ifadəsidir. Yazıçı bədii əsərdə portret yaradarkən surətin danışıq tərzini, davranışını, rəftarını təsvir etməklə yanaşı, xarici görkəmi – boyu, bədən quruluşu, rəngi, üz cizgiləri, geyimi haqqında məlumat verir. Həmin əlamətlərin köməyi ilə yazıçı bu və ya başqa surəti oxucunun nəzərinə çatdırır. Deməli, yazıçı sözlə surətin şəklini çəkir, beləliklə, bədii portret yaradır. Məsələn, "Danabaş kəndinin əhvalatları" əsərində C. Məmmədquluzadə Xudayar bəy surətinin xarici görkəmini sözlə belə təsvir edir: "Xudayar bəyin ancaq 37 – 38 sinni olar, artıq olmaz, bəlkə, əskik ola. Boyu uca, saqqalı, qaşları tünd qaradı. Bir tikə ağ yoxdu gözlərində. Belə ki, bəzi vaxt Xudayar bəy papağı basır gözünün üstünə. Papaq qara, gözlər qara, üz qara. Papağın altından gözlər belə işarır ki, adamın canına vahimə ötürür. Bunlar hamısı ötər, Xudayar bəyin bir böyük qüsuru var. Burnu əyridi, amma pis əyridi. Əyri də var əyri. Mən çox gözəllər görmüşəm ki, burnu əyridir. Amma Xudayar bəyin burnu pis əyridir. Burnunun yuxarı tərəfindən bir sümük dikəlib, sümük düzdü, amma aşağısının əti xoruz pipiyi kimi düşüb sol yana...". Bu parçanı oxuduqca Xudayar bəyin portreti göz önündə canlanır.

Yazıçı tərəfindən yaradılan portret obrazın dərk olunmasında və ona münasibət bildirilməsində mühüm rol oynayır. Portret oxucuda surətə ya rəğbət, ya da nifrət hissi yaradır. Xudayar bəyin yazıçı tərəfindən yaradılan portreti oxucuda ona qarşı mənfi münasibət formalaşdırır. Məsələn, Nəriman Nərimanov "Bahadır və Sona" romanında troykaçı Novruzun portretini aşağıdakı kimi təsvir edir: "Novruz 30 yaşında, gödəkboy, canlı oğlan idi. Üzündə gözə sataşan bir eybi yox idi. Ancaq üzünün çopuru, gözlərinin pişik gözlərinə bənzəməyi, burnunun nəhayətdə böyük deşikləri, qulaqlarının göz

yarpağı kimi sallanması insanın nəzərini bir az məşğul edirdi” [6, s. 207]. Cəfər Cabbarlının “Firuzə” hekayəsində isə Firuzənin portretinə diqqət edək: “O, gözəl, girdəsifət bir qız idi, şərqli qızlarına məxsus qara, dərin, atəşin gözləri, qələmlə çəkilmiş kimi qaşları, incə dodaqları var idi” [5, s. 208]. Yazıçı sözün qüdrətilə yaratdığı surətin portretini çəkir. Bu zaman surətin yaşı, xarici görkəmi, daxili xüsusiyyətləri və s. təsvir edilir.

Rafiq Yusifoğluya əsaslanaraq deyə bilərik ki, bədii portret obrazların fərdiləşdirilməsində, xarakterlərin hərtərəfli açılmasında, onların daxili dünyasının bədii əksində mühüm rol oynayan sənətkarlıq komponentlərindən biridir. Rəssamlıqdakı və bədii ədəbiyyatdakı portret anlayışları mahiyyətcə bir-birinə yaxındır. Belə ki, onların hər ikisində ön planda insanın zahiri görkəminin təsviri dayanır. Əgər rəssam ayrı-ayrı rəng və onların çalarlarından istifadə edirsə, yazıçı xarakterik detallardan, təşbeh, epitet və s. kimi bədii təsvir və ifadə vasitələrindən istifadə edir. Məsələn, Hüseyn Cavidin “Azər” poemasından Şəmsanın portreti:

Adı Şəmsa, füsunlu bir xilqət,
Saçır ətrafa həp qürur, əzəmət...
O baxışlarda bir qığılcım var,
Hanki bir qəlbə əks edərsə yaxar... [6, s. 203]

Bədii portret fərdiləşdirmə vasitəsidir. Fərdiləşdirmə isə tipikləşdirmə ilə bərabər xarakter yaradıcılığında olduqca mühüm vasitədir. İnsanın zahiri görkəmini bütün xırdalıqlarına qədər əks etdirmək hələ portretin tamlığına zəmanət vermir. Əsas məsələ zahiri görkəmin təsviri ilə qəhrəmanın daxili aləmini, onun xarakterini açmaqdır. Bədii portret həm fotosurət, həm də daxili keyfiyyətdir. Məsələn, Səməd Vurğunun “Üsyan” poemasında Elxanın portretinə nəzər salaq:

Bu da Elxandır – kəndin ağası,
Əynində vəznəli, yaşıl çuxası.
Gözünün üstündə buxara papaq,
Əntərə bənzəyir o kor yapalaq.
Gözləri gömgöydür, sifəti sarı,
Bozarmış üzünün sıx çopurları [6, s. 204].

Portret yaradıcılığında geyimin təsviri əsas rol oynayır. Bədii portretin özündə də tarixilik vardır. Məsələn, Məmməd Rahimin “Natəvan” poemasında da Natəvanın geyimi XIX əsrdə yaşamış Azərbaycan qadınlarının xarakterik geyimidir. Həmçinin Molla Pənah Vaqifin “Pəri” qoşması da portretə gözəl nümunədir:

Boyun sürahidir, bədənin büllur,
Gərdənin çəkilmiş minadan, Pəri!
Sən ha bir sonasan, cüda düşübsən,
Bir bölük yaşılbaş sonadan, Pəri!

Yazıçı portreti yaradarkən hansı əhvali-ruhiyyədə olursa, həmin portret və surətlər də eyni əhvalda olur. Bu əhvali-ruhiyyə şən vəziyyəti, nigarançılığı, məyusluğu və s. əks etdirir.

**Portret yaratmanın yolları**

**1. Sənətkarın öz dili ilə təsvir edilən portret:** Üslub fərdiyyətindən asılı olaraq, hər bir sənətkarın özünəməxsus portret yaratmaq üsulları vardır. Portret vasitəsilə yazıçı qəhrəmanların psixoloji vəziyyətini aça bilər. Məsələn, Rəsul Rza "Xalq müəllimi" poemasında "Müəllim dayanmışdı qəm heykəli kimi" misraları ilə evi nadanlar tərəfindən yandırılmış müəllimin bədii portretini canlandırmışdı. Səhəri gün müəllim dərsə vaxtında gəlsə də, onun zahiri görkəmində baş verən dəyişiklik daxilindəki əzab-əziyyətin, iztirabların ifadəçisinə çevrilir:

Rəngi bir az qaçmış,
gözləri qızarmışdı.
Qaşları elə bil
dəyişmişdi yerini.
Səsi də elə bil
Sınıq parçalardan calanmışdı.
Alt dodağı qançır idi,
Ortadan parçalanmışdı [6, s. 205].

2. **Bədii əsərdəki bədii obrazın dili ilə təsvir edilən portret:** Məlumdur ki, yazıçı təsvir etdiyi tiplər arasında yaratdığı portretlərdə tiplərin xarici görünüşü ilə yanaşı, onların daxili portretini də, yəni psixoloji xüsusiyyətlərini də təsvir edir. Portretin daxili xüsusiyyətləri çox vaxt həmin obrazın özünün dili ilə açılır. Daxili portret – tipin psixoloji xüsusiyyətidir. Tipin daxili portretini yaratmaqda Mirzə Ələkbər Sabir əsl ustad idi. Onun tipləri öz müasirləri idi. Sabir kapitalistlər, sahibkarlar tərəfindən istismar olunan fəhlələrin və onlara olan münasibətlərin portretini sahibkarların özlərinin monoloqu ilə belə ifadə etmişdir:

Fəhlə, mənə bir söylə, nədən hörmətin olsun?
Axır nə səbəb söz deməyə qüdrətin olsun?
Əl çək, bala, dövlətlilərə xidmətin olsun,

Az-çox sənə verdiklərinə minnətin olsun!..
Bu çərxi-fələk tərsinə dövran edir imdi,
Fəhlə də özün daxili-insan edir imdi [5, s. 116].

Yaxud Sabirin "Qəmü möhnət füzun oldu", "Füzuliyə bənzətməyə" və s. satiralarında Məhəmmədəli şahın dilindən öz portreti cızılmışdır. Sabirin "Mən şahi-qəvişövkətəm" satirasına nəzər salaq:

Mən şahi-qəvişövkətəm, İran özümündür!
İran özümün, Rey, Təbəristan özümündür!
Abad ola, ya qalsa da viran, özümündür!
Qanuni əsası nədi, fərman özümündür!
Şövkət özümün, fəxr özümün, şan özümündür!

İranlı deyil, cümlə bilir Məndəliyəm mən,
Gürgani-cəfavü sitəmin çəngəliyəm mən,
İranlıların başlarının əngəliyəm mən,
Sorram, içərəm qanlarını − çün zəliyəm mən,
Laşə özümün, ət özümün, qan özümündür!
Şövkət özümün, fəxr özümün, şan özümündür [5, s. 121].

Bədii əsərdə müəyyən bir yerin, ölkənin təsvirinə, sözlə şəklinin çəkilməsinə *peyzaj* deyilir. Peyzaj fransız sözü olub, *"ölkə", "məkan", "yer"* mənasını ifadə edir. Söz sənətkarı peyzajı məqsədsiz, ancaq gözəllik xatirinə yaratmır. Belə ki, bədii əsərdə yaradılan peyzaj insan obrazını tamamlayır. Ona görə də sənətkar öz qəhrəmanının xarakterini, onun bədii zövqünü, arzu və istəklərini təbiət təsviri vasitəsilə təqdim edir. Surətin psixologiyası ilə təbiət mənzərələri həm uyğun, həm də bədii təzad şəklində verilə bilər. Bunun necə verilməsi də yazıçının özündən, onun təsvir etdiyi hadisələrə münasibətindən asılıdır. Ona görə də peyzaj bədii əsərin məzmunu, ideyası ilə yaxından bağlı olur. Peyzaja nəinki lirik əsərlərdə, hətta epik əsərlərdə də rast gəlmək mümkündür. Aşıq Ələsgərin "Dağlar" şeiri, Səməd Vurğunun "Dağlar" şeiri, Şah İsmayıl Xətainin "Bahariyyə" məsnəvisi, Nizami Gəncəvinin "Bərdənin tərifi" məsnəvisi və s. peyzaja aid gözəl nümunələr hesab edilə bilər. Məsələn, Şah İsmayıl Xətainin "Dəhnamə" poemasından "Bahariyyə" məsnəvisində təsvir edilən peyzaj:

Qış getdi, yenə bahar gəldi,
Gül bitdivü laləzar gəldi.
Quşlar qamusu fəğanə düşdü,

Eşq odu yenə bu canə düşdü.
Yer geydi qəbayi-xizrpuşan,
Cümlə dilə gəldi-ləbxamuşan...

Yaxud Nizami Gəncəvi “İsgəndərnamə” poemasında Bərdənin təsvirini belə verir:

Bərdə nə gözəldir, necə qəşəngdir,
Yazı da, qışı da güldür, çiçəkdir,
İyulda dağları lalələr səpər,
Qışını baharın nəsimi öpər.
Yaşıl meşələri cənnətə bənzər,
Şən ətəklərinə bağlanmış kövsər.

**Nəticə**

Göründüyü kimi, surət – xarakter – tip surətin keçdiyi inkişaf yoludur. Bunlar öz səciyyəsinə görə bir-birindən fərqlənir. Bütün tiplər surət olduğu halda, bütün surətlər tip ola bilməz. Yaradıcılıq prosesində surətlər məna cəhətdən 2 yerə ayrılır:

1. Surətlərin dar mənası – xarakteri əmələ gətirir.
2. Surətlərin geniş mənası – tipikləşdirməni əmələ gətirir.

Həmçinin bədii əsər həyatın özünəməxsus surətidir. Sənətkar yaratdığı surətin ən xırda cəhətlərinə qədər əhəmiyyət verməlidir. Yalnız bunun nəticəsində canlı və həqiqi surət yarana bilər. Bədii əsərdə surət dedikdə, müəyyən şəxslər nəzərdə tutulur. Bədii əsərlərdəki surətləri (obrazları – U. Q.), əsasən, 4 yerə bölürlər:

1) insan surətləri,
2) heyvan surətləri,
3) əşya surətləri,
4) təbiət surətləri.

Bədii əsərlərdə insanların yaşadığı və fəaliyyət göstərdiyi mühit obrazlar vasitəsilə təsvir olunur. Obraz o zaman oxuculara təsir göstərə bilir ki, o, həqiqi və inandırıcı olsun. Canlandırılan obrazlar yazıçının təəssüratını, fikrini, hiss-həyəcanını, əhvali-ruhiyyəsini ifadə edir.

## İstifadə edilmiş ədəbiyyat

1. Əlimirzəyev X. ( 2008). Ədəbiyyatşünaslığın elmi-nəzəri əsasları. Bakı, Elm və təhsil. 414 s.
2. Mir Cəlal, Xəlilov P. (2005). Ədəbiyyatşünaslığın əsasları. Bakı, Çaşıoğlu. 312 s.
3. Əliyev M. (2000). Ədəbiyyat nəzəriyyəsinin əsasları. Bakı, 480 s.
4. Mustafayev M. (2021). Ədəbiyyat nəzəriyyəsi. Bakı, 436 s.
5. Şəmsizadə N. (2012). Ədəbiyyat nəzəriyyəsi. Bakı. 316 s.
6. Qəhrəmanova U. (2015). M. Ə. Sabir və klassik irs. F. ü. f. d. dissertasiyası. Bakı.
7. Yusifoğlu R. (2001). Ədəbiyyatşünaslığın əsasları. Bakı, Sabah. 701 s.

# MÜƏLLİFLƏRİN NƏZƏRİNƏ

*«Azərbaycan dili və ədəbiyyat tədrisi» jurnalında dərc ediləcək məqalələr üçün texniki tələblər*

**Məqalələrin məzmunu**

Məqalələr aktual mövzulara həsr olunmalı, jurnalın məzmun və üslubuna uyğun akademik tələblərə cavab verməli, "Giriş" (Introduction), "Əsas hissə" (Main part) və "Nəticə"dən (Conclusion) ibarət olmalıdır. "Giriş"də mövzunun aktuallığı əsaslandırılmalı, "Əsas hissə"də tədqiq edilən məsələlər, qaldırılan problemlər bölmələr üzrə ətraflı şərh edilməli, "Nəticə"də isə elm sahəsinin və məqalənin xarakterinə uyğun olaraq, müəllifin gəldiyi elmi qənaət, işin elmi yeniliyi, tətbiqi əhəmiyyəti və s. aydın şəkildə verilməli, təklif və tövsiyələr irəli sürülməlidir.

**Məqalələrin strukturu və tərtib edilmə qaydaları**

1) Redaksiyaya təqdim edilən məqalələr Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının dövri elmi nəşrlərin qarşısında qoyduğu şərtlər də daxil olmaqla aşağıdakı tələblərə cavab verməlidir:

- ✓ Məqalənin adı, müəllifin adı və soyadı, vəzifəsi, elmi dərəcəsi (əgər varsa), işlədiyi qurumun adı, elektron poçt ünvanı və ölkə adı məqalənin titul səhifəsində yazılmalıdır.
- ✓ "Xülasə" Azərbaycan və ingilis dillərində eyni məzmunda olmaqla, təxminən 70 – 120 söz həcmində verilərək, tədqiqat işinin əhatə dairəsini təsvir etməlidir.
- ✓ "Açar sözlər" Azərbaycan və ingilis dillərində verilərək 3 – 5 söz və ya söz birləşməsindən ibarət olmalıdır.

2) Məqalənin mətni Microsoft Word proqramında, A4 (210 x 297mm) formatda, Times New Roman – 14 şriftində yığılmalı, intervalı – 1,15, həcmi 6 – 15 səhifə olmalıdır.

3) Məqalənin adı və yarımbaşlıqları yalnız ilk hərfi böyük olmaqla, qalın şriftlə yazılmalıdır. Başlıq və yarımbaşlıqlardan, cədvəl və şəkillərdən (həmçinin tənliklər və düsturlardan) əvvəl və sonra bir sətir ara boşluğu buraxılmalıdır. Səhifələr ardıcıl olaraq aşağı sağ küncdə nömrələnməlidir.

4) Cədvəl və şəkillərin adı olmalı və bu ad cədvəllər üçün cədvəlin üstündə sol küncdə, şəkillər üçün şəklin altında sol küncdə yerləşdirilərək, ardıcıl nömrələnməlidir.

5) Məqalənin mövzusu ilə bağlı elmi mənbələrə zəruri istinadlar olmalı, sonda verilən "İstifadə edilmiş ədəbiyyat"da istinad olunan ədəbiyyatlar mətnin içində [Kazımov Q. Bakı, 2007] və ya [1, s. 52] kimi verilməli, sonda isə əlifba ardıcıllığı ilə nömrələnməlidir. Elmi ədəbiyyata mətndə onlayn istinad olarsa 1 qoyaraq aşağıda internet linki göstərilməlidir. Ədəbiyyat siyahısında verilən hər bir istinad haqqında məlumat tam, dəqiq və orijinalın dilində olmalıdır. İstinad olunan mənbənin biblioqrafik təsviri onun növündən (monoqrafiya, dərslik, elmi məqalə və s.) asılı olaraq verilməlidir. Elmi məqalələrə, simpozium, konfrans və digər nüfuzlu elmi tədbirlərin materiallarına və ya tezislərinə istinad edərkən məqalənin, məruzənin və ya tezisin adı göstərilməlidir. Mətndə istinad olunan bütün mənbələr, səhifə nömrələri ilə birlikdə «İstifadə edilmiş ədəbiyyat» siyahısında aşağıdakı nümunələrdə göstərilən qaydada verilməlidir:

a) *Kitablara istinad:* Kazımov Q. (2007). Müasir Azərbaycan dili. Sintaksis. Bakı, Təhsil. 496 s.

b) *Jurnallara istinad:* Həsənova S. (2021). Aşıq Ələsgər və ədəbi dilimiz. "Azərbaycan dili və ədəbiyyat tədrisi", № 4. Bakı, "N print studiya", s. 25 – 34.

c) *Toplularda məqaləyə istinad* (konfrans, simpozium və digər): "Azərbaycan iqtisadiyyatında keçid dövrünün başa çatması: təhlil və nəticələr. Milli inkişaf modelinin formalaşması problemləri". (2010). Respublika elmi-praktiki konfransının materialları. Bakı, Şərq-Qərb, s. 314 – 316.

ç) *Dissertasiyalar və avtoreferatlar:* Məmmədov H. B. (2013) Azərbaycan Respublikası müasir beynəlxalq siyasi proseslərin aktoru kimi. Elmlər doktoru dissertasiyasının avtoreferatı. Bakı, Elm. 44 s.

d) *Müəlliflik şəhadətnamələri və patentlər*: Алиев С. Г., Джалалов К. Х. 163514, СССР Б. И. 1988, № 4, s. 50 Langsam M., Savoca A. C. L. Pat. 4759776, USA, 1988.

e) *İnternet səhifələri:* İnternet səhifələrinə istinadlar tam göstərilməlidir. Məsələn: http://www.tall.edu.az

6) Məqalədə son 5 – 10 ilin elmi məqalələrinə, monoqrafiyalarına və digər etibarlı mənbələrinə üstünlük verilməlidir.

7) Məqalə redaksiyaya 3 formada: ya elektron poçtla (*tall@edu.gov.az*), ya jurnalın saytı (http://*tall.edu.az)* üzərindən, ya da çap formasında müəllifinin özü tərəfindən təqdim edilməlidir. Orijinal nüsxədə müəllif(lər)in imzası vacibdir.

## Məqalələrin qəbul edilməsi və dərci

Təqdim edilən məqalələr redaksiyada nəzərdən keçirildikdən sonra oxunuş üçün (müəllifin adı gizli saxlanılmaqla) mütəxəssislərə göndərilir. Məqalə jurnalın profilinə uyğun olduğu təqdirdə və tələblərə cavab verərsə, çapa təqdim edilir. Müəllif istəsə, ona məqaləsinin qəbul edilməsi barədə sənəd verilə bilər. Məqalələr növbəlilik prinsipi ilə dərc edilir.

## Müəlliflik hüquqları

Jurnalda dərc edilən məqalələrdə müəlliflik hüququ qorunur və bu məqalələrin bütün nəşr hüquqları *"Azərbaycan dili və ədəbiyyat tədrisi"* jurnalına aiddir. Jurnalda çap edilmiş məqalələrin eyni ilə digər nəşrlərdə (məqalənin tezis şəklində dərc olunmuş variantı istisnadır) dərcinə yalnız redaksiyanın yazılı icazəsi, sitatların verilməsinə isə mənbə göstərilmək şərti ilə yol verilir. Əvvəllər çap olunmuş və ya çap olunmaq üçün başqa bir dövri nəşrə göndərilmiş əlyazmaların jurnala təqdim edilməsi müəlliflik etikasına ziddir. Yuxarıda göstərilən tələblərə cavab verməyən məqalələr qəbul edilmir. Dərc olunmuş məqaləyə görə müəllifə jurnalın bir nüsxəsinin verilməsi nəzərdə tutulur.

## FOR AUTHORS

*Requirements to the articles submitted for publication in «Teaching of Azerbaijani language and literature»*

### Content of articles

The articles should be devoted actual topics, meet the academic requirements of journal's style and content and consist of «Introduction», «Main part», and «Conclusion». The «Introduction» should contain a thesis that will assert the main argument. In the «Main part», the studied issues and the raised questions should be explained and analyzed in detail in the sections. In the «Conclusion», the author should reinforce the importance of the main idea, emphasize his scientific contention and appreciate his topic in personally relevant ways, and it is notable to shine the scientific novelty and the benefits of the work and to offer suggestions and recommendations.

### Rules of preparing of articles and scope

1) The articles submitted for the editorial must meet the following requirements, including the conditions set out for the periodical scientific publications presented by the Higher Attestation Commission under the President of the Republic of Azerbaijan:

- ✓ Title of the article, author's name, surname, position, academic degree, name and address of the organization where he works, E-mail address should be written on the title page of the article.
- ✓ Abstract (in Azerbaijani and English) should be approximately 70 – 120 words, with the same content.
- ✓ Keywords (in Azerbaijani and English) should consist of 3 – 5 words or phrases.

2) The text should be typed in Microsoft Word, A4 (210 x 297mm), Times New Roman – 14, interval – 1, 15, size 6 – 15 sheets.

3) The title and subheadings of the article should be written in bold, with only the first letter capitalized. Before and after the headline and subheadings, tables and figures (also equations and formulas), a single line spacing should be added. Pages should be numbered in the lower right corner.

4) The table and pictures must be named, and the name should be placed in the left hand corner above the table, and pictures name should be placed in the left-hand corner under picture.

5) There should be references to scientific sources related to the topic of the article, as well as the sources noted at the end in "used works" should be mentioned in the text as [Kazimov G. Baku, 2021] or [1, p. 52], and finally numbered in alphabetical

order. If there is an online reference in the text, you should put an internet link below and number it from one. The information on each reference in the Literature List must be in full, accurate and the native language. The bibliographic description of the source should be based on its type (monograph, textbook, scientific article, etc.). The name of the article, report or thesis should be cited when referring to scientific articles, materials or theses of symposium, conference or other prestigious scientific events. All sources referenced in the text should be cited in the “Used Works or References” list, along with the page numbers, as specified in the following examples:

a) *References to books:* Kazimov G. (2007). Modern Azerbaijani language. Syntax. Baku, Tahsil. 496 p.

b) *References to journals:* Hasanova S. (2021). Ashug Alasgar and our literary language. "Teaching of Azerbaijani language and literature", № 4. Baku, “N print studio”, p. 25 – 34.

c) *Reference to the articles in scientific events:* «End of a transitional period in Azerbaijan economy: analysis and conclusions. Problems of National Development Model Formation" (2010). Materials of the scientific-practical conference of the Republic. Baku, East-West, p. 314 – 316.

d) *Dissertation thesis and abstracts*: Mammadov H.B. (2013) The Republic of Azerbaijan as an actor in contemporary international political processes. Doctoral dissertation abstract, Baku, Science. 44 p.

e) *Copyright and Patents:* Aliev S. G., Jalalov K. Kh. 163514, USSR // B.I. 1988, No. 4, p. 50 Langsam M., Savoca A. C. L. Pat. 4759776, USA, 1988.

f) *Internet pages* (references to web pages should be indicated in full): For example: http://www.tall.edu.az

6) The article should give preference to scientific materials, monographs and other reliable sources for the last 5 – 10 years.

7) The article must be submitted to the editorial office in 3 forms: by e-mail *(tall@edu.gov.az)*, or through the journal's website *(http://tall.edu.az)*, or in printed form by the author of the article. The original signature of the author is important.

**Acceptance and publication of articles**

After review, the presented article will be sent to experts to be read out. If the article corresponds to the journal profile and meets the requirements, the printing is provided. If the author wishes, a document on his / her article acceptance may be issued. Articles are published on the principl of rotation.

## Copyright

## К СВЕДЕНИЮ АВТОРОВ

*Технические требования к статьям опубликованным в журнале «Преподавание Азербайджанского языка и литературы»*

### Содержание статей

Статьи должны быть посвящены актуальным темам и соответствовать академическим требованиям в соответствии с содержанием и стилем журнала. Статьи должны состоять из «Введение» (Introduction), «Основной части» (Main part) и «Заключения» (Conclusion). В «Введение» должно обосновываться актуальность темы, в «Основной части» исследуемые задачи и поднятые проблемы должны быть объяснено подробно по разделам, а в «Заключения» должно основываться на характере области статьи. Важность приложения, научный вывод, сделанный автором, научная новизна работы, экономические выгоды и т. д. должны быть четко указано и должны быть выдвинуты предложение и рекомендации.

### Структура и правила составления статей

1) Статьи, представленные в редакцию, должны соответствовать следующим требованиям, в том числе условиям, установленным Высшей Аттестационной Комиссией при Президенте Азербайджанской Республики, для периодических научных публикаций:
   - ✓ На титульном листе статьи должны быть указаны название статьи, имя и фамилия, должность, ученая степень, название и адрес организации, адрес электронной почты автора.
   - ✓ Ключевые слова (на азербайджанском и английском языке) должны состоять из 3 – 5 слов или фраз.
   - ✓ Резюме (на азербайджанском и английском языке) должна составлять примерно 70 – 120 слов с одинаковым содержанием.

2) Текст статьи должен написан в программе Microsoft Word, A4 (210 x 297 мм), Times New Roman – 14, интервал – 1, 15, объем 6 – 15 страниц.

3) Названия статьи должен писаться с жирным шрифтом с большой буквой. До и после заголовка и подзаголовков, таблиц и рисунков (также уравнений и формул) должен быть выпущен один междустрочный интервал. Страницы должны располагаться последовательно в правом нижнем углу.

4) Таблицы и рисунки должны иметь имя и это имя для таблиц должен перемещаться над таблицей в левом углу, а для рисунков под рисунки в левом углу и последовательно пронумероваться.

